**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**Noyabr-Dekabr**
**№ 6 (658)**
**2013**

**Elmi-nəzəri, pedaqoji jurnal**

---

## BU NÖMRƏDƏ

---

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 18

---

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, “Ərgünəş” FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

## В этом номере

**In this number**

# MƏQSƏD KEYFİYYƏT SƏVİYYƏSİNƏ GÖRƏ DÜNYADA ÖNCÜL MÖVQE TUTAN TƏHSİL SİSTEMİ FORMALAŞDIRMAQDIR



## Təhsil naziri Mikayıl CABBAROV:
**“Təhsilin inkişafı üzrə Dövlət Strategiyası islahatların uğurla davam etdirilməsinə əsaslı zəmin yaradır”**

*Müasir dövrdə qloballaşan dünyanın tələblərinə uyğun təhsil sistemi formalaşdırmaq ölkənin beynəlxalq rəqabətliliyini şərtləndirən əsas amillərdəndir. Bu baxımdan ölkə ictimaiyyətini düşündürən, təhsil sahəsi ilə maraqlanan hər kəsi narahat edən məsələlərin köklü həllini nəzərdə tutan “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nın qəbul olunması mühüm əhəmiyyət kəsb edir.*

*Dövlət Strategiyasının əsas hədəfləri sırasında Azərbaycanın inkişaf konsepsiyasına uyğun olaraq hər bir şəxs üçün bərabər, keyfiyyətli təhsil imkanlarının yaradılması, təhsil sisteminin institusional əsaslarının, infrastrukturunun və insan resurslarının inkişaf etdirilməsi məsələlərinə xüsusi yer verilmişdir. Bütün bunlar texnologiyaları çevik mənimsəməyə, əmək bazarında layiqli yer tutmağa və ömürboyu təhsil prosesinə qoşulmağa imkan verən strateji və konseptual məqamlardır.*

*Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov söhbətində Dövlət Strategiyasında əksini tapmış müddəaların reallaşdırılması, təhsil sahəsində gözlənilən*

*dəyişikliklər və digər məsələlərə aydınlıq gətirdi.*

## Təhsil fenomeni dünyanın yeni inkişaf trendlərini müəyyən edir

***- Cənab nazir, ölkə Prezidenti cənab İlham Əliyev "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın təsdiq olunması ilə bağlı sərəncam imzalamışdır. Bu sənədin qarşıya qoyduğu əsas məqsəd nədən ibarətdir?***

- Strategiyanın konkret məqsədlərini qeyd etməzdən əvvəl istərdim ki, qısa şəkildə onu zəruri edən səbəblərə toxunam. Yaxın perspektivdə Azərbaycanda təhsilin inkişafını hədəfə alan Dövlət Strategiyasında da əks olunduğu kimi, ümummilli lider Heydər Əliyevin əsasını qoyduğu möhkəm bünövrə və onun layiqli davamçısı möhtərəm Prezident İlham Əliyevin apardığı genişmiqyaslı sosial-iqtisadi siyasət nəticəsində ölkəmiz hazırda özünün yüksək inkişaf dövrünü yaşayır. Aparılan məqsədyönlü islahatlar ölkəmizi müasir inkişaf səviyyəsinə çatdırmaqla yanaşı, həm də gələcək üçün etibarlı zəmin yaradıb. Azərbaycan artıq yeni dövrə - modernləşdirmə dövrünə qədəm qoyub. Bu dövrün hədəfləri sosial-iqtisadi həyatın qabaqcıl beynəlxalq təcrübəyə uyğunlaşdırılmasından, bu yolla davamlı iqtisadi inkişafın təmin olunmasından, eləcə də əhalinin həyat səviyyəsinin daha da yüksəldilməsindən ibarətdir. Xalqımızın müstəqil yaşamaq kimi tarixi haqqının gerçəkləşməsi gələcək inkişaf perspektivlərinin aydın şəkildə müəyyənləşdirilməsinə imkan verir. Güclü və dinamik inkişaf edən Azərbaycanın insan kapitalı müasir dövlətçilik fəlsəfəmizin əsas hədəfidir. Bu hədəflərin gerçəkləşməsi də xeyli dərəcədə təhsilin üzərinə düşür və onun daşıdığı missiya ilə bağlıdır.

Müasir dövrümüzdə insanlar, daha geniş çevrədə dövlətlər və nəhayət, bəşəriyyət bir şeyi aydın dərk edib ki, təhsil fenomeni dünyanın yeni inkişaf trendlərini müəyyən edir. Bu, dünən də belə olmuşdur, bu gün də belədir, gələcəkdə də belə olacaqdır.

Dünyada və onun bir parçası olan Azərbaycanda müasirləşmənin yolu yeni təhsil fəlsəfəsinin, elmi nailiyyətlərin və innovasiyaların məhsulu olan qabaqcıl texnologiyaların, idarəetmə üsullarının tətbiqindən keçir. Bunun üçün əsas prioritet istiqamətlər ölkə iqtisadiyyatının dünya iqtisadiyyatına inteqrasiyasını sürətləndirməkdən, insan kapitalının inkişafını, hər bir ölkə vətəndaşının müasir bilik və bacarıqlara yiyələnməsini təmin etməkdən ibarətdir. Bütün bunlara isə məhz təhsilin inkişafı sayəsində nail olmaq mümkündür.

Eyni zamanda, sürətlə modernləşən Azərbaycanda təhsilin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi üçün yeni, daha təsirli addımların atılmasına ehtiyac vardır. Bu ehtiyacın ödənilməsi tələbindən irəli gələn Dövlət Strategiyasının əsas məqsədi ölkədə səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət səviyyəsinə görə dünyada öncül mövqe tutan təhsil sistemi formalaşdırmaqdır. Bir daha qeyd etmək istərdim ki, təhsil sistemimiz iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğun səviyyəyə qaldırılmalıdır. Bunun üçün isə bizə yol göstərən, fəaliyyət istiqamətlərimizi müəyyənləşdirən konseptual sənədimiz var - Dövlət Strategiyası.

İnanmaq istərdim ki, strategiyanın reallaşdırılması bu məqsədə nail olmağa, təhsilin məzmununun, kadr hazırlığının, təhsildə idarəetmənin, infrastrukturun Azərbaycanın perspektiv inkişaf konsepsiyasına uyğun yenidən qurulmasına imkan verəcək,

ölkədə biliklərə əsaslanan iqtisadiyyatın və informasiya cəmiyyətinin təşəkkülünü, davamlı inkişafı təmin edəcəkdir. Bu, inkişafın Azərbaycan modelinin qurulmasında təhsildən gözlədiyimiz töhfələr olacaqdır.

***- Bəs, Dövlət Strategiyasının həyata keçirilməsi ilə bağlı perspektivdə hansı işlərin görülməsi nəzərdə tutulur?***

- İlk növbədə Dövlət Strategiyasının həyata keçirilməsi üzrə fəaliyyət planının layihəsi beş ay müddətində hazırlanaraq Azərbaycan Respublikasının Prezidentinə təqdim edilməlidir. Fəaliyyət planı Azərbaycan Respublikasının Prezidenti tərəfindən təsdiq olunduqdan sonra nəzərdə tutulan işlərin görülməsinə başlanılacaqdır. Artıq Təhsil Nazirliyində müvafiq sahələri əhatə edən fəaliyyət planının hazırlanması məqsədilə işçi qrup yaradılmışdır.

Onu da qeyd edək ki, strategiyanın həyata keçirilməsi üzrə fəaliyyət planı yerli mütəxəssislərlə yanaşı, beynəlxalq ekspertlər də cəlb olunmaqla hazırlanacaqdır.

Təbii ki, fəaliyyət planında islahatların məqsədi və strateji istiqamətləri, seçilmiş prioritetlər, onların reallaşdırılması üçün qəbul olunmalı dövlət proqramları, icraya məsul və tərəfdaş qurumlar, aralıq və yekun hədəflər, həmçinin icra dövrü dəqiq şəkildə müəyyən ediləcəkdir.

## Təhsilin keyfiyyətinin yüksəldilməsi üçün təhsili idarəetmə sistemi yenidən qurulmalıdır

***- Strategiya ilə tanış olduqda xeyli yeni hədəf və gələcək fəaliyyət istiqamətlərinin əks olunduğunu görürük. Ümumiyyətlə, əsas hansı istiqamətlər üzrə islahatların aparılması nəzərdə tutulmuşdur?***

- Bu sualla bağlı bir rəvayəti xatırladım. Məşhur rəvayətdə daş ustalarının birindən soruşanda ki, sən nə ilə məşğulsan? O cavabında araba ilə daş daşıdığını qeyd edir. İkinci ustadan soruşanda ki, bəs, sən nə ilə məşğulsan? O, "Şartr qəsrini tikirəm", - deyərək öz işini son məqsədə bağlamışdır.

İlk növbədə onu qeyd etmək istərdim ki, XXI əsrdə təhsilli insan anlayışı kifayət qədər yeni meyarlarla ölçülür. Bu gün təhsilli şəxs yeni əsrin ab-havasına daha yaxından bələd olmalı, düşüncə tərzi ilə yeni bilik və kommunikasiya texnologiyalarını əxz etməli, ömürboyu öyrənməli və ya informasiyanı biliyə, biliyi isə bacarığa çevirə bilməlidir. Bu yanaşma həm də müasir təhsil paradiqmalarını özündə ehtiva edir. Bunun üçün nə etməli? İlk növbədə təhsildə innovativ idarəetmənin bərqərar olmasına nail olmalı, hər bir təhsilalana hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir. Təhsilin keyfiyyətinin yüksəldilməsi üçün isə bir daha qeyd edirəm ki, təhsili idarəetmə sisteminin yenidən qurulması, bu sahədə insan resurslarının inkişaf etdirilməsi və müəllim peşəsinin nüfuzunun artırılması vacibdir.

Dövlət Strategiyasında qeyd olunan əsas parametrlər ölkədə keyfiyyət nəticələrinə və əhatəliliyinə görə beynəlxalq aləmdə öncül mövqe tutan, səriştəli müəllim və təhsil menecerlərini, müasir texnologiyaya əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılması üçün beş strateji istiqamətdə islahatyönümlü tədbirlərin həyata keçirilməsini nəzərdə tutur. Bunları strategiyada göstərildiyi kimi sadalasaq, belə təsnif edə bilərik: *təhsilin məzmunu, müəllim və tədris metodları, idarəetmə, infrastruktur və maliyyələşmə.*

Səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsilin məzmununun yaradılmasını nəzərdə tutan birinci istiqamət müasir təhsilşünaslığın ən çox müraciət etdiyi məsələdir. Stra-

tegiyada təhsilin məzmunu ilə bağlı məqam təhsil sisteminin bütün pillələrini - məktəbəqədər, ümumi, ilk peşə-ixtisas, orta ixtisas və ali təhsil üzrə kurikulumların inkişaf etdirilməsi kimi vacib hədəfləri əhatə edir.

Bildiyiniz kimi, "Təhsil haqqında" Azərbaycan Respublikasının Qanununa əsasən ümumi təhsilin dövlət standartları və proqramları təsdiq edilmişdir və hazırda tətbiq olunmaqdadır. Ümumi təhsil üzrə yeni hazırlanmış fənn kurikulumları I-VI siniflərdə tətbiq edilir. Digər siniflər üzrə də təhsilin məzmunu ilə bağlı start götürən proseslər də davam etdiriləcəkdir. Burada xüsusilə qeyd olunmalıdır ki, məktəbəqədər təhsil pilləsi üzrə kurikulumun işlənib hazırlanması çox vacib amildir və bu, strategiyada diqqət yetirilən məsələlərdəndir.

Mövcud ilk peşə-ixtisas və orta ixtisas təhsili kurikulumları da hazırda dövrün tələblərinə cavab vermir. Müəllim hazırlığı üzrə yeni kurikulumlar tətbiq edilsə də, bütövlükdə ali təhsil müəssisələrinin kurikulumları əmək bazarının müasir şərtlərinə uyğun gəlmir. Odur ki, strategiyanın birinci strateji istiqaməti üzrə, əsasən kurikulumların daha da inkişaf etdirilməsi nəzərdə tutulur və bu prosesin davamlı xarakter alması qeyd olunur.

*İkinci istiqamət* təhsil sahəsində çalışanların bilik, bacarıq və kompetensiyalarının daim inkişaf etdirilməsini nəzərdə tutur. Bu istiqamət müasir, innovativ təlim forma və üsullarını öz işində tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsinə nail olan səriştəli müəllimlərin hazırlanmasına xidmət edir. İndiyədək səriştəyə əsaslanmayan, əmək bazarında kifayət qədər rəqabətli olmayan əməkhaqqı sisteminin mövcud olması təhsildə müəllim amilinin inkişafına mənfi təsir göstərib. Ona görə də təhsil sisteminin bütün pillələrində müəllimlərin bilik, bacarıq və peşəkarlıq qabiliyyətlərinin müasir dövrün tələblərinə uyğun yüksəldilməsi təmin edilməlidir. Təsadüfi deyil ki, ikinci strateji istiqamət özündə həm də müəllimlərin peşəkarlığının yüksəldilməsi, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni sistemin qurulması, istedadlarının üzə çıxarılması və inkişafı, xüsusi qayğıya ehtiyacı olanların inklüziv təhsilə cəlb olunması kimi fəaliyyət sahələrini birləşdirir. Burada xüsusi qayğıya ehtiyacı olanların inklüziv təhsili anlayışının sərhədlərini geniş düşünmək lazımdır. Xüsusi istedadlı təhsilalanların da bu anlayışa daxil olması tamamilə yeni yanaşmalar tələb edir.

Bu yanaşmalar isə müasir, innovativ tədris metodlarının təcrübəyə gətirilməsini, İKT-dən təhsildə daha geniş istifadəni də nəzərdə tutur ki, bunlarsız müasir dərsi, çağdaş müəllimin fəaliyyətini təsəvvür etmək mümkün deyil.

*Üçüncü strateji istiqamət* təhsildə nəticələrə görə cavabdeh şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılmasına yönəlmişdir. Hazırda təhsilin idarə olunmasında başlıca problemlərdən biri tənzimləmə, idarəetmə və nəzarət funksiyalarının dəqiq müəyyən edilməməsidir. Dövlət təhsil müəssisələrinin tabeçilik məsələlərində müəyyən uyğunsuzluqlar qalmaqdadır. Dövlət Strategiyasında təhsilin idarəolunması ilə bağlı tamamilə yeni mexanizm ehtiva olunur. Nəzərdə tutulur ki, təhsil sistemində tənzimləmə və idarəetmə qabaqcıl beynəlxalq təcrübə əsasında müasirləşdirilsin, təhsil müəssisələrində nəticəyönümlü və şəffaf idarəetmə modeli tətbiq olunsun, təhsilin keyfiyyətinin təminatı və idarəetmə üzrə yeni məlumat və hesabat sistemləri yaradılsın. Bununla da təhsilin idarə olunması konseptində qərar vermə mexanizmləri, səlahiyyət və məsuliyyətin çərçivəsi, hesabatlılıq meyarları yeni mahiyyət kəsb edir. Səlahiy-

yətlə hesabatlılıq arasında uzlaşma, əlaqə mütənasibliyi təmin olunur.

*Dördüncü strateji istiqamət* müasir tələblərə uyğun və ömürboyu təhsili təmin edən infrastrukturun yaradılmasını nəzərdə tutur. Müşahidələr göstərir ki, tədris prosesində müasir texnologiyalar məhdud miqyasda tətbiq edilir. Ona görə də təhsil müəssisələrində İKT əsaslı təlim metodologiyasına uyğun infrastrukturun yaradılması yaxın perspektivin prioritet məsələsi hesab olunur. Burada bir məqama diqqət yetirmək lazımdır. Bu sənəddə ilk dəfə olaraq ömürboyu təhsil anlayışına xüsusi əhəmiyyət verilir. Bu da ondan irəli gəlir ki, informasiya cəmiyyəti ömürboyu öyrənmə bacarıqlarına sahib fərdlərə ehtiyac duyur.

Bu məqsədlə də təhsil müəssisələri şəbəkəsinin rasionallaşdırılması, distant təhsil, istedadlı və xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün təhsil, yaşlıların təhsili, regionlarda təhsil məsələləri üzrə məsləhət xidmətləri göstərən universal mərkəzlərin yaradılması, peşə tədris mərkəzləri və komplekslərinin qurulması kimi tədbirlər qeyd olunan istiqamət çərçivəsində nəzərdə tutulan əsas hədəflərdəndir.

Nəhayət, *beşinci istiqamət* ölkəmizdə iqtisadi cəhətdən dayanıqlı və dünyanın öndə gedən təhsil sistemlərinin standartları ilə eyni səviyyədə dura bilən maliyyələşdirmə modelinin qurulmasını özündə ehtiva edir. Bu istiqamət çərçivəsində təhsilin mövcud maliyyələşdirmə sisteminin təkmilləşdirilməsi, təhsil müəssisələrinin adambaşına maliyyələşmə sisteminə keçidi, ödənişli təhsil xidmətləri göstərilməsinin dəstəklənməsi və Təhsilin İnkişafı Fondunun yaradılması nəzərdə tutulur.

***- Dövlət Strategiyasının tətbiqi nəticəsində məktəbəqədər təhsilin müasir tələblər səviyyəsinə yüksəlməsi mümkün olacaqmı? Fəaliyyət planında bununla bağlı nələri görə biləcəyik?***

- Bu gün müasir təhsil platforması bizə onu deyir ki, təməl bacarıqlar uşaqlıq dövrünün ilk illərindən əldə edildiyinə görə uşaqların zehninin erkən yaş dövründən inkişaf etdirilməsi vacibdir. Bu səbəbdən məktəbəqədər təhsilin inkişafına dövlət siyasətində ciddi əhəmiyyət verilir.

Etiraf etməliyik ki, respublikamızda məktəbəqədər təhsilə cəlb olunma səviyyəsi aşağıdır. Belə ki, məktəbəqədər təhsillə əhatə səviyyəsi şəhərlərdə 23,4 faiz, kəndlərdə 8,7 faiz, ölkə üzrə isə 16,5 faiz təşkil edir.

Son illərdə paytaxtımızda yeni məktəbəqədər təhsil müəssisələrinin inşası və ya əsaslı təmiri istiqamətində çox mühüm addımlar atılmışdır. Bunun nəticəsində məktəbəqədər təhsillə əhatə səviyyəsi artaraq 27 faizə çatmışdır. Lakin bu sahədə həllini gözləyən problemlər hələ də qalmaqdadır. Ölkənin yaşayış məntəqələrinin əksəriyyətində məktəbəqədər təhsil müəssisəsi yoxdur. Dövlət Strategiyasında uşaqların erkən yaş dövründə inkişafının səmərəli təhsil modelinə əsaslanan standart və kurikulumların hazırlanması, məktəbəqədər yaşlı uşaqların fiziki və əqli inkişafını, sosiallaşmasını təmin edən, yaradıcılıq qabiliyyətlərini üzə çıxaran, onlarda həyati bilik və bacarıqları, davranış qaydalarını aşılayan təhsil standartlarının və yeni kurikulumların hazırlanması, məktəbəqədər, eləcə də ümumi təhsil müəssisələrində uşaqlara pulsuz əsaslarla müvafiq xidmətlərin göstərilməsi (dərs və ya təlim vəsaitləri və s.) də strateji hədəflər sırasında yer almışdır. Həmçinin erkən yaşlı uşaqların məktəbəqədər təhsillə əhatəsinin 90 faiz səviyyəsinə çatdırılması əsas məqsəd kimi qarşıya qoyulmuşdur. Burada bir şeyi nəzərə almaq lazımdır ki, biz məktəbəqədər təhsili təhsil pillələrinin çox vacib həlqəsi kimi nəzərə alaraq onun inkişaf perspektivini çox aydın görürük.

## 12 illik ümumi təhsili tətbiq edən ölkərin sayı 170-i ötüb

***- Dövlət Strategiyasında 12 illik ümumi təhsilə keçidlə bağlı məqam ictimaiyyətdə böyük maraqla qarşılanıb və çoxsaylı suallar yaranıb. Bu keçid təhsildə hansı yeniliklərə və keyfiyyət dəyişikliklərinə səbəb olacaq?***

- Əvvəla, onu bildirim ki, 12 illik ümumi təhsilə keçidi zaman, təhsilin məzmununda baş verən yeniliklər, bir sıra araşdırmaların nəticələrinin nəzərə alınması diktə edir.

Dünyanın bir çox qabaqcıl ölkələrində təhsil müddətinin artırılması istiqamətində artıq müəyyən addımlar atılmışdır və bu proses davam etməkdədir. Məsələn, Kanada, Fransa, Hollandiya və Çexiyada hazırda ümumi təhsilin müddəti 14 ildir. Almaniya, Böyük Britaniya, İsveç, Avstraliya və Yeni Zelandiyada 13 illik ümumi təhsil tətbiq olunur. ABŞ, Finlandiya, Cənubi Koreya, Polşa və bir sıra digər ölkələrdə isə ümumi təhsilin müddəti 12 ildir. Ümumiyyətlə, hazırda 12 illik ümumi təhsili tətbiq edən ölkələr dünya üzrə çoxluq təşkil edir. Son statistik məlumatlara görə belə ölkələrin sayı 170-i ötmüşdür. Çox az sayda ölkədə ümumi təhsilin müddəti 11 il təşkil edir. Onu da vurğulamaq istərdim ki, İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının məlumatına görə, hər hansı bir ölkədə istənilən təhsil pilləsi üzrə təhsil müddətinin bir il artırılması ölkənin Ümumi Daxili Məhsulunun 3-6 faiz artmasına gətirib çıxarır. Bununla yanaşı, təhsil müddətinin artırılması təhsilə ayrılan xərclərin də artması ilə nəticələnir. Özü də bu artım kifayət qədər böyük rəqəmlərlə ifadə olunur. Lakin xərclərin artmasına və olduqca böyük miqyaslı tədbirlərin həyata keçirilməsi perspektivlərinə baxmayaraq, bu, Azərbaycan dövlətinin strateji xəttini, neft kapitalının insan kapitalına çevrilməsini hədəfləyən kursun fəlsəfəsini əks etdirir.

12 illik ümumi təhsilə keçidin təmin olunması üçün mövcud təhsil standart və kurikulumların yenilənməsi, tam orta təhsil pilləsində təlimin istiqamətlər üzrə aparılması nəzərdə tutulmuşdur. Ən əsas məqamlardan biri ondan ibarətdir ki, 12 illik ümumi təhsil sisteminə keçidlə əlaqədar ölkəmizdə 10 illik icbari ümumi orta təhsil və 2 illik tam orta təhsil modeli tətbiq olunacaqdır. Bu modelə mərhələli şəkildə keçmək planlaşdırılır. Bu sahədə yeniliklərdən biri və məncə, ən mühümü tam orta təhsil səviyyəsində təhsil müəssisələrinin müxtəlif istiqamətlər üzrə bölünməsidir. Digər bir məsələ də onunla bağlıdır ki, biz ümumi orta təhsilin bu gün mövcud olan 9 illik icbari pilləsini bir pillə artırırıq. 10 illik icbari ümumi orta təhsil və 2 illik tam orta təhsil inkişafın yeni çağırışlarını dəyərləndirmək və daha yetkin vətəndaş yetişdirmək baxımdan əlavə resurs və gələcəyə hazır olmaq imkanıdır.

İnanırıq ki, ümumi təhsildə 12 illik təhsil modelinə keçid təhsilin keyfiyyətinin yüksəlməsinə öz müsbət təsirini göstərəcəkdir.

***- Cənab nazir, ümumi təhsilin məzmunu və dərsliklər bu gün hamının maraq dairəsində olan məsələdir. Bununla bağlı strategiyada hansı tədbirlərin həyata keçirilməsi gözlənilir?***

- Doğrudan da bu məsələyə cəmiyyət tərəfindən xüsusi diqqət var. Strategiyada səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsilin məzmununun yaradılması birinci istiqamət kimi nəzərdə tutulmuşdur. Beynəlxalq təcrübə göstərir ki, təhsilin məzmunu ilə bağlı başlıca meyillərdən biri kurikulumların ölkənin sosial-iqtisadi inkişaf tələbləri və prioritetləri ilə sıx əlaqələndirilməsindən ibarətdir.

Elmi-texniki tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktik bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Çünki səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha səmərəli xidmət göstərir.

Kurikulumların məzmunu texnoloji irəliləyişin gətirdiyi yenilikləri nəzərə almaqla daim inkişaf etdirilir. Bu isə müxtəlif təhsil pillələrində spesifik yanaşma tələb edir. Məsələn, ümumi təhsil pilləsində şəxsiyyətin hərtərəfli formalaşdırılması prioritet olduğu halda, ali təhsildə əmək bazarının cari və gələcək tələbləri əsas götürülür. Kurikulumlara əsaslanan yeni və alternativ dərsliklərin yaradılması, şagird və müəllimlərin müvafiq dərslik seçiminin təmin olunması bu sahədə görüləsi mühüm işlərdəndir. Bunlarla bərabər, istedadlı uşaqlar üçün xüsusi inkişaf proqramları, xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün inkişaf və inklüziv təlim proqramları da hazırlanacaqdır.

Bütün bunlar bizə o imkanları verəcək ki, təhsilalan təkcə bir dərsliyi deyil, daha geniş öyrənmə mənbələri ilə, sınaqdan çıxmış və dünyanın mötəbər nəşriyyatlarının qrifi ilə çap olunan xarici dərslik nümunələri ilə, o cümlədən elektron resurslarla tanış ola bilsin, öyrənməyi öyrənsin, yiyələndiyi biliyi bacarıq və vərdişə çevirsin. Məktəb isə müəllim mərkəzli deyil, şagird-öyrənən mərkəzli olsun.

## Müəllimlərin əməkhaqqının iki dəfəyədək artırılması nəzərdə tutulur

***- Bildiyimizə görə, strategiyada məktəblərin idarə olunması və maliyyələşməsi ilə bağlı konseptual qərarların qəbul olunması gözlənilir. Buna münasibət bildirməyinizi xahiş edirəm.***

- Tamamilə doğru söyləyirsiniz ki, strategiyaya əsasən təhsildə nəticələrə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə mexanizmlərinin yaradılması da qarşıda duran ən mühüm vəzifələrdəndir. Bilirsiniz ki, hazırda təhsil müəssisələrinin idarəetmədə rolu məhduddur. Özünüidarəetmə prinsipi əsasında fəaliyyət göstərən təhsil müəssisələri istisna olmaqla dövlət təhsil müəssisələri maliyyə müstəqilliyinə malik deyillər. Təhsil müəssisələrinin maliyyələşdirilməsi zamanı onların fəaliyyətinin nəticələri nəzərə alınmır. Eyni zamanda, təhsil müəssisələrinin rəhbərliyi tədrisin nəticələrinə görə ciddi məsuliyyət daşımırlar.

Təhsilin yüksək keyfiyyətini təmin etmək üçün bu sahədə monitorinq, keyfiyyət və fəaliyyət göstəriciləri sistemi inkişaf etdirilməlidir. Təhsil və kadr hazırlığı prosesinə, eləcə də təhsilin məzmununun təkmilləşdirilməsinə işəgötürənlərin cəlb olunması çox aşağı səviyyədədir. Halbuki onlar bu prosesdə yaxından iştirak etməlidirlər.

Bu istiqamətlər, yəni təhsilin nəticələrə görə cavabdeh, şəffaf və səmərəli tənzimləmə mexanizmlərinə malik, dövlət-ictimai xarakterli və dövlət-biznes tərəfdaşlığına əsaslanan idarəetmə sisteminin formalaşdırılması üçün strategiyada bir sıra məsələlər nəzərdə tutulmuşdur. Bu sahə qabaqcıl beynəlxalq təcrübə əsasında yenidən qurulacaqdır. Həmin təcrübəyə müvafiq olaraq tənzimləmə və idarəetmə funksiyalarını həyata keçirən dövlət qurumlarının səlahiyyət və məsuliyyət dairəsi yenidən müəyyənləşdiriləcəkdir.

Nəzərdə tutulmuşdur ki, təhsil müəssisələrinin yeni akkreditasiya, təhsil sahəsində dövlət-biznes partnyorluğu sistemləri yaradılsın. Biz nəzərə almalıyıq ki, təhsilala-

nın bilik, bacarıq və vərdişləri əmək bazarının tələblərinə müvafiq olmalıdır. Bu da işəgötürənin təhsil mühitinə cəlb olunması ilə bilavasitə bağlıdır.

Dövlət Strategiyasında nəzərdə tutulan təhsil müəssisələrinin reytinq sisteminin yaradılmasına xüsusi baxmaq lazımdır. Reytinqin bütün indikatorları nəzərə alınaraq ölçülməsi təhsil müəssisələri arasında sağlam rəqabətin stimullaşdırılması, rəqabət elementlərinin müəyyən olunması və tətbiq edilməsinə kömək edəcək. Bu həm də bizə təhsil qurumlarının - şəhər, rayon təhsil şöbələrinin fəaliyyətini təhsilalanların nailiyyətlərinə uyğun qiymətləndirməyə, təhsil göstəricilərini nəticəyönümlü təhlil etməyə, xarakterik problemləri və prioritetləri daha düzgün müəyyənləşdirməyə yardım edəcəkdir.

Buna görə də təhsil sistemində dövlət sifarişinin formalaşdırılması məsələlərinə yenidən baxılması, ali və orta ixtisas təhsili müəssisələrinə qəbul və yerləşdirmə mexanizminin təkmilləşdirilməsi, təhsil müəssisələrinin nəticəyönümlü və şəffaf idarəetmə modelinin yaradılması, təhsil ocaqlarına idarəetmə, akademik, maliyyə və təşkilati muxtariyyət verilməsi bu sahədə başlıca hədəflərdəndir və yəqin ki, bunların tətbiqi ilə bağlı müvafiq qərarlar qəbul olunacaqdır.

Maraqlı tərəflərin nümayəndələrinin iştirakı təmin edilməklə təhsil müəssisələrinin dövlət-ictimai xarakterdə (Valideyn-Müəllim Assosiasiyası, İdarəedici Şura, Qəyyumlar Şurası və s.) idarə olunması təhsilin idarəetmə işinin keyfiyyətcə yeni mərhələyə yüksəlməsini təmin edəcəkdir.

Təhsilin maliyyələşdirilməsi sahəsində də görüləsi işlər çoxdur. Burada ən böyük hədəf təhsilə adekvat həcmdə maliyyə resurslarının cəlb edilməsi, təhsil xərclərinin Ümumi Daxili Məhsula nisbətinin mərhələlərlə 5-6 faizə çatdırılması, təhsil müəssisələrinin bir təhsilalana düşən xərc əsasında maliyyələşdirmə mexanizminə keçididir. Biz strategiyada tamamilə yeni maliyyə institutunun - büdcədənkənar vəsaitlər hesabına formalaşdırılan Təhsilin İnkişaf Fondunun yaradılmasını nəzərdə tutmuşuq. Bu da təhsillə bağlı xüsusi layihələrin, tədqiqatların və s. yeni maliyyələşmə mexanizminin tətbiq olunmasına yardım edəcəkdir.

Bu gün müəllimlərimizi əməkhaqqının artırılması məsələsi çox maraqlandırır və bu barədə tez-tez müraciətlər olunur. Dövlət Strategiyasında bu məsələ də öz əksini tapmışdır. Belə ki, strategiyada müəllimlərin maddi motivasiyasının yaxşılaşdırılması, onların illik əməkhaqqının adambaşına düşən Ümumi Daxili Məhsula nisbətən mərhələlərlə, səriştə və nəticə əsasında diferensiallaşdırmaqla 1,8-2 dəfəyədək artırılması nəzərdə tutulmuşdur. Bununla bağlı daha dəqiq meyarlar fəaliyyət planında öz əksini tapacaqdır.

***- Cənab nazir, Dövlət Strategiyasının ilk peşə-ixtisas təhsilinin inkişafına təsiri nədən ibarət olacaqdır?***

- Son illərdə ilk peşə-ixtisas təhsili müəssisələrinin infrastrukturunun inkişafı sahəsində müəyyən işlər görülmüş, özəl sektor, işəgötürənlər və beynəlxalq təşkilatlarla əməkdaşlıq əlaqələri qurulmuşdur. Bu sahədə Təhsil Nazirliyinin həyata keçirdiyi “Müasir Azərbaycan peşəkarları” layihəsi partnyorlarla effektiv işbirliyi şəklində həyata keçirilir və iş davam etdirilir.

Lakin bu sahədə həlli vacib olan ciddi problemlər hələ də qalmaqdadır. İlk peşə-ixtisas təhsilinin kurikulumları müasir tələblərə cavab vermir. İlk peşə-ixtisas təhsili müəssisələrini bitirən şəxslərin sayı iqtisadiyyatın tələbatından xeyli geridir. Son illərdə ümumi təhsil müəssisələrini bitirən məzunların yalnız 11 faizinin ilk peşə-ixtisas təhsili müəssisələrini seçməsi, ümumilikdə,

ilk peşə-ixtisas təhsili müəssisələrində təhsilalanların cəmi 25-27 min nəfər təşkil etməsi cəmiyyətdə ilk peşə-ixtisas təhsilinə marağın aşağı olduğunu göstərir.

Strategiyada cəmiyyətin tələblərinə uyğun ilk peşə-ixtisas və orta ixtisas təhsili standartları və kurikulumlarının hazırlanması, eləcə də müasir təminatlı peşə-tədris mərkəzlərinin və komplekslərinin yaradılması nəzərdə tutulmuşdur. Həmin tədbirlərin həyata keçirilməsi, bu sahənin inkişafına öz müsbət təsirini göstərəcəkdir.

## Ali təhsildə yeni yanaşmalar tələb olunur

***- Strategiyada ali təhsil sahəsində hansı tədbirlərin həyata keçirilməsi planlaşdırılmışdır?***

- Son illərdə Azərbaycan Respublikasında ali təhsilin inkişafı istiqamətində mühüm işlər görülmüşdür. Bu sahədə Bolonya Bəyannaməsindən irəli gələn başlıca prinsiplərin tətbiqi ilə bağlı dövlət proqramları qəbul edilmiş, layihələr həyata keçirilmişdir. Bununla yanaşı, aparıcı beynəlxalq təşkilatların statistik təhlilləri Azərbaycanda yerləşən ali təhsil müəssisələrinin reytinq səviyyəsinin yüksəldilməsinin zəruri olduğunu göstərir. Bu da bizdən ali təhsildə yeni yanaşmaları tələb edir.

Azərbaycan ali təhsil sistemi Avropa ali təhsil məkanının bir hissəsi kimi qarşısında strateji məqsədləri hədəfləyirsə, o zaman ali təhsil sferasında - innovasiyaların təşviqi, ömürboyu təhsil, tələbə yönümlü rəqabət mühiti və sair istiqamətlərdə öncül olmalıdır.

Strategiyada ali təhsil müəssisələrinin təhsil-tədqiqat-innovasiya mərkəzlərinə çevrilməsinə dəstək verən və rəqabətqabiliyyətli mütəxəssis hazırlığını təmin edən ali təhsil standartlarının tətbiqi, cəmiyyətin və iqtisadiyyatın tələbatlarına uyğun olaraq hər bir ixisas üzrə müasir kurikulumların işlənməsi, ali təhsil müəssisələrinə təhsilin məzmununun tətbiqi müstəqilliyinin verilməsi, doktorantura səviyyəsi üçün elmi tədqiqat sahəsində yüksək hazırlığı və elmi-pedaqoji fəaliyyət üzrə mükəmməl səriştəyə yiyələnməyi təmin edən müasir standartların hazırlanması ilə bağlı tədbirlərin həyata keçirilməsi nəzərdə tutulmuşdur.

Bundan əlavə, təhsil sistemində dövlət sifarişinin formalaşdırılmasına yenidən baxılması, ölkənin siyasi, iqtisadi və sosial inkişafının real tələbatına əsaslanaraq prioritet sayılan sahələr üzrə kadr hazırlığının təmin edilməsi, ali və orta ixtisas təhsili müəssisələrinə qəbul və yerdəyişmə mexanizminin təkmilləşdirilməsi, dövlət və özəl ali təhsil müəssisələrinə ödənişli təhsil üzrə qəbul planının ləğv edilməsi və dövlət sifa-rişinin yalnız ixtisaslar üzrə müəyyənləşdirilməsi istiqamətində də mühüm işlərin görüləcəyi gözlənilir. Bütün bunların dəqiq çərçivəsi isə fəaliyyət planında öz əksini tapacaqdır.

***- Cənab nazir, bir qədər də təhsilin digər istiqamətləri üzrə atılacaq addımlar barədə məlumat verərdiniz...***

- Dövlət Strategiyası bütövlükdə təhsil sistemimizin modernləşdirilməsini nəzərdə tutur. Biz artıq təhsilin bir neçə əsas pilləsi üzrə görüləcək işlərə toxunduq.

Yaxın perspektivdə ali məktəb kampuslarının yaradılması, ömürboyu təhsilə artan tələbatın ödənilməsi üçün kitabxanaların fəaliyyətinin modernləşdirilməsi, rəqəmsal təhsil resurslarından istifadə imkanlarının genişləndirilməsi, təhsillə bağlı media və internet resurslarının inkişafının təmin edilməsi istiqamətində də ardıcıl tədbirlərin həyata keçirilməsi qərara alınmışdır.

***- Həyata keçiriləcək islahatlar zamanı beynəlxalq təcrübə nəzərə alınacaqmı?***

- Şübhəsiz. Əslində, Dövlət Strategiyası hazırlanarkən qabaqcıl ölkələrin təhsil sistemlərinin müvafiq inkişaf istiqamətləri öyrənilib. Təsadüfi deyil ki, bütün bu məsələlər strategiyada ayrıca bir bölmə kimi verilib. Bu baxımdan təhsilin sosial-iqtisadi rolu, keyfiyyəti və əhatəliliyi, məzmunu, müəllim və tədris metodları, idarəetmə məsələlərinin hər biri üzrə dünyada mövcud olan meyillər nəzərə alınıb. Strateji hədəflər və onlara çatmaq üçün nəzərdə tutulan tədbirlərdə də öncül təcrübənin nəzərə alınması qırmızı xətt kimi keçir. Bu da anlaşılandır. Məlumdur ki, hazırda dünyada baş verən qloballaşma prosesləri müxtəlif dövlətlərin, təhsil sistemlərinin inteqrasiyasını şərtləndirir. Hədəflər kimi Avropa Şurası tərəfindən tövsiyə edilmiş kompetensiyalar qrupu əsas götürülür. Artan tələbə-müəllim mübadiləsi nəzərə alınaraq təhsil standartlarının unifikasiyası məqsədi daşıyan Bolonya prosesi sürətlənir. Belə şəraitdə xarici təcrübəni nəzərə almamaq mümkün deyil. Amma bununla belə, qloballaşma həm də hər bir xalqın özünün milli-mədəni dəyərlərini qorumaq instinktini gücləndirir. Təbii ki, təhsil sahəsində həyata keçirilən islahat yönümlü tədbirlərdə də ilk növbədə milli-mədəni dəyərlər, tarixən yaranmış ənənələr qorunub saxlanacaqdır.

## Keyfiyyətli müəllim olmadan təhsili inkişaf etdirmək mümkün deyil

***- Strategiyada müəllim hazırlığı və nüfuzunun artırılması məsələsi necə, əksini tapıbmı?***

- Strategiyada bu məsələyə xüsusi yanaşma var. Ümumiyyətlə, təhsildə əsas meyar, başlıca düşüncə müəllimlə bağlı olmalıdır. Biz onu bilirik ki, nə qədər yüksək səviyyəli infrastruktur, tədris vəsaiti, maliyyə imkanları olsa da belə, keyfiyyətli müəllim olmadan təhsili inkişaf etdirmək mümkün deyildir. Təhsilalanın savadlı və səriştəli şəxs kimi formalaşması, əsasən müəllimin akademik bacarıqlarından, tədris təcrübəsindən və peşəkarlıq səviyyəsindən asılıdır.

Bilik və bacarıqlarını davamlı artıran müəllimlər təhsilalanların nailiyyətlərinə əlavə töhfələr verirlər. Yeri gəlmişkən qeyd edək ki, təhsil islahatı uğurla aparılan ölkələrdə müəllim peşəkarlığının inkişafı üçün stimulların yaradılmasına və müəllim hazırlığının təkmilləşdirilməsinə xüsusi diqqət yetirilir.

Müvafiq stimullaşdırıcı mexanizmlər və səmərəli monitorinq sistemi vasitəsilə müəllim fəaliyyətinin keyfiyyəti artırılmalıdır. Yüksək nüfuzlu təhsilverənin formalaşdırılması istiqaməti üzrə həyata keçiriləcək tədbirlər sırasına müəllimlərin peşəkarlıq səviyyəsinin daim yüksəlməsini təmin edən yeni sistemin yaradılması daxildir. Bu baxımdan təhsilverənlərin əlavə təhsili üzrə strukturların yaradılmasının stimullaşdırılması, pedaqoji heyət üçün yeni modul-kredit və rəqabətəsaslı təlimlər sisteminin yaradılması və digər məqamlar da nəzərdən qaçırılmamalıdır.

Bu istiqamətdə, həmçinin müəllim peşəsinin nüfuzunun artırılması üzrə dövlət siyasətinin inkişafına - səriştə və nəticə əsaslı diferensiallaşdırılmış, əmək bazasında rəqabətqabiliyyətli əməkhaqqı sisteminin yaradılması, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılması üzrə yeni sistemin yaradılmasına dair bir sıra mühüm işlərin görülməsi də nəzərdə tutulmuşdur.

***“Azərbaycan” qəzeti***
***23 noyabr 2013-cü il***

# TƏHSİL ŞURASININ ÜMUMİ YIĞINCAĞINDA

Bu ilin noyabrın 22-də Bakıda Rəşid Behbudov adına mahnı teatrında Azərbaycan Təhsil Şurasının hesabat-ümumi yığıncağı keçirilmişdir.

Yığıncaqda Azərbaycan Respublikasının Təhsil naziri Mikayıl Cabbarov iştirak etmiş və nitq söyləmişdir.

Respublikanın müxtəlif rayonlarında yığıncaqda, Bakı, Naxçıvan, Sumqayıt, Gəncə şəhərlərindəki təhsil ocaqlarında çalışan qabaqcıl müəllimlər, təhsil işçiləri, eyni zamanda, müxtəlif ali məktəblərin rektorları, təhsil sahəsi üzrə görkəmli tədqiqatçılar, mətbuat və mədəniyyət xadimləri iştirak etmişlər.

Yığıncaqda "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası" sənədindən irəli gələn vəzifələr müzakirə edilmişdir.

Məruzəçi Ə.Ağayev qeyd etmişdir ki, yeniləşən cəmiyyətin yeni-yeni vəzifələri meydana çıxır. Bu baxımdan "Azərbaycan Respublikasında Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası" sənədi xüsusi diqqət çəkir. Qısaca demək istərdim ki, Azərbaycan Respublikasında bu günə qədər sosial-iqtisadi, milli-mədəni və təhsil sahəsində xeyli nailiyyət qazanılmışdır. Bu sənəddə həmin nailiyyətlərdən bəhs olunur. Eyni zamanda, Strateji vəzifələr müəyyənləşdirilir. Mən bu sənədi inkişaf edən təhsilimizin yeni pilləsinə-keyfiyyət pilləsinə yüksəlişi adlandırardım.

Təhsil Şurasının sədri pedaqogika elmlər doktoru, professor Əjdər Ağayevin məruzəsi ətrafında çıxışlar olmuşdur.

Məruzə ətrafında çıxışlar olmuşdur. Salyan rayon Aşıq Pənah adına 1 nömrəlii məktəb-liseyin müəllimi, əməkdar müəllim, "Ən yaxşı müəllim" müsabiqəsinin iki dəfə qalibi Zabul Əhmədov, Şirvan şəhərindəki 9 nömrəli tam orta məktəbin müəllimi Sevinc Niftiyeva, ADPU-nun Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzov, Bakı PK İA və YH İnstitutunun rektoru, professor Asəf Zamanov, Milli QHT Forumunun prezidenti Rauf Zeyni, Çağ Öyrətim işlətmələri İdarə Heyətinin sədri dr. Enver Özeren, Bakı Musiqi Kollecinin direktoru prof. Nazim Kazımov, İmişli rayon TŞ-nin müdir müavini Vahid Tağıyev və başqaları çıxış edərək Təhsil Şurasının ötən fəaliyyətini qənaətbəxş saymış, qaldırılan problemlər üzrə fikir söyləmişlər.

Yığıncaqda Şuranın idarə heyəti seçilmişdir. Şuranın idarə heyətinə Əjdər Ağayev (sədr), Mirzəli Murquzov (müavin), Böyükağa Mikayıllı (məsul katib), Əbdül Əlizadə, Şaiq Əsgərov, Asəf Zamanov, Nazim Kazımov, Aliyə Təhmasib, Hikmət Əlizadə, Nəcəf Nəcəfov, Həqiqə Məmmədova, Hümeyir Əhmədov, Yusif Əliyev, Eldar Əhmədov, Akif Orucov, İslam Baxşıyev, Kamal Camalov, Samir Mehdizadə, Kəmalə Qədirova, Nəriman Hüseynov, Şirin Məmmədova, Sevinc Niftiyeva, Elşən Cəbrayılov seçilmişlər.

"Təhsil və zaman" qəzetinin baş redaktoru (Əjdər Ağayev) və redaktoru (Böyükağa Mikayıllı) təsdiq edilmişdir.

Sonda Təhsil Şurasının fəal üzvlərindən bir neçəsi rəğbətləndirilmişdir.

"Elm və Təhsil" adlı jurnalın təsis edilməsi nəzərdə tutuldu.

Azərbaycan müəllimlərinin XIV qurultayının çağırılması ilə əlaqədar təklif irəli sürülmüşdür.

# RESPUBLİKA TƏHSİL ŞURASININ ÜMUMİ YIĞINCAĞINDA TƏHSİL NAZİRİ CƏNAB MİKAYIL CABBAROVUN NİTQİ

**Hörmətli həmkarlar, hörmətli Təhsil Şurasının üzvləri və tədbir iştirakçıları!**

Ulu öndər Heydər Əliyevin iştirakı və tövsiyəsi ilə yaradılmış Təhsil Şurasının ümumi yığıncağında iştirak etmək mənim üçün çox xoşdur.

Son illər Azərbaycanda ölkə Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə təhsil sahəsində həyata keçirilən tədbirlərə və əldə olunan nailiyyətlərə toxunmaq istərdim. Respublikamızın paytaxtında, eləcə də bölgələrdə yeni məktəblərin tikilməsi, əsaslı təmiri, yeni təhsil ocaqlarının yaradılması hər birimizin gözü qarşısında baş verir.

Maddi-texniki bazanın gücləndirilməsi təhsildə taleyüklü bir məsələdir. Bu gün dünyada informasiya – kommunikasiya texnologiyaları sürətlə inkişaf edir. Təbii ki, Azərbaycan təhsilində də İKT-nin tətbiqi dövrün tələbidir. Ölkə başçısının məlum sərəncamları sayəsində bu gün İKT təhsilimizə sürətlə inteqrasiya etməkdədir.

Müstəqillik illərində təhsilimizin milli inkişaf proqramının qəbul olunması, təbii ki, cəmiyyətdə təhsilə münasibətin dəyişməsi, fənlərin məzmununda əsaslı dəyişikliklərin edilməsi, düşünürəm ki, təhsilimizin inkişafına təkan vermişdir. İndiyə qədər təhsilimizdə çox işlər görülüb. Həyatın qanunudur ki, insan hər hansı bir zirvəni fəth etdikdən sonra qarşısına daha yeni vəzifələr qoyur. Biz bu vəzifələrə bütün təhsil ictimaiyyəti ilə birgə işləyərək nail olmalıyıq. Bu gün bizim ən mühüm nailiyyətlərimizdən biri “qara qızıl”ın insan kapitalına çevrilməsi prinsipinə əsaslanaraq gənclərimizin dünyanın nüfuzlu ali məktəblərində təhsil almasına imkan verən xaricdə təhsil proqramının uğurlu tətbiqinə nail olmağımızdır.

Qarşımızda duran vəzifələrə və onların həlli yollarına toxunmaq istərdim. Ölkə başçısı cənab İlham Əliyevin təhsilimizə baxışlarını əks etdirən müddəalar yeni qəbul olunmuş təhsilin inkişafı üzrə Dövlət Strategiyasında öz əksini dolğunluğu ilə tapmışdır. Düşünürəm ki, strategiya hər bir təhsil işçisinin qarşısına yeni vəzifələr qoyur. Hesab edirəm ki, strategiyada nəzərdə tutulmuş hər bir istiqamət üzrə zəruri addımların atılması planlaşdırılmışdır. Bu məsələlərdən bəzilərinin üzərində dayanmaq istəyirəm.

Yeni məzmun: hamımız bilirik ki, biz təhsil sistemimizdə yeni məzmun – kurikulumu tətbiq edirik. Burada müxtəlif yanaşmalar var. Məsələn, şəxsiyyətyönümlü, nəticəyönümlü təhsil. Amma şəxsiyyətyönümlü təhsil heç də təhsilin məzmununun dəyişdirilməsi ilə yekunlaşmır. Bu, həm də təhsil verənlə təhsil alanın ünsiyyətinin dəyişməsi deməkdir. Biz təhsil sistemimizdə pedaqoji ictimaiyyətlə, yetişdirdiyimiz kadrlarla buna nə dərəcədə nail olacağıq? Bu, mürəkkəb bir sualdır. Yeni məzmunun tələblərinə nəzər saldıqda görürük ki, burada çox ciddi yanaşmalar var. Müəllimlərin mərkəzləşmiş qaydada imtahan verərək işə qəbulunun nəticələri də bir sıra faktları üzə çıxartdı. Məlum oldu ki, orta ixtisas müəssisələrinin məzunlarının üçdə ikisi qəbulda çox zəif nəticə göstəriblər. Təbii ki, bu, düşündürücü bir məsələdir. Bu, bizi vadar edir ki, pedaqoji kadr hazırlığı məsələlərinə diqqəti daha da artıraq.

Ümumi təhsil sistemində müəllimlərin əməkhaqqlarının diferensiallaşdırılması və artırılması istiqamətində olan zərurət barədə düşünürəm ki, biz müəllimlərin peşəkarlıqlarına, bilik səviyyələrinə, iş təcrübələrinə görə bu amilləri tətbiq etməliyik. Biz gərək bu meyarları sizinlə birlikdə işləyək. Azərbaycan məktəblərində müəllim-şagird nisbəti

bizim hamımıza məlumdur. Eyni zamanda, bir tərəfdən bəzi məktəblərdə müəllim sıxlığı yüksəkdir, bəzilərində isə müəllim çatışmır. Düşünürəm ki, biz bunu kifayət qədər optimallaşdırma üsulları ilə həll edə bilərik. Azərbaycanda müəllim ordusunun təxminən 4 faizi 1 saatdan 5 saata qədər dərs yükünə malikdir. Bu kimi məsələlər bizi vadar edir ki, optimallaşma məsələlərini kifayət qədər qısa zamanda həyata keçirək. Mövcud dərs yükü kifayət qədər yüksəkdir. Gün ərzində şagirdlər tərəfindən neçə saat dərs keçilməsi məsələsinə baxılmalıdır. Düşünməliyik ki, təhsil sistemimizdə profilləşməyə, təmayülləşməyə keçidi bu günə qədər həll edə bilməmişik. Lakin biz 12 illik təhsilə keçidlə bu məsələlərin də həllini nəzərdə tuturuq. Bunu qarşımızda hədəf kimi qoyuruq. Bu, ona gətirib çıxarır ki, həddindən artıq dərs yükü ilə yüklənmiş yuxarı sinif şagirdləri seçdikləri ixtisasları üzrə əlavə bilikləri əldə etmələri üçün hazırlıq prosesinə indikindən daha çox vaxt sərf etməlidirlər. Digər tərəfdən çox səmimi danışsaq, həyatın bugünkü inkişaf dinamikasını əvvəlki illərlə müqayisə eləmək olmaz. İnformasiyanın axım tempini biz aydın müşahidə edirik.

Optimallaşmanı mən nədə görürəm? Çox sadə bir misal çəkim. Azərbaycanda il ərzində 32 tədris həftəsi var. Orta Avropa göstəricisi 38 həftədir. 6 həftə fərqin nə demək olduğunu yəqin ki, izah etməyə ehtiyac yoxdur. Əgər biz qərar veririksə ki, ilimiz 32 həftədir, deməli, biz onun nəticələrini də qəbul edirik. Nəticə nə deməkdir? Deməli, biz şagirdlərimizə nəzərdə tutduğumuz biliyi 32 həftə ərzində verməliyik. Bu məsələyə daha dərindən baxsaq, görürük ki, ümumi təhsilə şagirdlər məktəbəqədər hazırlıqdan gəlir. Avropada uşaqların məktəbəqədər təhsilə cəlbi 90 faizdən yuxarıdır. Məktəbəqədər hazırlığı keçmiş şagirdin bir qayda olaraq, təbii ki, istisnalar da mövcuddur, məktəbəqədər hazırlıq keçməyən şagirddən hazırlıq fərqi aşkar hiss olunur. Düşünürəm ki, biz bu sahədə də islahatlara hazır olmalıyıq. Bizim hədəfimiz çox sadədir. Hədəf ondan ibarətdir ki, Azərbaycan təhsil sistemi müstəqil Azərbaycan Respublikasının vətəndaşını öz milli dəyərlərinə, adət-ənənələrinə bağlı vətəndaş kimi hazırlaya bilsin. Digər tərəfdən qloballaşan əmək bazarında rəqabətə davam gətirə bilən mütəxəssis yetişdirə bilsin. Əminəm ki, təhsil ictimaiyyətinin mütləq əksəriyyəti bu hədəfləri və bu dəyərləri bölüşür.

Dərsliklərə gəlincə, deməliyəm ki, bu, problemdir və bu problemin bir çox tərəfləri var. Mən sizi və özümü bu işdən ayırmaq istəməzdim. Biz təhsil sistemində hansısa əlavə addımları ata bilirikmi ki, hazırladığımız dərsliklər daha mükəmməl olsun? Bu sualın cavabını siz özünüz də verə bilərsiniz. Mən sizə bir fakt deyim. Təhsil Nazirliyi hər il həm yeni dərsliklərin hazırlanması üzrə, həm də dərsliklərin təkrar hazırlanması üzrə işlər həyata keçirir. Bizim ali təhsil ocaqları bir qayda olaraq bu işdə iştirak etmir. Bir tərəfdən biz deyirik ki, ali təhsil ocaqlarının yeni maliyyələşdirmə imkanlarını yaradaq. Biz istəyirik ki, ali təhsil ocaqları öz gəlirlərini yalnız təhsil haqqı hesabına formalaşdırmasınlar. Dünya təcrübəsində olan digər maliyyələşmə formalarından istifadə etsinlər. Dərsliklər istər pedaqoji, istər məzmun, istər didaktik, istər şagirdlər tərəfindən dərk edilməsi cəhətindən mükəmməl hazırlanmalıdır. Ali məktəblərin ən yaxşı mütəxəssisləri bu işdə iştirak etməlidirlər. Burada söhbət həm idarəetmədən, həm düzgün həvəsləndirmə sistemlərindən gedir. Bilirsiniz ki, biz bu ildən dərsliyin məzmunu ilə çap hissəsini bir-birindən ayırmışıq. Biz bunu ona görə edirik ki, elə bir sistem yaradaq ki, Azərbaycan dərsliklərini, dərslikləri hazırlaya bilən ən yaxşı mütəxəssislərə həvalə edək. Dövlət tərəfindən bu işə sərf olunan vəsait, ilk növbədə bu sahədə ən savadlı, mükəmməl məzmun ortaya qoya bilən mütəxəssislərə həvalə olunsun. Biz, təhsil ictimaiyyəti və yaxud təhsil sahəsində fəaliyyət göstərən qurumlar olaraq, təhsil sahəsində ixtisaslaşmış təşkilatlar vasitəsilə daha

mükəmməl nəticələr əldə edə bilərik. Biz bilirik ki, dövlət tərəfindən dərsliklərin keyfiyyətinə nəzarət edən monitorinq mexanizmi mövcuddur. Bəs qeyri – dövlət monitorinq mexanizmi məgər mövcud ola bilməz? Məgər bu iş təhsil sahəsində ixtisaslaşmış qeyri-hökumət təşkilatı tərəfindən aparıla bilməz? Biz bu sualları bu gün səsləndirməliyik və öz tərəfimizdən bunun üçün lazım olan texniki, maddi şəraiti yaratmağa hazırıq.

Bu gün təhsil sahəsində mənfi hallar da var. Mən bunu təhsil ab-havası adlandırıram. Təhsil ab-havası mükəmməl, şəffaf və açıq olmalıdır ki, biz istədiyimiz təhsil keyfiyyətinə nail olaq. Bu, bizim işimizin prioritet istiqamətlərindən birini təşkil edir.

Biz dərslik müəllifləri üçün dərinləşdirilmiş kurikulumun məzmunu, ixtisaslaşmış hazırlıq kursları həyata keçirməyi planlaşdırırıq. Çünki düşünürük ki, ilk növbədə dərslik tərtib edən müəlliflər yeni məzmunun tələblərinin nədən ibarət olduğunu bilməlidirlər. Qarşıdan gələn illərdə Azərbaycanın ümumi təhsil sistemində məcburi və seçmə fənlərinin tətbiqi nəzərdə tutulur. Şagirdə seçim hüququ verilməlidir. Bu, asan iş deyil. Bu, təhsil sistemimizin infrastrukturunda dəyişikliklər tələb edir. Bu da bir məqsəd kimi qarşımızda durur. Düşünürəm ki, qarşıdakı illərdə mərhələlərlə bunu həyata keçirəcəyik.

Bilirsiniz ki, təhsilimizdə "Ən yaxşı müəllim" və "Ən yaxşı ümumtəhsil məktəbi" müsabiqələri keçirilir. Düşünürəm ki, həmin müsabiqələrin formatı optimallaşdırıla və dəyişdirilə bilər. Məqsəd ondan ibarətdir ki, biz bu müsabiqələrdə əldə olunan nəticələri ümumilikdə təhsil sistemində tətbiqinin təmin edilməsi yollarını tapaq. Daha sadə yolla desək, hansısa yaxşı bir müəllimin mütəxəssislər qarşısında açıq dərs apara bilməsi və şagirdlər qarşısında da yüksək keyfiyyətli dərs apara bilməsi təqdirəlayiq bir haldır. Amma biz bu müəllimin istifadə etdiyi tədris metodlarını, işə yanaşmasını, digər əldə etdiklərini təhsil sistemində tətbiq edə bilirikmi? Tətbiq edə bilmiriksə o zaman belə bir istedadlı yanaşmanın məhdud və dar çərçivədə qalması bizim ümumilikdə təhsil sistemimizə maksimal faydanı verirmi? Mənim fikrimcə, bu sahədə islahatın istiqaməti bundan ibarət olacaqdır.

Mənim üçün mühüm olan bir məsələyə də toxunmaq istərdim. Bu, bizim şagirdlərimizin sağlamlığı, fiziki inkişafı ilə bağlı olan məsələdir. Əjdər müəllim burada bu məsələlərə müəyyən qədər toxundu. Məktəblərdə şagirdlərin qidalanma standartlarının dəyişdirilməsinə, qidalanma şəraitinin yaxşılaşdırılmasına ciddi ehtiyac var. Bilirik ki, Nazirlər Kabineti yay aylarında bu istiqamətdə mühüm bir qərar qəbul etdi. Biz yanvarın 1-dən bu qərarın icrası ilə əlaqədar işlərə başlayacağıq. İlkin mərhələdə Bakı məktəblərində bu istiqamətdə iş aparacağıq. Tədris ili ərzində bu iş ardıcıl olaraq görüləcək.

Ali təhsilə gəldikdə, ali təhsilin beynəlxalq təcrübəyə uyğun təkmilləşdirilməsi, yeni maliyyələşdirmə mexanizminin tətbiqi və s. istiqamətdə islahatlar davam etdiriləcəkdir. Bu, təhsil müəssisələrinin rəqabətqabiliyyətli mütəxəssis hazırlayan müəssisəyə çevrilməsinə təkan olacaqdır. Bu islahatın müəyyən məqsədlərinə biz artıq nail olmuşuq. Amma bu istiqamətdə məqsədlərə tam nail olmamışıq. Gələcəkdə bu istiqamətdə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da nəzərdə tutulduğu kimi addımlar zəruridir. Burada xüsusilə bir məsələyə diqqət çəkmək istəyirəm. Bu, ali təhsil mühitinə sağlam rəqabətin gətirilməsi ilə bağlıdır. Biz adambaşına maliyyələşmə prinsipini tətbiq edəndə "ilk olaraq vəsait tələbənin seçiminin arxasınca gedir" prinsipini əsas götürməyə çalışmışıq. Və həqiqətən də biz artıq görürük ki, bir sıra ali təhsil müəssisələri bunun nəticəsində öz maddi durumlarını əhəmiyyətli dərəcədə yaxşılaşdırmışlar. Onların illik büdcələri kifayət qədər artmışdır. Bu da onu göstərir ki, həmin təhsil müəssisələrinə tələbələrin sayı artır. Həm də görürük ki, elə təhsil müəs-

sisələri var ki, orada qəbul faizi tam ödənilmir. Bu müəssisələrdə rəqabət mühiti hələ tam formalaşmayıb. Ona görə ki, biz qəbul planı tətbiq etdiyimiz zaman maksimal qəbul həddini müəyyənləşdiririk. Burada universitetin imkanları, maddi-texniki bazası, elmi-pedaqoji kadr potensialı nəzərə alınır. Sırf iqtisadi dildə danışsaq, biz müəyyən həddi qoymuş oluruq. Gələcəkdə bu sahədə də müəyyən islahatların aparılmasını nəzərdə tuturuq.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən imzalanan Təhsilin inkişafı üzrə Dövlət Strategiyası özündə 21-ci əsrin çağırışlarını ehtiva edir. Strategiya təhsilin bütün mərhələlərində keyfiyyətcə yeni mərhələyə başlamağı, "qara qızılı insan kapitalına çevirək" fəlsəfəsini qarşımıza vəzifə kimi qoyur. Bu sənəd təhsilin bütün sferalarını, təhsilalanlardan təhsil verənlərədək, valideynləri, infrastrukturdan maliyyə resurslarınadək hər bir sahəni əhatə edir. Strategiyanın əsas məqsədi peşəkar bilik və bacarıqlara yiyələnən, rəqabətədavamlı insan qaynaqlarının yetişdirilməsi missiyasına xidmət etməkdir. Burada bizim üçün ən mühüm olan məqam nədən ibarətdir? Bunu sizinlə bölüşmək istərdim. İstənilən təhsil sisteminin əsas məqsədi vətəndaşı gələcək üçün hazırlamaqdır. Biz bu gün əmək bazarında yeni peşələr görürük. Elə peşələr ki, həmin peşələr üçün nəinki biz, heç dünyanın aparıcı universitetləri mütəxəssis hazırlamayıb. Bunu nə futuroloqlar, nə də təhsil mütəxəssisləri görə bilməyiblər. Belə hallar çoxdur və düşünürəm ki, gələcəkdə daha da çox olacaqdır.

Biz Bakıda Dünya Bankının ekspertləri ilə görüşərkən, onlar tərəfindən maraqlı bir statistika açıqlandı. Bu gün 9 yaşında olan uşaq ali məktəbi bitirib işə düzəlmə vaxtı gələndə 80 faiz ehtimal ondan ibarətdir ki, onun iş yeri bu gün hansısa bir ali təhsil ocağında tədris olunmayan bir ixtisas olacaqdır. Təbii ki, bu da təhsili idarəedənlərin qarşısında mühüm bir sual qoyur. Biz uşaqlarımıza hansı peşələri öyrətməliyik, onlara hansı ixtisasları verməliyik? Düşünürəm ki, biz bu günə qədər az istifadə etdiyimiz bir şüarı səsləndirməliyik. Bu da çeviklikdir. Bizim ən yaxşı verə biləcəyimiz təhsil çevik təhsil olmalıdır. Sürətlə inkişaf edən dünyanın tələblərinə ancaq çeviklikla, baza bilikləri güclü olan çevik bilik verməklə uyğunlaşmaq mümkündür. Baza da məlumdur. Düşünürəm ki, biz burada klassik düsturdan uzağa getmirik. "Başa salmaq", "dərk etdirmək" amilindən "öyrənmək" amilinə üstünlük verməliyik. Buna nail olmaq bizim ən mühüm vəzifələrimizdən biridir. Biz birmənalı olaraq təhsildə nəticəyönümlülük prinsipini davam etdirəcəyik.

Noyabrın əvvəllərində Təhsil Nazirliyinin internet səhifəsində ilk dəfə olaraq Bakı məktəblərinin reytinq cədvəlini yerləşdirdik. Reytinqlə birlikdə biz həmin o reytinqin hesablanması metodologiyasını yerləşdirdik. Bu reytinqi yerləşdirməkdə bizim əsas məqsədimiz, səmimi deyirəm, ondan ibarət deyildi ki, Təhsil Nazirliyi düşünür ki, bu cədvəldə adı birinci gələn ən yaxşı məktəbdir, adı sonuncu gələn məktəb isə ən pis məktəbdir. Xeyir, biz belə düşünmürük. Ona görə də orada metodologiyanı da yerləşdirdik. Biz ümid edirdik ki, bizi tənqid edəcəklər ki, sizin metodologiyanızda yanlışlıqlar var. Deyəcəklər ki, siz meyarları düzgün dəyərləndirməmisiniz. Hansısa meyarı ümumiyyətlə nəzərə almamısınız. Biz hələ də şərh gözləyirik. Mən mediada da bunun təhlilini görməmişəm. Amma kimisə işdən azad edib, işə təyin edirlərsə bu, mediada tamamilə fövqəladə bir hal kimi təqdim olunur. Biz hər zaman çalışacağıq ki, şəffaf ölçü meyarlarını tətbiq edək. Birlikdə işləyək, müzakirəyə açıq olaq.

Yaxın günlərdə Azərbaycan müəllimlərinin XIV qurultayı keçiriləcək. Mən sizin hər birinizi müəllimlər qurultayında görmək və bu gün səsləndirdiyimiz fikirlərin gələcəkdə həyatda öz təsdiqini tapması ümidi ilə sizlərdən ayrılıram.

***Pedaqogika, pedaqogika tarixi***

# AZƏRBAYCAN–TÜRKİYƏ ELMİ-PEDAQOJİ ƏLAQƏLƏRİNİN İNKİŞAFI TARİXİNDƏN

**Fərrux Rüstəmov**
***ADPU-nun professoru, pedaqoji elmlər doktoru, əməkdar elm xadimi, Beynəlxalq Pedaqoji Akademiyanın və Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü***

***Açar sözlər:*** *türk alimi, professor Xəlil Fikrət, pedaqogika tarixi, elmi-pedaqoji əlaqələr, kənd institutları.*

***Ключевые слова:*** *турецкий ученый, профессор Халил Фикрет, история педагогики, педагогические отношения, сельские учреждения.*

***Key words:*** *turkish scientist, professor Khalil Fikret, history of pedagogy, pedagogical relations, rural institutions.*

XX əsrin əvvəllərində regionda baş verən ictimai-siyasi hadisələr Azərbaycan-Türkiyə xalqları arasında iqtisadi, siyasi, elmi-pedaqoji əlaqələrin daha da güclənməsinə şərait yaratdı. Azərbaycanın azadlıq uğrunda mücadiləsində türk əsgərləri, Türkiyə Cümhuriyyətinin yaranmasında isə azəri övladları şəhid oldular. O dövrdə maarif sahəsində bir-birinə kömək etmək, hərbi sahədən heç də az əhəmiyyət kəsb etmirdi. 1918-ci ildə Azərbaycan Demokratik Cümhuriyyətinin dəvəti ilə 50 nəfər türk müəllimi Azərbaycana dəvət olundu. Onlar məktəblərin milliləşməsində, dərslik və dərs vəsaitlərinin hazırlanmasında fədakarlıqla çalışdılar. Bolşeviklər hakimiyyəti ələ aldıqdan sonra da türk ziyalılarının köməyindən istifadə etmək məcburiyyətində qaldılar. Azərbaycan Xalq Komissarları Sovetinin dəvəti ilə tanınmış türk alimləri-İsmayıl Hikmət, Xəlil Fikrət, Mühiddin Birgin, Mehmet Fuat Köprülüzadə, Əhməd Cövdət və b. Bakıya dəvət olundular. Bu, elə bir dövr idi ki, XX əsrin 20-ci illərində Azərbaycanda pedaqoji elmin inkişafında qeyri-marksist mövqedə dayanan nəzəriyyələr üstün rol oynayırdı. Bu nəzəriyyələrin bir qismi Avropadan Türkiyə və türk pedaqoqlarının Azərbaycanda nəşr olunmuş əsərləri vasitəsilə yayılır, digər qismi isə rus pedaqoji fikrindən tərcümə edilmiş əsərlərdən milli–pedaqoji fikrə keçirdi. Pedaqoji elmdə demokratik fikir daha güclü idi. Pedaqogikada demokratik fikirlərin formalaşması və inkişafında o dövrdə Azərbaycanda yaşayan və səmərəli elmi-pedaqoji fəaliyyət göstərən ilk türk pedaqoq alim Xəlil Fikrətin mühüm rolu vardı.

Xəlil Fikrət Kanat (Halil Fikret Kanat) 5 yanvar 1892-ci ildə Yunanıstanda, o zaman türklərin sıx yaşadığı Manastrın Serficə qəsəbəsində Osman bəyin ailəsində anadan olmuşdur. Çox erkən-altı aylığında atası vəfat etmiş, ailənin bütün ağırlığı anasının üzərinə düşmüşdü. Xəlil Fikrətin özündən başqa beş qardaşı və bir bacısı vardı. O, çox da fərəhli keçməyən uşaqlıq illərini belə xatırlayırdı: "Uşaqlığım tam sərbəstlik içində keçmişdir. Dağı, dərəni, çəməni, bostanı,

həyəti istədiyim kimi gəzib dolanırdım. Bu sərbəstlik içində yoxsulluğun acılarını hiss etmirdim. Ara–sıra bostan və qarğıdalı tarlalarında gözətçilik edər, gecələr də bayırda çardaq altında yatardım". X.Fikrət doğma kəndlərində ibtidai təhsil almış, 10 yaşında Manastrda yeni açılan sənaye məktəbinə (sənət məktəbinə) göndərilmişdi. Sənət məktəblərində tədris olunan fənlər o zamankı rüşdiyyələrdə–orta məktəblərdə öyrədilən fənlərlə, əsasən, eyni idi. Sənət məktəblərində əlavə olaraq dərzilik, pinəçilik, mürəttiblik öyrədilirdi. 4 il həmin məktəbdə oxuyan Xəlil Fikrət o illəri belə xatırlayırdı: "Sənaye məktəbinin son sinfində oxuyanda məktəbin fəxri müdiri Ziya Təpədələn təhsilə marağımı və məktəbdəki müvəffəqiyyətimi görərək mənim sənət məktəbini bitirdikdən sonra ya Manastr hərbi məktəbində, ya da mülki məktəblərin birində oxumağıma qərar vermişdi. Mən xeyirxahlığına və fəzilətinə görə atam qədər sevdiyim müdirin təklifini sevə – sevə qəbul etdim. Onun köməyi ilə Manastr liseyinin son siniflərində oxumağa müvəffəq oldum. 1910-cu ildən başlayaraq hər il edadi və ya lisey məzunlarından imtahanda yüksək nəticə göstərənlərdən iki nəfəri Avropaya göndərilirdi. Mən də imtahanlarda uğur qazanaraq Almaniyaya göndərildim".

Türkiyədən Avropaya tələbə göndərilməsi ideyasının gerçəkləşməsində Satı bəy (1880-1968) və İsmayıl Hakkı Baltaçıoğlunun (1886-1978) mühüm xidmətləri olmuşdur. Satı bəy 1909-cu ildə yazırdı: "Məktəblər millətin keçmişini əks etdirir, indisini təmin edir, gələcəyini göstərir". O, Avropa təhsil modelinə uyğun yeni türk məktəb sistemi yaratmağa çalışdığından 1909-cu ildə "Tatbikat mektebi" (sınaq məktəbi) açdı. Az sonra onun təşəbbüsü və rəhbərliyi ilə özəl məktəb açıldı. Maraqlıdır ki, 1890-cı illərdən Amerika, Fransa, İngiltərə də Almaniyanın təhsil sistemini öyrənmək məqsədi ilə oraya tələbə göndərirdi. Bunun əsas səbəbi Almaniyanın daha müasir və modern təhsil sisteminə malik olması idi. Türkiyə Cümhuriyyətinin ilk və önəmli təhsil qurucularından olan C.Dursunoğlu, A.Haydar Taner və Xəlil Fikrət də məhz həmin məqsədin gerçəkləşməsi üçün Avropaya göndərilmişdi. O dövrdə Türkiyədə orta məktəblərin son imtahanlarında uğur qazananlardan yaşca böyük olanlar Fransaya, kiçik olanlar isə Almaniyaya göndərilirdi. Almaniyadakı təhsil mühiti Xəlil Fikrətin görkəmli təhsil işçisi və bir alim kimi formalaşmağında mühüm rol oynamışdır. O, 1910-1912-ci illərdə Almaniya liseylərinin birində almanca mükəmməl öyrənmiş, əvvəlcə Berlin Universitetinin fəlsəfə, sonra Leypsiq Universitetinin pedaqoji fakültəsində təhsil almışdır. Berlin Universitetində məşhur professor Eduard Spranqerlə yanaşı, Dessoir, Erdman, Frischeisen – Köhler, Pazkovski, Vierkdnt, Zimmerman, Leypsiq Universitetində isə Barth, Bergman, Brahn, Jungman, Lamprecht, Lipsuis, Volketlt və Vuntun mühazirə və seminarlarında iştirak etmişdir (6, 3). 1917-ci ildə prof. Eduard Spranqerin doktorantı olmuş, "Pestalossinin dövlət məktəbi ilə bağlı düşüncələri" (1809-cu ilə qədər) mövzusunda dissertasiya müdafiə etmişdir. Onun elmi-pedaqoji və fəlsəfi baxışlarının formalaşmasına prof. E.Spranqerin və haqqında dissertasiya yazdığı H.Pestalossinin çox böyük təsiri olmuşdu. X.Fikrət alman dili ilə yanaşı, fransız dilini də mükəmməl bilirdi. O, Türkiyədə təhsil sahəsində dissertasiya müdafiə edən ilk elmlər doktorudur. Maraqlıdır ki, həm Xəlil Fikrət, həm də Əhməd Seyidov 1892-ci ildə anadan olmuşdur. Biri Türkiyədə, biri isə Azərbaycanda təhsil sahəsində dissertasiya müdafiə edən ilk elmlər doktoru kimi tarixə düşmüş, hər ikisi "Pedaqogika tarixi" dərsliyinin müəllifləri olmuşdur. X.Fikrət Türkiyənin, Azərbaycanın ayrı-ayrı pedaqoji təhsil müəssisələri ilə ya-

naşı, Almaniyada da pedaqogika və psixologiyadan mühazirələr oxumuşdur.

Xəlil Fikrət təhsilini başa vurduqdan sonra Vətənə dönmüş, Maarif Nazirliyində müşavir kimi əmək fəaliyyətinə başlamışdır. 1918-1919-cu illərdə hərbi xidmətdə olmuş, burada həm də hərbi təhsil almışdır. 1919-cu ildə İstanbuldakı Erenköy və Səlçuk Xatun liseylərində (qız məktəblərində) “Fenn-i Terbiye ve Malumat-ı Ahlakiye” (Tərbiyə və əxlaqi bilgi) müəllimi kimi çalışmışdır. Həmin dövrdə o həm də Çamlıca qız liseyində dərs demişdir (5, 561).

1923-cü ildə Azərbaycan Xalq Maarif Komissarlığının dəvəti ilə Bakıya gəlmiş, Nazirliyin məktəbəqədər təhsil bölümünün rəhbəri təyin edilmişdir. O dövrdə nazirliyin nəşriyyat şöbəsinə X.Fikrətlə birlikdə Bakıya gələn Mühiddin Birgin rəhbərlik edirdi. X.Fikrət 1923-1926-cı illərdə Bakı Dövlət Universitetində pedaqogika və psixologiya fənlərini tədris etmişdir. Bakıda işləyərkən onun ən böyük xidməti azərbaycanlı tələbələr üçün ilk dəfə olaraq ana dilində “Tədris və tərbiyə tarixi” adlı 2 cildlik dərslik yazması olmuşdur. Birinci cild 1924 və 1926–cı illərdə, ikinci cild isə 1926-cı ildə “Azərnəşr” tərəfindən çap edilmişdir.

Xəlil Fikrət Bakıda işləyərkən “Coğrafiyanın tədris üsulu” adlı kitab yazmışdır. Bakıda nəşrinə nail ola bilmədiyi həmin kitabı 1927-ci ildə bəzi əlavələrlə Türkiyədə nəşr etdirmişdir.

1926-cı ildə Xəlil Fikrət Odenvald məktəbinin təcrübəsini öyrənmək üçün Almaniyaya gedir. Təhsil uğurlarına görə həmin məktəb nəinki Almaniyada, həm də Avropada məşhur idi. İsveç alimi A.Ferrier (1879-1960) 1912-ci ildə həmin məktəbdə olarkən onu “şah əsər” adlandırmışdı. Tədris–tərbiyə prosesinin təşkili və idarə olunmasının spesifik xüsusiyyətlərini, müəllim – şagird münasibətlərini öyrənmək məqsədilə Xəlil Fikrət 14 mart 1927-ci ildə on gün həmin məktəbdə olur. Məktəbdə və onun yataqxanasında yaradılan öyrədici və tərbiyəedici mühitdən, müəllim–şagird əməkdaşlığındakı hədsiz sevgi və qayğıdan heyrətlənən X.Fikrət sonralar “Tərbiyə” jurnalında yazırdı: “Bu xoşbəxt ailə yuvasını tərk edərkən insanlığın gələcəyi haqqında ümidlərim qüvvətlənmiş, məsləkimə aid sevgim və cəsarətim artmışdır”. Böyük istək və arzularla yaşayan Xəlil Fikrət öyrəndiyi təcrübəni tətbiq etmək üçün Bakıya qayıtmaq istəsə də, ona sovet hökuməti Azərbaycana gəlməyə viza vermir. Həmin dövrdə keçmiş SSRİ-də siyasi vəziyyət kəskin şəkildə dəyişmişdi. O, 1927-ci ildə Almaniyadan Türkiyəyə dönmək məcburiyyətində qalır. Konyada açılan Qazi Orta Müəllim məktəbində pedaqogika müəllimi kimi pedaqoji fəaliyyətə başlayır. Az sonra həmin məktəbin Ankaraya köçməsi ilə əlaqədar olaraq o da tələbələri ilə birlikdə Ankaraya gəlməyə məcbur olur, 1956-cı ilə - təqaüdə çıxana kimi bu məktəbdə (29 il) işləyir. 1936-1939-cu illərdə Təlim – Tərbiyə Kurumunda çalışarkən belə pedaqoji fəaliyyətdən ayrılmır, həmin təşkilatın “Tərbiyə” adlı jurnalında təhsil – tərbiyənin vacib problemləri ilə bağlı məqalələrlə çıxış edir. Həmin məktəb Qazi Egitim İnstitutuna (indiki Qazi Universiteti) çevriləndə Xəlil Fikrət orada pedaqoji şöbə yaradır və ona rəhbərlik edir. O, 1945-1946-cı illərdə isə Türkiyə Kooperativçilik Kurumuna rəhbərlik etmişdir. “Okul Kooperatifi” Qanununun qəbuluna nail olur.

30-cu illərin axırlarında Türkiyədə kənd əhalisinin təhsil səviyyəsi çox aşağı idi, müəllim çatışmırdı. Ölkə əhalisinin 80 faizi kəndlərdə yaşayırdı. Milli dirçəlişin, intibahın kəndlərdən başlanması layihəsini Baş nazir İsmət İnönünün dəstəyi ilə 1938-ci ildə milli təhsil naziri vəzifəsində çalışan görkəmli maarifçi və islahatçı Həsən Əli Yüsel irəli sürmüşdü. Məqsəd kəndlərdən ibtidai məktəb məzunu olan bacarıqlı, qabiliyyətli

uşaqları bu məktəblərdə oxudaraq yenidən kəndlərə göndərmək idi. Ənənəvi ali pedaqoji məktəbləri bitirənlərin hesabına həmin kəndlərdə müəllim kadrlarına olan ehtiyacı aradan qaldırmaq mümkün deyildi. Ucqar kəndlərə könüllü olaraq gedəcək fədakar müəllimlərin sayı az idi. Həmin dövrdə Türkiyədə əhalinin cəmi 5 faizi oxumağı və yazmağı bacarırdı. Ona görə də Xəlil Fikrət böyüyən nəslin formalaşmasında fədakarlıq göstərəcək yeni müəllim hazırlığının nəzəri və praktik problemlərinə xüsusi diqqət yetirmiş, öz ideyalarını "Sabahın müəllimlərini necə yetişdirməli?" ("Vakıt" qəzeti, 24-27 mart, 1935) məqaləsində şərh etmişdi. Məqalədə türk intibahının, maarifçiliyinin, iqtisadi və siyasi dirçəlişinin mühüm prinsipləri şərh olunurdu. Həmin prinsiplərin xalq kütləsi arasında geniş təbliğinin vacibliyi vurğulanır, insanların bu prinsip əsasında fəaliyyət göstərmələrinin zəruriliyi irəli sürülürdü. Məqalədə oxuyuruq: "Türk kəndlərini yüksəltmək, inkişaf etdirmək görüləcək bütün işlərin ana xəttini təşkil edəcəkdir. Bu da kəndin və kənd əhalisinin ehtiyaclarına uyğun məktəb açmaq, kənd əhalisinin maariflənməsində fəal iştirak edən müəllimlər yetişdirməklə gerçəkləşəcəkdir". Xəlil Fikrət məktəblərdə ümumi təhsillə yanaşı, müəyyən bir peşənin öyrədilməsini də vacib sayırdı. O dövrdə kənd məktəbləri üçün müəllimlər hazırlamaqla bağlı xüsusi təhsil müəssisələrinin yaradılmasına ciddi ehtiyac var idi. Saffet Arkan, Həsən Əli Yüsel, İsmayıl Hakkı Tonguç, Emin Soysal, İsmayıl Hakkı Baltaçıoğlu ilə birlikdə Xəlil Fikrət bu ehtiyacı hiss edərək "Köy ögretmən okulları"nın (kənd müəllim məktəblərinin) yaradılmasının təşəbbüskarı kimi çıxış etdilər. Onların ciddi səyi və təşəbbüskarlığı nəticəsində 17 aprel 1940-cı ildə "Köy İnstitutları təşkilatları haqqında" qanun qəbul edildi. Həmin qanuna əsasən 21 bölgədə, əvvəlcə İzmir, Eskişehir, Ədirnə, Kastamonuda, sonralar isə Antalya, İsparta, Aganazarı, Kayseri, Malatya, Adana, Samsun, Trabzon, Balıkesir, Kars, Ankara, Sivas, Konya, Ərzurum, Diyarbəkir, Aydın və Vanda kənd təsərrüfatı işlərinə əlverişli əraziləri olan kəndlərə yaxın yerlərdə "Köy ögretmən okulları" yarandı. Bu institutların açılmasının pedaqoji əsaslandırılması Xəlil Fikrətə məxsus idi. 1954–cü ilə qədər müəllim məktəbləri bağlananadək oranı 1308 qadın və 15943 kişi bitirmişdi. Türkiyənin sonralar tanınmış yazarları olan Fakir Baykut, Ümit Kaffançıoğlu, Talıp Apaydın, Mahmut Makal, Mehmet Başaran, Pakize Türkoğlu, Hatun Birsen Başaran, Əli Dündar, Mehmet Uslu, Dursun Akçam kimi şəxslər həmin məktəbin məzunları olmuşdur (1). Müəllim məktəblərini bitirənlər kəndlərdə uşaqlara formal təhsil verməli, oxuma, yazma, sayma və digər əsas bacarıqları öyrətməklə yanaşı, həm də əkinçilik texnikasının əsaslarını mənimsətməli idilər. Burada "iş üçün, iş içində təhsil" prinsipi tətbiq edilirdi. Bu tədris müəssisələrində təlimlə əməyin əlaqələndirilməsi haqqında Con Dyunun ideyaları həyata keçirilirdi.

Xəlil Fikrət Türkiyədə elmi-pedaqoji və siyasi mühitdə yaxşı tanınan alim olmuşdur. Dövrün tanınmış yazarları, siyasətçiləri, alimləri ilə sıx əlaqədə olmuş, türk ziyalılarını bir araya gətirərək Anadolu Kulubunu yaratmışdır. O, ziyalı bir xanımla - Ankara qız məktəbinin ədəbiyyat müəlliməsi Fazilə xanımla ailə qurmuş, 92 illik şərəfli və mənalı bir ömür yaşamış, 1974-cü ildə Ankarada vəfat etmişdir.

Önəmli fikir və düşüncə sahiblərindən biri olan Xəlil Fikrət bütün varlığı ilə türk təhsil quruculuğuna bağlı bir insan idi. O, təhsil işçisi kimi yüksək əxlaqi keyfiyyətlərə, idarəetmə səriştəsinə və müəllim kimi fitri pedaqoji qabiliyyətlərə malik idi. Onun öz övladı olmasa da, uşaqları öz balası kimi sevər, onlarla vaxt keçirməkdən zövq alardı.

Uşaqlar ona “Fikrət baba” və ya “baba Fikrət” deyərmişlər. Həmkarı Hüsnü bəy yazılarında Xəlil Fikrəti belə xatırlayırdı: O, hər hansı bir müəllim kimi deyildi. Onun digərlərində görmədiyim xüsusiyyəti var idi. Olduqca çalışqan, yorulmadan işləyən, çox və asan yazan, peşəsindən başqa heç bir düşüncəsi və əməli olmayan insan idi. Uşaqları sevir, müəllim kimi fəaliyyət göstərməkdən qürur duyurdu. İmkansızlara və kasıblara qarşı xüsusilə həssas idi. Düşündüklərini olduğu kimi söyləyən, heç kimə boyun əyməyən, sözün tam mənasında müstəqil bir müəllim idi. Gözəl, aydın və səlis nitqi var idi.

Xəlil Fikrət yazırdı ki, məktəblərin əsas qayəsi bilik ilə əxlaqi davranışı əlaqələndirməkdən ibarətdir. Bilikli insan əxlaqsız olarsa, bilik oğru əlindəki fənər kimi dolanbaclı yollarda pisliyə xidmət edən bir alət rolunu oynayar. Peşə sahiblərinin insanlığı zəif olarsa, cəmiyyət bundan çox zərər görər, dürüst insanlar bundan əziyyət çəkər, tacir hiylə işlədər, məmur rüşvət alar, mühəndislər, ustalar keyfiyyətsiz iş görər, varlı əyri yollarla sərvət toplayar.

Xəlil Fikrət həqiqətən də öz dövründə Türkiyədə ən çox yazan və məqalələri nəşr olunan pedaqoq alimdir. O, on beşə qədər kitab və kitabçanın, dərslik və dərs vəsaitinin, Bakıda (“Maarif və mədəniyyət”, “İnqilab və mədəniyyət”, “Məktəb”, “Maarif işçisi”, “Yeni məktəb”) və Türkiyədə (“Tərbiyə”, “Karınca”, “Hayat”) nəşr olunan jurnallarda çap edilmiş onlarla elmi məqalənin müəllifidir. Əsərlərinin ümumi həcmi üç min səhifədən artıqdır. Onun pedaqoji yaradıcılığı çoxşaxəlidir. Tərbiyənin psixoloji, sosioloji əsasları, nəzəri və praktik problemləri, ailə tərbiyəsi, çətin uşaqların tərbiyəsi, təhsil tarixi ilə bağlı maraqlı və ciddi elmi araşdırmaları vardır. Onun yaradıcılığında aşağıdakı istiqamətlər aparıcıdır: təhsil psixologiyası, tədris metodları və tədris proqramları, təhsil sosiologiyası, təhsil tarixi, xalq təhsili, təhsil fəlsəfəsi və s. O, yaradıcılığa çox erkən başlamış, hələ tələbə olarkən müəllimi prof. Hans Stumme ilə əməkdaşlıq etmiş, 1916-cı ildə Leypsiqdə “Türkischə Lesestoffe” (Türk antologiya) kitabının nəşrinə nail olmuşdur.

Əsərlərindən bəzilərinə diqqət yetirək:

1. “Höte və Faust”. Bu kitab ilk dəfə 1922, sonra isə 1940-cı ildə nəşr edilmişdir. 3 hissədən ibarətdir. Birinci hissədə İohann Volfqanq Hötenin həyatının ən mühüm məqamları, ikinci hissədə şəxsiyyətinin xarakterik cizgiləri, üçüncü hissədə “Faust” əsərinin pedaqoji siqləti araşdırılır. (Maraqlıdır ki, həm Höte, həm də Xəlil Fikrət Leypsiq Universitetinin məzunları olmuşlar). Faust bütün həyatını bilik öyrənməyə həsr edən, lakin həyatda ciddi uğurlar qazana bilməyən bir qocadır. O, cadugərliklə məşğul olmaq üçün bilik əldə etməyə çalışır. Ona görə də məşəqqətlərlə qarşılaşmalı olur. Sonda bəşəri xoşbəxtliyi fəaliyyətdə tapır. Kitabın əsas materialları 1926-cı ildə Bakıda nəşr olunan “İnqilab və mədəniyyət” jurnalında çap edilmişdir.

2. “Tərbiyə və tədris tarixi”. Bu əsər ilk dəfə Bakıda nəşr olunub. Sonra 1930, 1946, 1963-cü illərdə İstanbulda işıq üzü görüb. Həm Türkiyədə, həm də Azərbaycanda pedaqogika tarixinə dair ilk dərs vəsaiti olan bu kitab, əsasən, alman və türk mənbələri əsasında yazılmış, ilkin mənbələr təhlilə cəlb olunmuşdur. Kitabın birinci hissəsində XIX əsrə kimi dünya məktəb və pedaqoji fikrinin ən önəmli fakt və hadisələrinə, elmdə vətəndaşlıq qazanmış nəzəriyyələrinə toxunulmuş, həm Şərq, həm də Avropa filosoflarının pedaqoji görüşləri açıqlanmış, məktəb sistemi şərh olunmuşdur. Dərs vəsaitində Qədim Yunanıstanın (Sparta və Afina) tərbiyə və məktəb sisteminin, Sokratın, Əflatunun (Platonun), Ərəstunun (Aristotel) pedaqoji nəzəriyyələrinin, Roma

tərbiyə sisteminin, M.F.Kvintilianın nəzəri fikirlərinin, qrammatika və ritorika məktəblərinin məqsəd və vəzifələrinin, intibah dövrü pedaqogikasının, V.Feltrenin, F.Rablenin, T.Morun, Montaydenin, Dekartın, Fenelonun, Bekonun, Radkenin, Y.A.Komenskinin, Franke və Piyetsonun, C.Lokkun, J.J.Russonun, filantropizm cərəyanı nümayəndələrinin (Bazedov, Zalsman, Trapp), Pestalotsinin, Disterveqin, Kantın, Herbartın, Frebelin, Spenserin, K.Marksın pedaqoji fikirlərinin tələbələrə öyrənilməsi nəzərdə tutulur.

Dərs vəsaitinin birinci hissəsində diqqəti cəlb edən cəhət islamdan əvvəl və islam dövründə türklərdə tərbiyə problemlərinin şərhidir. Burada islamın yaranması ərəfəsində Ərəbistandakı ictimai-siyasi durum, islamın qəbulu, Məhəmməd Peyğəmbərin (ə.s.) əxlaqi görüşlərinin təhlili, Quranın məzmununun açıqlanması mühüm yer tutur, islamın Şərqdə mədəniyyətin, maarifin və pedaqoji fikrin inkişafına təsiri öyrənilir. İmam Qəzzalinin, İbn Qafilin, Göy Kavusun tərbiyə haqqında fikirləri təhlilə cəlb olunur. Səlib müharibələrinə qədər və səlib müharibələri dövründə məktəb və tərbiyə problemlərinə toxunan Xəlil Fikrət Yusif Xas Hacibin pedaqoji fikirlərinin təhlili üzərində geniş dayanır, onun "Kutadqu bilik" dastanının pedaqoji siqlətini aşkarlayır.

Dərs vəsaitinin ikinci hissəsində XX əsrin əvvəllərində yaranmış tərbiyə cərəyanları və yeni məktəb sisteminin bəzi məsələlərinin şərhi geniş yer tutur. Kitab sonralar Türkiyədə dəfələrlə nəşr edilmişdir. Ankara nəşrlərində kitaba Türkiyədə təhsil və pedaqoji fikrin inkişafı ilə bağlı kifayət qədər məlumat daxil edilmişdir.

Xəlil Fikrətin "Tərbiyə və tədris tarixi" dərs vəsaiti xarici ölkələrin məktəb və pedaqogikasını öyrənməkdə qiymətli mənbə olmaqla bərabər, sonralar Azərbaycanda Saleh Xəlilovun, Əhməd Seyidovun, Fərrux Rüstəmovun "Pedaqogika tarixi" dərs vəsaitlərinin hazırlanmasına qüvvətli təsir göstərmiş, dəyərli mənbə rolunu oynamışdır.

3. "Müasir tərbiyə idealları və təhsildə yeniliklər". 1934-cü ildə nəşr olunan bu kitab orijinal deyildir. "Tədris və tərbiyə tarixi"nin 1930-cu il nəşrində pedaqoji cərəyanlarla bağlı ixtisar olunan hissənin kitab şəklində nəşridir. Həmin hissələr "Tədris və tərbiyə tarixi" kitabına daxil edilmişdir.

4. "Pedaqoji". 1937 və 1938-ci illərdə nəşr olunan bu kitab iki cilddən ibarətdir. 1953-cü ilə kimi müəllim hazırlayan institutlarda əsas dərs kitabı kimi istifadə olunmuşdur. Digər pedaqogika kitablarından özəlliyi ondadır ki, burada təhsil quruculuğunda vacib hesab olunan təhsil prinsipləri G.Kerşenşteynerin "Təhsil və öyrətmə qaydaları" prinsipləri əsasında şərh olunmuşdur.

5. "Ailədə uşaq tərbiyəsi". Kitab ilk dəfə 1941-ci ildə nəşr olunub. Sonralar dəfələrlə nəşr edilmişdir. Burada türk ailələrində uşaqların tərbiyəsinin özəlliklərindən, prinsip və üsullarından, uğur qazanmanın vasitələrindən bəhs olunur. Əsaslandırılır ki, milli və ictimai tərbiyənin əsası ailədə qoyulduğundan yetkin ailə millətin təməlini təşkil edir.

6. "Milliyyət idealı və hərtərəfli milli tərbiyə". Türk təhsil tarixçilərinin xüsusi önəm verdikləri orijinal bir əsərdir. Burada cəmiyyətin inkişafında təhsilin oynadığı xüsusi rol inandırıcı faktlarla sübut olunur, bunun üçün isə ailə–məktəb-cəmiyyət-dövlət modelinə riayət edilməsi vacib hesab olunur.

7. "Xarakter anlayışı və xarakter tərbiyəsi". Bu kitab G.Kerşenşteynerin kitabının tərcüməsidir.

8. "İş pedaqojisi". 1944-cü ildə nəşr olunan bu kitab E.Burgerdən tərcümədir. Əsasən kənd məktəbləri üçün müəllimlər hazırlayan institutlarda tədris vəsaiti kimi istifadə olunmuşdur.

9. "Şahmat bələdçisi" ("Satranc Kıla-

vuzu”). 1936-cı ildə nəşr olunan bu kitabda şahmatın əhəmiyyətindən, uşaqların təfəkkürünün inkişafında onun rolundan bəhs olunur.

10. “Təhsil sosiologiyası” (“Egitim sosiolojisi”). Təhsilin sosioloji problemlərindən bəhs edən bu əsər 1958-ci ildə yazılmışdır.

11. “Pestalossi”. Doktorluq dissertasiyası kimi müdafiə etdiyi bu əsər 1931-ci ildə İstanbulda kitab şəklində nəşr olunmuşdur. X.Fikrət əsərin “Müqəddimə”sində yazır: “İnsanlıq tarixində fikir və tərbiyə aləmində Pestalossinin qiyməti böyükdür”. Müqəddimə, uşaqlığı və məktəb həyatı, Pestalossinin gəncliyi, eşq dərvişi və fermer həyatı, Pestalossi mühərrir kimi, Pestalossi və Fransa inqilabı, Pestalossinin xoşbəxt günləri və vəfatı bölmələrindən ibarət olan bu kitabda Pestalossinin insanlıq tarixində oynadığı rol xarakterizə edilir, onun elementar təhsil ideyasının mahiyyətinə aydınlıq gətirilir, əxlaq, əmək, fiziki tərbiyə ilə bağlı fikirləri şərh olunur. Əsərdən belə məlum olur ki, o, illərlə kimsəsiz uşaqlarla bir yerdə yaşayıb, kasıblıqda öz çörəyini onlarla bölüşüb, dilənçilərə insan kimi yaşamağı öyrətmək üçün özü də dilənçi kimi yaşamalı olub. Kitabda Pestalossinin “Rahibin axşam saatları”, “Linqart və Gertruda”, “Gertrudanın öz uşaqlarına tərbiyə verməsi”, “Analara məxsus kitab”, “Müşahidələr əlifbası”, “Rəqəm haqqında əyani təlim”, “Qu nəğməsi” kitabları təhlil edilir.

Onun “Şiller” (1929), “Höte” (1929), “İlk məktəb müfəttişlərinə rəhbərlik” (1929), “Pedaqoji təkamül və pedaqoji elm” (1955) və indiyə qədər tədqiqatlardan təcrid olunan xeyli əsərləri vardır. Qətiyyətlə demək olar ki, X.Fikrət Türkiyədə təhsil quruculuğunda fədakarlıqla çalışan, onun elmi-pedaqoji əsaslarını müəyyənləşdirən, milli müəllim kadrları hazırlığının nəzəri-praktik problemlərini işləyib hazırlayan, xarici ölkələrin təhsil və pedaqoji fikir tarixini, mütərəqqi Avropa təhsil nəzəriyyələrini ölkəsində tədqiq və təbliğ edən, türk təhsilinin müəyyən bir mərhələsinin tarixini, Azərbaycan-Türkiyə elmi-pedaqoji əlaqələrini yaradanlardan biri, dünyada təhsil üzrə ilk türk pedaqoq alimdir. Təəssüf ki, bu müqtədir alimin, türk təhsil tarixinin patriarxının pedaqoji irsi nə Türkiyədə, nə də Azərbaycanda sistemli şəkildə öyrənilmiş, həyatı və yaradıcılığının əsas istiqamətləri xüsusi monoqrafiyaların və dissertasiyaların predmetinə çevrilmişdir. Azərbaycanda hələ keçən əsrin 90-cı illərində F.Rüstəmovun doktorluq, H.Bayramovun namizədlik dissertasiyasında Xəlil Fikrətin yaradıcılığına az da olsa toxunulsa da, bu, qətiyyən yetərli deyildir. Son illərdə Avropa Azərbaycan məktəbinin əməkdar müəllimi Nazim Nəsrəddinovun fədakarlıqla bu işə girişməsi bizdə məmnunluq hissi yaratmaya bilməz.

Türkiyədə (H.Cezayiroğlu, İ.Doğan, T.Çetin, Ş.Oruc, H.Tokcan, F.Ovat, H.Cicioğlu, İ.Baykal, H.Demirkaya, H.Öymen, C.Şahin, E.Taşdemirçi, K.Turan və s.) və Azərbaycanda (N.Nəsrəddinov) onun pedaqoji irsini təbliğ edən tədqiqatçıların araşdırmalarına hörmət və ehtiramla yanaşaraq, ayrı-ayrı məqalələrdə səsləndirilən “Xəlil Fikrətin pedaqoji irsinin ciddi tədqiqata ehtiyacı var”-fikrini təkrar etmək məcburiyyətindəyik. Türk araşdırıcısı Fuat Ovat X.Fikrətə qarşı diqqətsizliyi və sayğısızlığı ürək ağrısı ilə dilə gətirərək yazırdı: “Böylə biri yaşamadımı, - deyə düşünməsi gəlir insanın”. Təəssüf ki, hələ də Xəlil Fikrətin pedaqoji irsinin araşdırması ilə bağlı ciddi elmi-tədqiqat əsərləri yazılmamışdır.

Prof. Xəlil Fikrət yazırdı: “Ölülər də əsərləri ilə öz yaşamlarını davam edirlər”. Anadan olmasından 120 ildən artıq vaxt keçməsinə baxmayaraq, Xəlil Fikrət də yazdığı elmi əsərlərinə, Türkiyədə təhsil quruculuğundakı fədakarlığına görə insanların yad-

daşında, ayrı-ayrı əsərlərin sətirlərində, minlərlə insanın xatirələrində yaşayır və gec-gec olsa da anılır. 2000-ci ildə Türkiyə-Alman Mədəniyyət Mərkəzində, Türk egitim dərnəyində Xəlil Fikrət anılmış, onun haqqında türk egitim dərnəyinin bilim kurumu başkanı prof. Özcan Demirel, TED Genel başkanı Ş.Baran Asena, təhsil yazarı Cavit Binbaşıoğlu, prof. Mahmut Tezcan, dosent Rifat Miser, Yalçın Soysal və digərləri onun haqqında maraqlı məruzələrlə çıxış etmişdir. 2006-cı ildə Qazi Universitetinin Pedaqoji fakültəsində Xəlil Fikrətə həsr olunmuş xatirə gecəsi keçirilmişdir. Gecədə prof. M.Çağatay Özdemir, Cavid Binbaşıoğlu, dos. Ömər Özcan, Oktay Akbaş, dos. Bahri Atalan və başqaları Xəlil Fikrətin Türkiyədə milli intibahın və maarifçiliyin inkişafındakı xidmətlərini hörmət və ehtiramla yad etmişlər.

**İstifadə edilmiş ədəbiyyat**

1. Necdet Sakaoğlu. Cumhuriyyət Dönemi Egitim Tarihi. İstanbul, 1993. səh. 91-93.

2. Halil Fikrət Kanat yaşamı və hizmetleri. Ankara, 2002.

3. Xəlil Fikrət. Tədris və tərbiyə tarixi. 1-2 hissə. Bakı: Azərşər, 1924, 1926.

4. Xəlil Fikrət. Pestalossi. İstanbul: Devlet matbası, 1931.

5. E.Taşdemirçi. Yüzyıllığın başından günümüze kadar Türkiyede ögretmen yetişdirme sisteminde çağdaş pedaqoji akınlar // Sosyal Bilimler Enstitutusu Dergisi. 1999, № 8.

6. T.Çetin, Ş.Oruc, H.Tokcan. Halil Fikret Kanad və Coğrafiya Egitimi Üçerine bir eseri. Coğrafiyanın tədrisi üsulu// Gazi Egitim Fakültesi Dergisi, cild, 26, sayı 3, 2006, s.1-16.

7. Rüstəmov F. Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri. (1920-1991-ci illər). Bakı, 1998.

8. Rüstəmov F. Pedaqogika tarixi. Bakı: Elm və təhsil, 2010.

9. wikipedia.org.

10. www.halduncezayirlioglu.com.

**Ф.Рустамов**

**Об история развитии Азербайджанско-Турецких научно-педагогических связей**

**Резюме**

Профессор Халил Фикрет (1892-1974), родился в Турции, получил образование в Лейпциге и в Берлинском Университете. В 1923-1926 гг. работал в Бакинском Государственном Университете. Он является автором 15 книг и десятка статей, связанных с теоретическими и практическими проблемами образования, первый учёный, который защитился в Турции в области образования. Он также является автором учебника "История педагогики", который впервые был издан в Азербайджане.

**F.Rustamov**

**From the history of development of scientific-pedagogical relations between Azerbaijan -Turkey**

**Summary**

Professor Khalil Fikret (1892-1974) was born in Turkey. He graduated from Leipzig and University of Berlin and worked at Baku State University in 1923-1926. He was the author of 15 books and dozens of articles related to theoretical and practical problems of education.

He was also the author of textbook "The History of Education" which was published in Azerbaijan for the first time.

# ÜMUMİ TƏHSİLİN İNKİŞAF PERSPEKTİVLƏRİ

**Ənvər Abbasov**
***Təhsil Problemləri İnstitutunun direktor müavini, dosent, əməkdar müəllim***

Azərbaycanın gələcək inkişafı məhz təhsillə bağlıdır.
**İlham Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**

***Açar sözlər:*** *təhsil proqramları, təhsilin informasiyalaşdırılması, İKT bacarıqları, rasionallaşdırma, pedaqoji təfəkkür, 12 illik ümumi təhsil, psixopedaqoji problemlər, məktəbin muxtariyyəti, ümumi təhsilin perspektivləri.*

***Ключевые слова:*** *программы образования, информатизация образования, умения ИКТ, рационализация, педагогическое мышление, 12-летнее общее образование, психопедагогические проблемы, автономия школы, перспективы общего образования.*

***Key words:*** *educational programs, information of education, ICT skills, rationalization, pedagogical thinking, 12-year general education, psycho-pedagogical problems, the autonomy of school, the prospects of general education.*

Müasir Azərbaycanın sosial, iqtisadi, mədəni həyatı durmadan dəyişir, inkişaf edir. Bu dəyişikliklərin mahiyyətini cəmiyyətimizin gələcək uğurlarını təmin edən, onun dünya arenasına çıxmasına imkan yaradan islahatyönümlü tədbirlərin həyata keçirilməsi təşkil edir. Bu tədbirlərin içərisində təhsil özünün rol və əhəmiyyətinə görə aparıcı yerlərdən birini tutur. Mütəxəssislər təhsil hadisəsini “mühüm sosial hadisə”, “sosial fenomen” kimi dəyərləndirməklə onun cəmiyyətin inkişafındakı əvəzedilməz rolunu xüsusi olaraq vurğulayırlar. Müstəqillik illərində Azərbaycanın bütün ictimai, siyasi və iqtisadi həyatında aparılmış islahatyönümlü tədbirləri ümumiləşdirməklə qiymətləndirən və ölkəmizin yaxın zaman üçün irəliləyişlərini müəyyənləşdirən “Azərbaycan – 2020: Gələcəyə baxış” İnkişaf Konsepsiyasında (www. president. az) da təhsilin cəmiyyətin inkişafındakı rolu ayrıca vurğulanır. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 90 illik yubileyinə həsr olunmuş məktəblilərin respublika inşa yazı müsabiqəsi qaliblərinin mükafatlandırılması mərasimindəki çıxışında bu məsələyə xüsusi diqqət yetirərək qeyd edirdi ki, Azərbaycan Respublikası Prezidentinin 2012-ci il 29 dekabr tarixli fərmanı ilə “Azərbaycan–2020: Gələcəyə baxış” İnkişaf Konsepsiyası qəbul olunmuşdur. Təhsil sahəsinin və insan kapitalının inkişafı konsepsiyanın əsas prioritetlərindən biridir. İnanırıq ki, konsepsiya ilə müəyyən olunmuş istiqamətlərdə görüləcək fəaliyyət nəticəsində Azərbaycanda müasir təhsil sisteminin formalaşdırılması uğurla başa çatdırılacaq, milli təhsilimizin dünya və Avropa təhsil məkanına inteqrasiyası güclənəcək, təhsilin keyfiyyəti xeyli yüksələrək ölkəmizin gələcəyinin və dayanıqlı inkişafının əsasını təşkil edəcəkdir [1].

İnkişaf Konsepsiyasında göstərilir ki, “son illərdə ölkəmizin modernləşdirilməsinə istiqamətlənmiş sosial-iqtisadi siyasətlə

təhsil sahəsində əhəmiyyətli nailiyyətlərin əldə olunması da bilavasitə bağlıdır" [2]. Bu bağlılıq onu bir üstqurum hadisəsi kimi insanların, bütövlükdə cəmiyyətin formalaşması baxımından zəruri edir.

Ölkəmizin tarixində təhsil özünün sosial-pedaqoji funksiyasını yerinə yetirməklə həm də zaman-zaman dəyişərək böyük bir inkişaf yolu keçmiş, müasir dövrümüzə qədər gəlib çatmışdır. Müstəqillik dövründə təhsil sahəsində aparılmış islahatlar onun humanist, demokratik, inteqrativ xarakterinin güclənməsilə nəticələnmişdir. Ən başlıcası müstəqil təhsil siyasətinin formalaşması, təhsilin orijinal məzmununun yaradılması istiqamətində işlər aparılmışdır. İnkişaf Konsepsiyasında qeyd olunduğu kimi, "Təhsilin məzmunca yeniləşməsinə istiqamətlənmiş islahat tədbirləri görülmüş, Azərbaycan təhsilinin Avropa təhsil məkanına inteqrasiya istiqamətində əhəmiyyətli addımlar atılmışdır". Ümumi təhsil sahəsində dövri olaraq bir-birini davam və inkişaf etdirən, yeni mahiyyət və məzmun daşıyan sənədlər ("Azərbaycan Respublikasında ümumi orta təhsilin dövlət standartları"(1999), "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu)" (2006), "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" (2010)) hazırlanaraq qəbul edilmişdir. Eyni zamanda, ümumi təhsil fənləri üzrə təhsil proqramları (kurikulumları) hazırlanmışdır. Məzmun standartları, strategiyalar və qiymətləndirmə mexanizmlərindən ibarət olan bu sənədlərdə bilik, bacarıq və vərdişlərə söykənən dəyərlərin, şagird şəxsiyyətinin intellektual xüsusiyyətlərinin, fiziki və mədəni keyfiyyətlərin inkişaf etdirilməsi ön plana çəkilmişdir.

Təhsilin informasiyalaşdırılması da əldə olunan nailiyyətlərdən biri hesab edilir. İnkişaf Konsepsiyasında göstərilir ki, "Təhsilin informasiyalaşdırılması sahəsində əhəmiyyətli nailiyyətlər əldə edilmişdir. 2004-cü ildə hər 1063 şagirdə bir kompyuter düşdüyü halda, hazırda hər 20 şagirdə bir kompyuter nisbəti təmin olunmuşdur". Eyni zamanda, "İnzibati, pedaqoji və texniki heyət əhatə olunmaqla 75 min nəfər müvafiq treninqlərdən keçərək İKT bacarıqlarına yiyələnmişdir".

Bütün bunlarla yanaşı, ümumi təhsil müəssisələrinin maddi-texniki bazasının möhkəmləndirilməsi, yeni məktəb binalarının, siniflərin tikilməsi, köhnə məktəblərin təmir olunması sahəsində görülmüş işlər də islahat dövrünün uğurlarından hesab olunur ki, bu işlər İnkişaf Konsepsiyasında da gələcək fəaliyyətin mühüm istiqamətlərindən biri kimi göstərilir: "Məktəbin tikintisi və əsaslı təmiri sahəsində həyata keçirilən işlər davam etdiriləcək, ümumi təhsil müəssisələrinin şəbəkəsinin rasionallaşdırılması istiqamətində xüsusi proqram hazırlanıb həyata keçiriləcəkdir".

Bütün bunlar ölkəmizin ümumi təhsil sahəsində islahatyönümlü tədbirlər olmaqla müstəqillik dövründə təhsil sahəsində həyata keçirilən, qlobal dünyanın tələblərinə uyğun yerinə yetirilən işlər kimi dəyərləndirilə bilər. Lakin nəzərə alınmalıdır ki, cəmiyyət inkişaf edir, ehtiyac və tələbatlar artdıqca ümumi təhsildə quruculuq işləri də qaçılmaz bir zərurət kimi davam etdirilir. Heç şübhəsiz, Azərbaycan Respublikası Prezidentinin təsdiq etdiyi "Azərbaycan – 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasının yaranması, orada cəmiyyətimizin bütün sahələri, o cümlədən təhsilin bütün pillələri kimi, ümumi təhsillə bağlı perspektivlərin, fəaliyyət istiqamətlərinin müəyyənləşdirilməsi bu zərurətdən irəli gəlir.

Azərbaycan məktəbi ötən əsrin sonlarından başlayaraq özünü yeniləşdirmək istiqamətində fəaliyyət göstərir. Addım-addım əldə olunan bu irəliləyişlərdə yeniliklərlə yanaşı, ənənələrə söykənən fəaliyyətlər də qalmaqda davam edir. Heç şübhəsiz, özünün

humanist funksiyası ilə təhsil tariximizdə, eləcə də praktikada özünə yer tutmuş nəzəri-təcrübi yanaşmalar müsbət dəyərlər kimi ənənəyə çevrilərək yaşayır. Eyni zamanda, yeni pedaqoji innovasiyaların əsasını təşkil etməklə onun yaranmasını və inkişafını stimullaşdırır. Ənənə və novatorluq dilemması qarşısında dayanan məktəb haqqında qənaətlərə görə, "Məktəb bu gün iki yolun ayrıcındadır. Bu yolayrıcı əslində iki pedaqoji sistemi, pedaqoji təfəkkür tərzini və ya üslubunu səciyyələndirir. Müasir psixoloji ədəbiyyatlarda birinci sistem "ənənəvi didaktika" və ya "ənənəvi pedaqoji sistem", ikinci isə "yeni pedaqoji təfəkkür", "müasir təhsil konsepsiyası" kimi səciyyələndirilir. Birinci yol hələ də sıravi müəllimlərin təcrübəsində bu və ya digər formada yaşasa da, əslində bir pedaqoji sistem kimi ömrünü başa vurmuşdur. İkinci yol isə vüsətlə məktəb həyatının bütün sahələrinə nüfuz etməkdədir" [3,3].

Ənənələrə əsaslanaraq intişar tapan, genişlənən yeniliklər bu gün bütövlükdə təhsil həyatımızı, xüsusən də ümumi təhsil sistemini əhatə etməkdədir. Qlobal dünyanın təhsil məkanında baş verən proseslər bu sistemin daha yeni məzmun alması ilə yanaşı, həm də onun sürətlə yerinə yetirilməsini tələb edir. İnformasiyalı cəmiyyətin formalaşdığı, informatlaşdırma prosesinin geniş miqyas aldığı qlobal zaman çərçivəsində məktəbdə struktur dəyişikliklərinin aparılması zərurəti yaranır. Elə bu səbəbdən də ölkə miqyasında ümumi təhsilin struktur dəyişiklikləri nəzərdə tutulur. İnkişaf Konsepsiyasında ona xüsusi diqqət yetirilir: "12 illik ümumi təhsil sisteminə keçid təmin ediləcək".

Məlum olduğu kimi, dünyanın inkişaf etmiş ölkələrinin təhsil sistemində 12 illik ümumi təhsillə bağlı böyük təcrübə vardır. Həmin ölkələrdə və böyük iqtisadi sosial və mədəni nailiyyətlərin qazanılmasında 12 illik ümumi təhsil təcrübəsinin rolu şübhəsizdir. Bu mənada ölkəmizdə 12 illik ümumi təhsilə keçilməsi barədə fikirlər əhəmiyyətli müddəalar kimi dəyərləndirilir.

12 illik ümumi təhsilə keçid həm də dünya təhsilində qloballaşmadan irəli gələn unifikasiya prosesinin tələbi kimi başa düşülməlidir. Bu prosesdə dünya ölkələrinin ümumi təhsil sistemində struktur uyğunluğu yaradılmaqla səmərəli əlaqə və mübadilələrin qurulmasına imkan yaranır. Bu, ümumi təhsilin təşkili, idarə olunması, qarşılıqlı faydalanma istiqamətində fəaliyyətlərin qurulmasını stimullaşdırır.

Müasir zaman özünün bol informasiyalarının fonunda zəngin görünməklə yanaşı, çox sayda texnologiyaları ilə xarakterizə olunur. Bu şərait isə müxtəlif informasiyalar və texnologiyalarla davranmağı bacaran, yüksək intellektə sahib olan insanların formalaşdırılmasını tələb edir. Belə bir tələbin yerinə yetirilməsində ümumtəhsil məktəbi daha böyük bir missiya daşıyır. Məktəbin psixopedaqoji problemlərini araşdıran görkəmli psixoloq-alim prof. Əbdül Əlizadənin gəldiyi qənaətlərə görə, "XXI yüzillik ağılın, intellektin təntənəsi əsridir. Müstəqillik yoluna çıxmış respublikamızın milli mənafeyi Azərbaycan məktəbinin, ilk növbədə, məhz ağıl, intellekt ocağı olmasını tələb edir"[3].

Məktəb müasir şəraitdə yalnız informasiya, bilik verməklə öz işini tamamlaya bilməz. Hazır bilik və bacarıqları öyrənməklə şagirdlər yalnız yaddaşın potensial imkanlarını genişləndirmiş olurlar. Əslində isə cəmiyyət axtarışlar aparmağı, yaradıcı fəaliyyət göstərməyi bacaran insanlar kimi onları qarşılamaqla özünün tələblərini irəli sürür. Bunun üçün ümumtəhsil məktəblərində şagirdlərin intellektual səviyyəsini, yaradıcılıq qabiliyyətini inkişaf etdirmək prioritet məsələ kimi qarşıya qoyulur. İnkişaf Konsepsiyasında da bu məsələ ümumi təhsilin mü-

hüm inkişaf istiqamətlərindən biri kimi nəzərdə tutulur. Göstərilir ki, "Şagirdlərin fəallığını, ümumi inkişafı ləngidən mövcud "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktəbi"nə keçidin təmin olunması məqsədilə sistemli tədbirlər həyata keçiriləcəkdir".

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, bu mühüm vəzifənin həyata keçirilməsi üçün islahat dövründə hazırlıq işləri aparılmış, müvafiq hüquqi baza yaradılmışdır. İlkin olaraq "Təhsil haqqında" Azərbaycan Respublikasının qanununda ümumi təhsilin bu baxımdan rolu və funksiyası müəyyən olunmuşdur: "Ümumi təhsil təhsilalanların fiziki və intellektual inkişafına, zəruri biliklərə yiyənlənməsinə, onlarda sağlam həyat tərzinin və sivil dəyərlərə əsaslanan vətəndaş təfəkkürünün formalaşmasına, milli və dünyəvi dəyərlərə hörmət hissinin aşılanmasına ailə, cəmiyyət, dövlət və ətraf mühit qarşısında hüquq və vəzifələrinin müəyyən edilməsinə imkan yaradır" [5]. Eyni zamanda, ümumi təhsilin məzmununa qoyulan tələblərdə də bilavasitə bu məsələ diqqət mərkəzində saxlanılmış, təhsilalanların hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi həyata hazırlanmasının zəruriliyi mühüm tələb kimi belə müəyyən olunmuşdur: "Ümumi təhsilin məzmunu təhsilalanların yaş, fizioloji, psixoloji xüsusiyyətləri nəzərə alınmaqla, onların dünyagörüşünün və şəxsiyyətin formalaşmasını, bazar münasibətlərinin tələblərinə uyğun zəruri bilik və bacarıqlara yiyələnməsini, əqli, fiziki, mənəvi, estetik inkişafını, müstəqil əmək və təhsil həyatına hazırlanmasını, cəmiyyətin faydalı və məhsuldar üzvünə çevrilməsini təmin edir" [6,7].

Eləcə də hər bir fənn üzrə təhsil proqramları (kurikulumları) hazırlanarkən, birinci növbədə, onların mahiyyət etibarı ilə şəxsiyyətyönümlü və şagirdyönümlü xarakter daşıması bu məsələnin məqsəd və vəzifələrdə, eləcə də məzmunda (standartlarda) və strategiyalarda (texnologiyalarda) öz əksini tapması vacib tələb kimi gözlənilmişdir. Standartlarda şagirdlər üçün müəyyən olunmuş idraki (koqnitiv), hissi və psixomotor keyfiyyətlər ifadə edilmişdir. Bu standartlar hər hansı təhsil pilləsi və səviyyəsinə aid olmaqla şagirdlərin ümumi inkişafını izləməyə və dəyərləndirməyə imkan verir. Standartlarda şagirdlərin öyrənmək, müşahidələr aparmaq, ümumiləşdirmək, sistemə salmaq, qruplaşdırmaq, analiz-sintez etmək, təqdimatlar hazırlamaqla özünün və təmsil etdiyi qrupun fəaliyyətini nümayiş etdirmək, yaradıcı fəaliyyət göstərmək və nəticələri ümumiləşdirmək kimi təfəkkür fəaliyyətinə söykənən intellektual keyfiyyətlər ifadə edilir.

İnkişaf Konsepsiyasından irəli gələn vəzifə kimi, məktəbin struktur dəyişikliklərinə aid tədbirlərin həyata keçirilməsi faydalı hesab edilir. Bu zaman inteqrasiya prinsipinə istinad olunmaqla fənlərin nəzərdən keçirilməsi, xüsusən icbari təhsil səviyyələrində müvafiq fənlərin (Azərbaycan dili, ədəbiyyat; kimya, fizika, biologiya və s.) birləşdirilməsinə və bunların əsasında inteqrativ məzmunun yaradılmasına yönəlmiş tədbirlər həyata keçirilə bilər.

Düşüncə və təfəkkür məktəbinə keçidin təmin olunmasının bir mühüm şərti də intellektual dərsliklərin yaradılmasıdır. Şagirdləri düşünməyə, axtarmağa sövq edən belə dərsliklərin nəzəri və praktik cəhətdən reallaşdırılması üçün bu sahədə dünyada mövcud olan təcrübənin öyrənilməsi ilə yanaşı, ölkəmizdə bu problemin həll olunması məqsədilə psixopedaqoji, fənlərin tədrisi metodikası üzrə araşdırmalar aparılmalı, intellektual dərslik nümunələrinin hazırlanaraq eksperimentdən keçirilməsi və ölkəmizin məktəblərində istifadə olunmasına dair həlledici addımlar atılmalıdır. Belə dərsliklə işləmək üçün müəllimlərə kömək məqsədilə müvafiq tövsiyələrin yazılması, eləcə də

müəllim hazırlığında həmin işlərin nəzərə alınması bu istiqamətdə yerinə yetirilən tədbirlərdən biri kimi dəyərləndirilə bilər.

Bu gün hələ də qalmaqda olan məktəbin muxtariyyəti məsələsinin həll edilməsi, onun iqtisadi, nəzarət işlərində müstəqilliyinin təmin olunması düşüncə məktəbinin yaradılması prosesini sürətləndirə bilən vasitələrdən biri hesab edilir. Məktəblərin şagirdbaşına maliyyələşdirilməsi onun daha keyfiyyətli işləmək imkanlarını genişləndirməklə rentabelliliyinə təsir göstərə bilər.

Düşüncə məktəbinin yaradılması onun təlim, dərs sisteminin də yenidən qurulmasını tələb edir. Yeri gəlmişkən qeyd etmək lazımdır ki, bu, məktəb islahatlarının ən çox əhəmiyyət daşıyan və öyrənmə işinin nüvəsini təşkil edən bir problemdir. Yaxşı haldır ki, son dövrlərdə dərs, onun mahiyyəti, məzmunu, quruluşu və sair məsələlərlə bağlı çoxlu məqalələr yazılır, nümunələr hazırlanaraq çap olunur. Lakin təəssüflə qeyd etmək lazımdır ki, bu yazılar epizodik xarakter daşımaqla, daha çox subyektiv mülahizələrə söykənir. Ciddi nəzəri-pedaqoji araşdırmalara əsaslanmır. Ən başlıcası isə ondan ibarətdir ki, inzibati amirlik dövründən qalan dərsin standartlaşması tendensiyası hələ də davam etməkdədir.

Dərs strateji bir vasitədir, texnologiyadır. Eyni zamanda, yaradıcı xarakterə malik olan bir öyrənmə prosesidir. Bu gün şagirdləri öyrənməyə cəlb edən hər bir dərs o zaman intellektual imkanları ilə əhəmiyyət kəsb edəcəkdir ki, demokratik prinsiplərlə qurulacaq, qeyri-standart xarakter daşıyacaqdır.

İlkin araşdırmalara əsasən onu demək mümkündür ki, inteqrativ xarakter daşıyan intellektual dərslərin müddəti, vaxt, zaman ölçüləri onun mühüm parametrlərindən biridir. Bu mənada hazırkı bir akademik saat çərçivəsində reallaşdırılan dərslərin müddətinə yenidən baxmaq təlim prosesinin təkmilləşdirilməsi istiqamətində əhəmiyyətli tədbirlərdən sayıla bilər.

Bu gün ən mühüm problemlərdən biri də müəllim və şagirdlər üçün tədris və təlim resurslarının az olmasıdır. Düşüncə məktəbinin yaradılmasında müəllim və şagirdlərin yaradıcı fəaliyyətinin təmin olunması vacib tələblərdəndir. Fikrimizcə, təhsil prosesində standartların tələbinə uyğun müxtəlif resursların çox olması istifadəçiləri seçim qarşısında qoymaqla onları düşünməyə, istifadə edəcəkləri materiallara yaradıcı yanaşmağa təşviq edər. Bu, təhsilin demokratik xarakterindən irəli gələn bir cəhət kimi özünü göstərməklə müəllim və şagirdlərin yaradıcılıq imkanlarını genişləndirər, onların daha səmərəli fəaliyyətinə şərait yaradar. Bütün bunlar isə ölkədə təhsil üzrə resurs mərkəzinin yaradılmasına ehtiyacın olduğunu göstərir.

İnkişaf Konsepsiyasında ümumi təhsilin perspektivləri ilə bağlı mühüm məsələlərdən biri onun təmayüllər üzrə qurulmasıdır. Sənəddə göstərilir ki, "Tam orta təhsil səviyyəsində təhsil təmayüllər üzrə təşkil olunacaq, istedadlı uşaqlar üçün inkişafetdirici fərdi proqramlar yaradılacaqdır".

İstedadlı uşaqlarla iş Azərbaycanda ümumdövlət əhəmiyyətli problemdir. Müstəqil Azərbaycanın Konstitusiyası hazırlanarkən ona ölkənin təhsil siyasətinin aparıcı istiqamətlərindən biri kimi xüsusi dəyər verilmiş, bu barədə belə bir müddəa qəbul olunmuşdur: "Maddi vəziyyətindən asılı olmayaraq istedadlı şəxslərin təhsili davam etdirməsinə dövlət zəmanət verir" [7]. Həmin siyasət Təhsil Qanununda da inkişaf etdirilərək konkretləşdirilmişdir: "Dövlət maddi vəziyyətindən asılı olmayaraq istedadlı şəxslərin təhsilini davam etdirməsinə təminat verir, sosial müdafiəyə ehtiyacı olanların təhsil almasına şərait yaradır" [8]. Bu müddəalar təhsilin bütün pillələrinə, o

cümlədən də ümumi təhsilə aid olmaqla hər bir istedadlı şəxsin inkişaf etməsinin hüquqi təminatçısı kimi çıxış edir.

Təbii olaraq bu hüquqi baza əsasında istedadlılarla iş Respublikamızın təhsil siyasətinin aparıcı istiqamətlərindən biri kimi öz ifadəsini ölkə miqyasında qəbul olunmuş İnkişaf Konsepsiyasında da tapmışdır. Bu problemin həll olunmasında təhsilin infrastrukturunun dəyişilməsi, xüsusən icbari təhsildən sonra ümumi təhsilin təmayüllər üzrə qurulması vacib məqamlardandır. Bu məsələ hazırda "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" [9], "Ümumtəhsil məktəbinin Nümunəvi Nizamnaməsi" [10] sənədlərində yer tutmaqdadır. Əslində bu dəyişiklik ümumi təhsilin bütün təlim, tərbiyə, eləcə də idarəetmə mexanizmlərinin yenidən qurulması ilə reallaşdırılacaqdır. Bu zaman ümumi təhsilin səviyyələri üzrə maddi-texniki və eləcə də tədris bazasının nəzərdə tutulmuş təhsil siyasətinə uyğunlaşdırılması diqqət mərkəzində saxlananılacaqdır. Heç şübhəsiz, ümumi təhsilin infrastruktur dəyişikliyi həm də analoji olaraq kadr potensialının möhkəmləndirilməsi və ondan istifadə edilməsi prosesi ilə birgə həyata keçiriləcəkdir. Ona görə də ilkin mərhələdə ümumi təhsilin infrastruktur dəyişikliklərinin xəritəsini hazırlamaq, onun planlı və sistemli olaraq həyata keçirilməsinin mühüm şərtlərindən biri kimi faydalı hesab edilir.

Cəmiyyətimiz inkişaf edir. Hamı üçün bərabər təhsil şəraitinin yaradılması ümumi təhsil siyasətinin mühüm parametrlərindən biri kimi diqqət mərkəzində saxlanılır. Çünki hər zaman olduğu kimi, bu gün də cəmiyyət insanların sağlamlıq imkanlarının müxtəlifliyi baxımından özünəməxsusluğu ilə diqqəti cəlb edir. Humanist və demokratik prinsiplər bilavasitə təhsildə bu vəziyyətin nəzərə alınmasını, vəziyyətindən asılı olmayaraq bütün uşaqların ictimai mühitə adaptasiya olunmaqla sosiallaşmasını zəruri tələb kimi qarşıya qoyur. İnkişaf Konsepsiyasında "Eyni zamanda xüsusi qayğıya ehtiyacı olan, sağlamlıq imkanları məhdud uşaqlar üçün müxtəlif inkişafetdirici, korreksiyaedici və inklüziv təhsil proqramları tətbiq ediləcəkdir" müddəasının qəbul olunması da məhz bu tələblərdən irəli gəlməklə ümumi təhsilin perspektiv istiqamətlərindən birini təşkil edir.

Qlobal dünyanın mühüm problemlərindən biri də məlumatları müxtəlif bloklarda, mənbələrdə ümumiləşdirməklə informatlaşma prosesini həyata keçirməkdən ibarətdir. Bu, informasiyaların çoxaldığı və inkişafın sürətləndiyi hazırkı dövrdə son dərəcə vacib olan tələblərdən biri hesab edilir. Xüsusilə təhsildə informasiyaların çevik və mütəhərrik xarakterdə olması onun elektron təhsil texnologiyalarından istifadə edilməklə nisbətən qeyri-stabil formada təqdim olunmasını zəruri tələb kimi qarşıya qoyur. Artıq bu məsələ ilə bağlı Respublikamızda müəyyən addımlar atılmış, bəzi fənlər üzrə elektron tədris vəsaitlərinə dair nümunələr hazırlanmışdır. Bu işlər, heç şübhəsiz, gələcəkdə də davam etdiriləcəkdir. İnkişaf Konsepsiyasında qeyd olunduğu kimi, "Elektron təhsil texnologiyalarının tətbiqi əhəmiyyətli şəkildə genişləndiriləcəkdir". İstər təlim, istər tədris, istər idarəetmə, istərsə də qiymətləndirmə üzrə elektron təhsil texnologiyalarının hazırlanması sahəsində tədbirlər həyata keçiriləcəkdir.

Biz bu məqalədə "Azərbaycan – 2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyasından irəli gələn vəzifə kimi ümumi təhsilin perspektivlərinə dair bəzi məqamlardan söhbət açdıq. Bu mülahizələri genişləndirmək də olardı. Lakin əsas vəzifə bu problemləri aydınlığı ilə dərk etməkdən və onların həyata keçirilməsi istiqamətində qətiyyətlə addımlamaqdan ibarətdir.

**İstifadə edilmiş ədəbiyyat**


1. http: //www.muallim.edu.az/arxiv/-2013/17/06.htm
2. "Azərbaycan-2020: Gələcəyə baxış" İnkişaf Konsepsiyası. www. president. az. 29.XlI. 2012.
3. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004.
4. Mehrabov A. Müasir təhsilin konseptual problemləri. Bakı: Mütərcim, 2010.
5. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu. Bakı: "Hüquq ədəbiyyatı", 2009.
6. Azərbaycan Respublikasında ümumi orta təhsilin dövlət standartları. "Azərbaycan Respublikası məktəblərinin təhsil standartları". Bakı, 2010.
7. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Qanun, 2005.
8. Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları). // Kurikulum, 2010, № 3.
9. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu). // Kurikulum, 2008, № 1.
10. Ümumtəhsil məktəbinin Nümunəvi Nizamnaməsi. Təhsil qanunvericiliyinə dair normativ-hüquqi sənədlər toplusu (ll cild). Bakı: Şərq-Qərb, 2012.


**А.Аббасов**

**Перспективы обшего образования**

**Резюме**

В концепции развития "Азербайджан – 2020: взгляд в будущее" отдельно оценивается роль образования в развитии общества, подчеркивается, что "в последние годы значительные успехи в области образования связаны с социально-экономической политикой, направленной на модернизацию нашей Республики". Эта непосредственная связь между ними важная необходимость, надстройка событий с точки зрения формирования человечества, в целом общества. В статье, в контексте концепции развития, исследованы проблемы и даны определенные рекомендации по содержанию общего образования, информатизации, укреплению материально-технической базы, формированию нового педагогического мышления, переходу к двенадцатилетней общей системе образования, оцениванию успехов учащихся, организации профильного учебно-образовательного процесса в полном среднем образовании, применению программ инклюзивного образования.

**A.Abbasov**

**Perspectives of general education**

**Summary**

The concept of "Azerbaijan – 2020: A Look into the Future" is separately evaluated as the role of education in the society. It is pointed out significant educational achievements are associated with social and economic policies in the recent years.

In the article specific recommendations on the content of general education, information strengthening material-technical base, formation of new pedagogical thinking, transition to a twelve-year general education, assessment, teaching and organization of educational process and the use of inclusive education programs are also investigated.

* 3

***Təhsil islahatı fəaliyyətdədir***

# ALİ TƏHSİLDƏ YENİ YANAŞMALAR

**Cəsarət Valehov**
***filologiya üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *akademik qloballaşma, multidisipilnar təhsil, transformasiyalar, ömürboyu təhsil, şəbəkələşmə kriteriyası.*

***Ключевые словы:*** *академическая глобализация, мультидисциплинарное образование, трансформации, обучение на протяжении всей жизни, сетевые критерии.*

***Key words:*** *academic globalization, multidisciplinary education, transformations, lifelong education, networking criterion.*

Müasir universitetlərdə akademik qloballaşma ali təhsilin məzmununu da yeni trendlərə uyğun dəyişir. Universitetlər təkcə diplomları ilə tanınmamalı, həm də insanlara sərhədləri aşmağı öyrətməlidir. Yeni gerçəklik ali təhsil məkanının qaynaqlarını səfərbər etməyə təşviq edir. Ali təhsilin beynəlxalq miqyası haqqında araşdırmalar qloballaşma və dünya çapında rəqabətin artması ilə öz coğrafiyasını daha da genişləndirmişdir. Universitetlərin dəyərləndirilməsində kəmiyyət amilinin deyil, keyfiyyətin önə çıxması düşüncəsi hakim olmuşdur. Buna görə də, ali təhsilin gələcəyi haqqında düşüncələr bu günün meyillərini formalaşdırmaqda çox güclü təsirə malikdir.

Bu gün dünyada 150 milyondan çox universitet tələbəsi var. Təxminən 3 milyondan çox tələbə öz ölkələrindən kənarda təhsil alırlar. İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatına üzv ölkələrində təxminən 7% xarici tələbə təhsil alır.

Müasir Avropa ali təhsil kriteriyalarına görə, 2020-ciilədək Bolonyaya qoşulmuş ölkələrin tələbələrinin 20%-i ən azı bir semestr ərzində xaricdə təhsil almalıdır. Bu yanaşmada hələki Azərbaycana gələn (3,3 milyon/1000 nəfər) və ölkəmizdən xaricə gedən tələbə sayına (3,3 milyon /təxminən 1000 nəfər) görə, tələbə mobilliyi nisbətində qapalı ölkələr sisteminə aidik.

Dünya universitetləri sıralanmasında ilk beşlikdə yer alan ABŞ-ın MİT-si dünyada təhsil, araşdırma və innovasiyalara verdiyi töhfələrə görə örnəkdir. 1861-ci ildə qurulan bu universitet ABŞ-da sənayeləşməni sürətləndirmişdir. MİT tələbəsinə təşəbbüskar olmaq dəyərlərini öyrədir ki, nəticədə bu universitet məzunlarının qurduqları və dövriyyəsi 2 trilyon dollar olan 25 800 şirkətdə 3,3 milyon insan çalışır. Nobel mükafatını qazanan elm adamlarını ən çox əməkdaşlığa cəlb edə bilmiş bu universitet akademik jurnallarda istinad edilmiş mənbələrə görə liderdir. Universitetdə doktorluq tədqiqatları aparanların-kompyuter və iqtisadiyyat üzrə 65%, fizika üzrə 56%, riyaziyyat üzrə isə 55%-i əcnəbidir. MİT daha çox araşdırma universiteti kimi fəaliyyət göstərir. Bunun da nəticəsində yeni araşdırma mövzuları universitetin əsas gəlir qaynaqlarını təmin edir. Məsələn, yeni enerji qaynaqları ilə bağlı araşdırma aparmaq üçün MİT, ENİ və ABB şirkətlərindən 300 milyon dollar dəyərində maliyyə vəsaiti əldə etmişdir.

Müasir dünyada universitetlərin 3 əsas fəaliyyət sahəsi vardır: təlim-tədris, araşdırma-inkişaf və xidmət. Müasir universitet pa-

radiqması ali təhsil müəssisələrinin öz maliyyə və intellektual qaynaqlarını əldə edə bilən, nəşrləri, istinad olunma faizi, beynəlxalq tələbə və müəllim əməkdaşlığı imkanları, məzunların iş tapa bilmə nisbəti və layihələrdə çalışmaq miqyası ilə şərtlənir. Məsələn, haqqında söylədiyimiz MİT Çində şəhər planlaşdırması, Hindistanda yoxsulluğun aradan qaldırılması layihələrində iştirak edir. Deməli, qlobal universitet fəlsəfəsi dünyanı bütöv fəaliyyət sahəsi kimi görür. Universitetin əsas amacı da insanlara sərhədləri aşmağı, təşəbbüskar olmağı öyrətməkdir. Bunun üçün də aşağıda qeyd olunan bir sıra məqamlar nəzərə alınmalıdır:

• Yerli və milli olmaqdan qlobal və rəqabət edən olmağa keçid. Bunun üçün təhsil kriteriyaları və kurikulumları dəyişməlidir;

• Tələbə mobilliyi və beynəlxalq akademik proqramlarda iştirak edə bilən müəllim heyətinin olması, uzaqdan təhsilə üstünlük verilməsi;

• Bürokratik universitet idarəçiliyi şəffaflaşmalı, tələbə təşəbbüslərinə imkan verilməlidir;

• Çoxdilli tədris, tədqiqat mühiti yaradılmalı, multimedia tədris vasitələrinin coğrafiyası genişlənməlidir.

II Dünya müharibəsinədək ali təhsil elitar mahiyyət daşıdığından çox az insan bu statusa sahib ola bilərdi. Xüsusilə də, ali təhsildən sonrakı elmi araşdırma istiqaməti XX əsrin ikinci yarısından sonra daha çox dövriyyəyə gəlməyə başladı. Universitetlərin bu missiyası daha çox dövlətlərin aktivində olduğundan ali təhsil mühiti dövlətin müəyyənləşdirdiyi miqyasla sərhədlənirdi. Ancaq bir çox ölkələrdə bu təcrübə başqa mizanlarla qurulurdu. Məsələn, götürək ABŞ universitetlərini. Bu universitetlər daha çox bazar yönümlüdür və dəyişən tələblərə çox sürətli reaksiya verirlər. Dövlət nəzarəti və dəstəyi getdikcə azalan ABŞ universitetləri maliyyəni daha çox onlara araşdırma məqsədi ilə verilən qaynaqlardan əldə edirlər. Məsələn, 1985-ci ildə Virciniya universiteti maliyyəsinin 28%-ni dövlətdən alırdısa, 2004-cü ildə bu nisbət 8%-ə düşmüşdür. Bu universitet maliyyə qaynaqlarını təhsil sənaye işbirliyindən qazanmışdır. Ancaq bu tendensiya Avropa universitetlərində fərqlidir. Burada universitetlərə dövlət dəstəyi 80%, digər gəlir qaynağı isə tələbə ödənişləri hesabınadır.

Birləşmiş Ştatlarda universitetləri ancaq millətin varlı qisminin getdiyi yerlər kimi təsis etməmişlər. Müqayisə üçün qeyd edək ki, burada universitetdə oxuyan tələbələrin $^{1}/_{4}$ yoxsul ailələrdən gələnlər təşkil edirlər. Oxuyan tələbələrin 80%-i təhsil müddətində əmək fəaliyyəti ilə məşğul olurlar. Başqa bir fakt, dünyanın ən yaxşı universitetlərindən biri sayılan Harvard ildə 40000 ABŞ dollar gəliri olan ailələrə məxsus tələbələrdən ödəniş almır.

Bununla bərabər, dünyada diplomdan sonrakı təhsil alan mütəxəssislərə ehtiyac artmışdır. Məsələn, ABŞ-da 2005-2009-cu illərdə 100.000 doktorluq diplomu verilmişdir. Eyni zaman müddətində ABŞ–da 16.000 professor elmi adı qazanılmışdır. Doğrudur, qərb dünyasında daha çox doktorluq alan insanlar əcnəbilərdir. Bu da onunla bağlıdır ki, başqa ölkələrdən gələn elm adamları daha ucuz əməkhaqqı ilə daha parlaq nailiyyətlər qazanırlar.

Ali təhsildə transdisiplinar yanaşma

Hər bir mədəniyyət özünəməxsus təhsil sistemini yaradır. Bu gün gələcəyin təhsil viziyonunun transdisiplinar formada yenidən biçimlənməsi əsas müzakirə formatlarındandır. Onu da qeyd edək ki, transdisiplinar metod interdisiplinar və multidisiplinar formalardan fərqli olaraq, bir fəndən digərinə keçiddə daha elastikdir. Əgər öyrənilən fənlərin sayı 1300-cü ildə 7, 1950-ci ildə 54, 1975-ci ildə 1845 idisə, müasir dövrdə bu

sayın 8000-dən çox olması transdisiplinar metodun əhəmiyyətini ön plana çıxarır. Bundan başqa, fərdlərin həyatboyu bir çox peşələrə yiyələnməsi və ixtisaslarını dəyişmə zərurəti transdisiplinar metodun əhəmiyyətini artıran digər alt səbəblərdən biridir. Müasir dövrdə təhsil əmək bazarında tələb olunan bilik və bacarıqların aşılanması ilə bərabər, insanın gələcək həyata və cəmiyyətə inteqrasiyasına hərtərəfli hazırlığı kimi vəzifələrin də öhdəsindən gəlməlidir. İnsanın ömürboyu təhsil almaq tələbatının ödənilməsi isə təhsilin sosial həyatda rolunu yüksəldən amillərdən ən başlıcasıdır. Müasir texnoloji inkişaf bilik, bacarıq və vərdişlərin müntəzəm yenilənməsini tələb edir. Nəzərə alaq ki, hər 5-7 ildən bir peşə və ixtisasların 40-50 faizi öz əhəmiyyətini itirir, onlar yeniləri ilə əvəz olunur. Empirik araşdırmalar göstərir ki, tələbələr əmək fəaliyyəti boyu orta hesabla 3-5 dəfə ixtisaslarını dəyişməli olurlar (1).

Buradan gəlinən nəticə odur ki, XXI əsrin universiteti insanları öz ixtisaslarını daim təkmilləşdirməyə yön verməlidir. Bunu doğuran hipotezlərdən başlıcası budur ki, biliklər cəmiyyətində sadəcə olaraq universitet məzunu olmaq yetərli deyildir. Formal, informal təhsilin təşviq edilməsi, problem həll edə bilən, gerçək dünya problemlərinə yanaşmada daha doğru həllər ortaya qoymaq bacarıqları yeni əsrin universitet məzununu transdisiplinar zehniyyətə kökləyir.

Azərbaycanda ali təhsilin davamlı olaraq keyfiyyətinin artması universitetlərin üzərinə ciddi öhdəliklər qoyur. Burada həmçinin Azərbaycan üçün demoqrafik imkanların üstün olması amili də vardır. Azərbaycan Respublikasının əhalisinin 66 faizini 35 yaşınadək gənclərin təşkil etməsi ali təhsilin üzərinə yeni strateji vəzifələr qoyur. Onu da nəzərə alsaq ki, bu cür demoqrafik üstünlük 2020-ci ildən sonra mənfi trendlə izlənməyə başlanacaq, o zaman Azərbaycanın 2020 hədəflərinə doğru irəliləməsi sürətləndirilməlidir. Onda təhsilin məzmun, idarəetmə, keyfiyyət və əhatə olunma arealında yeni dəyişikliklərin olunması qaçılmazdır. Bu yanaşmada təhsilin inkişafı üzrə dövlət strategiyasında qeyd olunduğu kimi nəzərə alınmalıdır ki, hazırda ali təhsilli məzunların bilikləri bir çox hallarda iqtisadiyyatın tələbatları ilə uzlaşmır, çünki müxtəlif ixtisaslara olan tələbatlar arasında disproporsiyalar mövcuddur. 2009-2010-cu tədris ilində Azərbaycanın ali məktəblərində təhsil alan 139 min tələbədən yalnız 0,3%-i kənd təsərrüfatı ixtisaslarına yiyələnmişdir. Ali təhsilli mütəxəssislər əsasən dövlət sektorunda cəmləşib (25-34 yaşında olanların 67%-i). Özəl sektorun 50%-də ixtisaslı işçi qüvvəsinin çatışmazlığı problemi yaranıb. Araşdırmalar və təhlillər göstərir ki, ən böyük kadr və bacarıq çatışmazlığı xidmət sektorunda və kənd təsərrüfatında müşahidə olunur.

Təhsilin inkişafı üzrə Dövlət strategiyasında qeyd olunduğu kimi, hər 100 min nəfərə düşən ali məktəb tələbələrinin sayına görə Azərbaycanın göstəriciləri inkşaf etmiş ölkələrin səviyyəsinə çatmalıdır. Bunun üçün də regionlar arasında təhsilə, xüsusilə də ali təhsilə çıxış imkanları genişləndirilməlidir. Ali məktəblərin əksəriyyətində əmək bazarının dinamik tələbatına, müasir standartlara uyğun kurikulumların hazırlanması potensialı aşağı səviyyədədir. Təhsilin effektiv idarə olunması üçün informasiya sistemi yaradılsa da, onun inkişaf etdirilməsi daha zəruridir. Təhsilin keyfiyyətinin idarə olunması üçün müvafiq monitorinq, keyfiyyət və fəaliyyət göstəriciləri sisteminin də inkişaf etdirilməsinə ehtiyac vardır. Təhsilin maliyyələşdirilməsi mexanizmlərinin yenidən qurulması zərurəti də zamanın tələbidir. Maliyyələşmə mexanizmləri təhsil sistemində rəqabət mühitinin inkişafını dəstəkləmə-

lidir. Bunun üçün təhsilin bütün pillələrində adambaşına maliyyələşdirmə prinsipinin tətbiqi, kompetensiya və fəaliyyət əsaslı əmək ödənişi sistemlərinin yaradılması, maliyyələşdirmənin tədrisin keyfiyyət nəticələrinə bağlanması vacibdir. Ölkənin modernləşdirilməsi üçün zəruri olan insan kapitalını inkişaf etdirmək və bununla Azərbaycanın beynəlxalq rəqabət qabiliyyətini yüksəltmək keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında aparıcı mövqe tutan, müasir kompetensiyalara yiyələnmiş müəllim və menecerlərə, qabaqcıl texnologiyalara əsaslanan infrastruktura malik təhsil sisteminin yaradılmasını tələb edir. Bütün bunlar Azərbaycan təhsilinin qarşısında qoyulan strateji məsələlərdir.

Təşəbbüskarlıq XXI əsrdə təhsilin və sosial- iqtisadi inkişafın əsas güc qaynağıdır. Təşəbbüskar insanlar xüsusilə təhsildə yeni inkişaf paradiqmasının öncülləri olaraq yüksək rəqabət mühitində əmək bazarının şərtlərinə uyğun olaraq təhsil kurikulumlarını müəyyən edirlər.

Yeni universitet gerçəkliyi dövlət dəstəyi və nəzarətinin getdikcə azalması ilə ifadə olunan müasir universitet düşüncəsinə görə, akademik qloballaşma və şəbəkələşmə daha çox ehtiva olunur. Müasir dünyada problemlər ölkələrin sərhədlərini aşdığından, öncə qeyd etdiyimiz kimi, universitetlər də insanlara sərhədləri aşmağı öyrətməlidir. Universitetlərin vəzifələri və öhdəlikləri daha geniş sahələri əhatə etməli və yenidən dəyərləndirilməli və bu missiya qlobal çağırış olaraq nəzərdən keçirilməlidir. Əgər biz sosial həyata baxsaq, onu aydın görərik ki, ötən əsrin əvvəlləri ilə bu əsrin müvafiq dövrünü müqayisə etsək, bir neçə başlıca fərq ortaya çıxar. Məsələn, bu fərq nəticəsində görə bilərik ki, insanlar artıq gəlirlərinin çoxunu daxili məişət tələbatı üçün xərcləmirlər. Peşə fəaliyyətində olan insanların təhsil səviyyələri yüksəlmiş, istək və zövqlər dəyişmişdir. Bu yanaşmada universitet viziyonu da dəyişmişdir. Qloballaşma və rəqabət mühitində universitetlər dünyaya açılma strategiyalarını zamanın şərtlərinə uyğun qurmağa başlamışlar. Ümumiyyətlə, universitetlər cəmiyyətin inkişafının müxtəlif dövrlərində öz ideallarının realizə olunmasında mühüm rol oynamışlar. Məşhur tədqiqatçı Stiv Fuller bu ideal nədir? sualına belə cavab verir: “Cəmiyyətin rifahı naminə biliklərin universallaşması amilidir” (2).

Doğrudur, Fullerin də gəldiyi qənaət bu oldu ki, XVIII əsrin fransız maarifçiləri Volter, Didro, Russo universitetin funksiyasına aid olan təlim və tədqiqatın müxtəlif institutlara verilməsini istəyirdilər. Qeyd olunan ideyanı sonralar Napoleon həyata keçirdi və bunu Fransanın akademik mühitində antiuniversitet dalğası adlandıraraq Jan Fransua Liotarın xarakterizə etdiyi kimi “postmodernizm şərti” deyərək təsnif etdilər.

Ancaq XX əsrdə universitetlərin qarşısında duran tələblər dəyişərək yeni paradiqmaların yaranmasına səbəb oldu. Xüsusilə də, XX əsrin II yarısından etibarən, daxilində böyük potensialı, ehtimalları daşıyan çoxölçülü, mürəkkəb bir gerçəklik və bilik anlayışı hakim olmağa başlamışdır. Bu vəziyyət biliyin, anlamanın, düşünmənin mürəkkəb təbiətini üzə çıxardır. Nəticədə ali təhsildə yeni paradiqma dəyişikliyinin meydana çıxması üçün zəmin yaranır. Bu çərçivədə ali təhsildə biliklərə sahib məzunlar qədər, mürəkkəb vəziyyətləri, fərqlilikləri idarə edə bilən, çoxlu ehtimalları araşdıra bilən, sürəkli öyrənən insan resurslarının da yetişdirilməsi əhəmiyyətlidir. Deveyin təbirincə desək, ali təhsildə informasiya, bilik əldə etmə, öyrənmə yerinə, daha dinamik və dəyişikliyə açıq bir yanaşma ilə həyatboyu öyrənməyə, bilməyə (knowing), olmağa (becoming), inkişafa (developing) davam etmək məqsədləri ehtiva olunmalıdır. Bu məq-

sədlə də təhsil proqramları (kurikulumlar) bacarıqlar əsasında formalaşmalıdır. Devey təhsilin məqsədini bu yanaşmada belə izah edirdi: "Təhsili zəngin təcrübələrin içərisindən, təcrübələr yolu ilə və təcrübələr üçün bir inkişaf prosesi olaraq anlamaq gərəkdir". Bu yanaşmada Deveyin təhsil fəlsəfəsində önəmli olan təcrübənin davamlılığı, qarşılıqlı təsir və inkişaf prinsiplərini xüsusi vurğulamaq istərdik. Beləki fərdin təhsil vasitəsilə inkişafı burada fərdi bir proses olmaqdan çox sosial fenomen olaraq dəyərləndirilir. Ancaq bir çox hallarda müasir təhsil anlayışı reduksionist (metodoloji prinsip kimi məsələn, sosioloji hadisələrin bioloji və ya iqtisadi qanunlar ilə izah edilməsi – C.V) yanaşması ilə gerçəkliyin və biliyin kompleks bütünlüyünü itirməkdə, təhsildə təcrübənin gücünü, davamlılığını ehtiva edə bilməməkdədir. Məhz ali təhsildə yeni təhsil paradiqması universitetlərin çağdaş rolunun müəyyən olunması – təhsil, araşdırma və xidmətlə bərabər sosial məsuliyyət missiyasının da nəzərə alınması və bunun cəmiyyətin inkişafına, ekosistemə təsirini diqqətə alaraq, məsuliyyətlilik və etik dəyərlər nisbətində yürütməsi və bu dəyərlərin ehtiva olunması üçün sistemin yenidən qurulmasına ehtiyac vardır. Sistemin yenidən qurulması üçün isə bir sıra alt sistemləri müasir təhsil viziyonuna uyğun layihələndirmək vacibdir. Bunları aşağıdakı kimi təsnif etmək olar:

• Bütövlükdə təhsildə, xüsusilə də ali təhsildə informasiyanın və biliyin yerinə, ömürboyu sürəkli öyrənmə və inkişaf məziyyətlərini önə çıxarma, təhsilin mərkəzinə fərdi və peşə inkişafını, reflektiv düşünməni və tətbiq etməni gətirmək;

• Universitetlərdə disiplinə əsaslanan fundamental elm sahələri yerinə mövzulara söykənən fənlərarası bölümə keçid;

• Bir-birindən fərqli və əlaqəsi olmayan çoxsaylı fakültələri əhatə edən böyük universitet anlayışı əvəzinə, konkret təyinatlı universitet anlayışına keçid. Burada xüsusi yanaşma ondan ibarətdir ki, tələbələrin xaricə oxumağa göndərilməsi praktikasında ayrı-ayrı universitetlərin adlarını deyil, orada daha üstün fakültə, departament örnəklərini seçmək faydalıdır. Yəni burada Azərbaycan timsalında baxsaq, universitetlərin gələcək viziyonunun müəyyənləşməsində dünyada ölçmə meyarlarına yanaşmada reytinq ölçmə modulundan daha çox şəbəkələşmə kriteriyasına üstünlük verilməlidir;

• Yeni tədris texnologiyalarının tətbiqi universitet mühitində şəbəkələşməni elmmetrik meyarlarla çulğalaşdırmalı, ali təhsildə dəyərlər sisteminin yeni invariantlarını müəyyənləşdirməlidir.

Beləliklə, buradan çıxan nəticə budur ki, müasir dövrün universiteti təhsil, araşdırma, inkişaf və xidmət amaclarını bir yerdə öz bünövrəsində ehtiva etməlidir. Bu yanaşmada Azərbaycan gerçəkliyində universitet milli inkişafın yeni strateji hədəflərinin müəyyən olunmasında, ölkənin qlobal rəqabətlilik immunitetinin qorunmasında, milli tarixi ənənələrin vesternizmlə uğurlu harmoniyasında, insan inkişafı və insan kapitalının keyfiyyətcə yeni mərhələyə hazırlanmasında və dövlətin yüksək rifah səviyyəsinə malik ölkəyə çevrilməsində və imkanlar bərabərliyini təşviq edən müasir və inklüziv sosial-iqtisadi sistemin qurulmasında nüvə rolunu oynamalıdır.

Azərbaycanda təhsil alan xarici tələbələrin sayının artırılması, universitetlərin reytinqinin yüksəldilməsi məqsədilə dünya universitetlərində olan bir sıra reallıqlara nail olmağa səy göstərilməlidir:

• Azərbaycan Universitetləri akademik qloballaşmaya qoşulma prosesini sürətləndirməlidir;

• Universitetlərimizdə xaricdə özlərini tanıtma və kollegial idarəetmə mühiti yaradılmalıdır;

• Universitetlərdə təhsil mühiti daha çox müəllim-professor mərkəzli olmaqdan tələbə mərkəzli olmağa yönəldilməlidir;

• Universitetlərimiz öz işini innovasiyaya meyillilik, araşdırmayönümlülük istiqamətində qurmalıdır;

• Azərbaycan universitetlərində dünyada çox sürətli akademik inkişaf trendi olan şəbəkələşmə mühiti öz yerini tutmalıdır.

### İstifadə edilmiş ədəbiyyat


1. http://odt.orb.ru/orenik/index.php?option=com_content&view=article&id=59:2011-02-16-14-19-16&catid=38:2011-02-16-13-14-06&Itemid=58
2. http://ecsocman.hse.ru/data/ 2011/-05/06/Fuler.pdf.
3. Dewey, J. (2007). Deneyim ve eğitim. Ankara, ODTU Yayıncılık. s.29-37
4. Бертон Р. Кларк, Поддержание изменений в университетах, изд, Высшей школы экономики, Москва, 2011, стр 132-133
5. Borghans L., Cörvers F. The americanization of European higher education and research/NBER Working Paper 15217 http://www.nber.org/paper¬s/w15217 (пер.с англ. Е. Покатович).
6. Windolf P. (1997) Expansion and structural change: Higher education in Germany, United States and Japan 1870–1990, Westview, Boulder.
7. Etzkowitz, Henry (1998), "The Norms of Entrepreneurial Science: Cognitive Effects of the NewUniversity–Industry Linkages", Research Policy, 27(8):823–833


**Дж.Валехов**

### Новые подходы в области высшего образования


**Резюме**

Академическая глобализация в современных университетах также, в соответствии новыми трендами, меняет содержание высшего образования. Университеты должны быть известны не только выданными дипломами, но и должны обучать людей преодолевать границы. Новая реальность способствует мобилизации ресурсов пространства высшего образования. С учетом роста конкуренции в глобальном и мировом масштабе еще больше расширяются границы исследований по международному масштабу высшего образования. При оценке Университетов доминирует идея о выдвижении на первый план качественных, а не количественных показателей. Поэтому, размышления о будущем развитии высшего образования оказывают огромное влияние на формирование сегодняшних тенденций.


**C.Valehov**

### New approaches in higher education


**Summary**

Academic globalization in the recent universities modifies the content of higher education in accordance with new trends as well. Universities are known not only with the diplomas, but they should also teach people to overcome the limits. New reality promotes the mobilization of resources of higher education facility. Investigations on international range of higher education have extended its geography by means of globalization and increasing world competition. The dominant point in assessment of universities is not the quantity, but the quality. Therefore views about future of higher education have a very strong influence on setting today's trends.

# TARİXİN TƏDRİSİNDƏ QARABAĞ TARİXİNƏ DAİR MÖVZULARIN YERİ

**Qasım Hacıyev**
***AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun "Qarabağ tarixi" şöbəsinin müdiri, tarix elmləri doktoru***

***Açar sözlər:*** *Azərbaycan, tarix, Qarabağ, tədris, elm, mədəniyyət, mövzu.*
***Ключевые слова:*** *Азербайджан, история, Карабах, учеба, наука, культура, тема.*
***Key words:*** *Azerbaijan, history, Karabakh, teaching, science, culture, theme.*

Azərbaycan torpağını iki yerə bölən Gülüstan sülhündən 200 il keçir. Xalqımızın tarixində ləkə kimi qalan Gülüstan (1813) və Türkmənçay (1828) sülhündən sonra ermənilərin Qarabağa, Naxçıvana, İrəvana köçürülməsi Azərbaycan xalqı üçün arzuolunmaz problemlər yaratdı. Bu gün Azərbaycan Respublikasının xarici siyasətində prioritet sahə olan Dağlıq Qarabağ məsələsi məhz həmin sülh müqavilələrinin törətdiyi münaqişələrin nəticələridir. Son illərdə müxtəlif sənəd və materialların tədqiqi və öyrənilməsi bir sıra vacib tarixi həqiqətlərin aydınlaşdırılmasına imkan yaratmışdır. Bir məsələ aydındır: bu müqavilələrin heç biri Qarabağın erməni torpağı olmasına əsas vermir. Qarabağ xanlığı Rusiya tərkibinə Azərbaycan torpağı kimi daxil olmuşdur. İki əsrə yaxın məxfi saxlanılan bir sıra mətləblər indi üzə çıxarılmışdır.

Azərbaycan artıq 20 ildən çoxdur ki, müstəqillik şəraitində yaşayır. Bu müddətdə təhsilə dair bir sıra drektiv sənədlər qəbul olunmuşdur. O cümlədən prof. Y.Mahmudovun başçılığı ilə V-XI siniflər üzrə tarixdən yeni proqramlar hazırlanmış, dərsliklər tam yeniləşdirilmişdir. Bu proqram və dərsliklərdə son illərin hadisələrinə də geniş yer verilmişdir.

Azərbaycanın dövlət müstəqilliyinin bərpasından sonra Qarabağ tarixinin tədqiqinə xüsusi diqqət yetirilmişdir. Vaxtilə qədim tarixə, zəngin ənənəyə malik olan bu regionun – Qarabağın, hətta Azərbaycanın tarixinin səthi öyrədilməsindən çox-çox fərqli olaraq bu gün müstəqil dövlətimizin təhsil siyasətində bu məsələ prioritet təşkil edir. Qarabağın tarixini saxtalaşdıran, ənənəsini mənimsəyərək özününküləşdirməyə maraq göstərən, mədəniyyət abidələrinə sahib çıxmağa çalışan bədnam qonşularımızın uydurmalar yaratdığı, böhtanlar yağdırdığı bir zamanda ölkəmizin bu dilbər guşəsinin qədim və zəngin tarixinin, tarixi coğrafiyasının, siyasi, sosial-iqtisadi və mədəni həyatının öyrənilməsi böyük əhəmiyyətə malikdir.

Vətənini sevən hər bir azərbaycanlının öz ölkəsinin hər bir regionuna, onların tarixi keçmişinə bələd olması çox vacibdir. Ermənistanın Azərbaycan Respublikasının Qarabağ regionunun xeyli hissəsini işğal altında saxlamasını göz önünə gətirsək, həmçinin dövlətimizin möhkəmliyinin, ərazi bütövlüyünün, müasir maraqlarının təmin olunmasının strateji əhəmiyyətə malik olduğunu görərik.

Azərbaycanın ali və orta təhsil müəssisələrinin profilinə uyğun olaraq hazırlan-

mış və Azərbaycan Respublikası Təhsil Nazirliyinin 08.11.2010-cu il tarixli 1430 nömrəli əmrinə əsasən çap olunmuş "Qarabağ tarixi" proqramı və "Qarabağ tarixi" adlı dərs vəsaiti müəllimlər üçün Qarabağ tarixi fənninin tədrisinə, onun qədim və zəngin tarixinin hərtərəfli öyrənilməsinə yaxından kömək edəcəkdir.

Fənnin sistemli şəkildə tədrisi maraqlı olduğu qədər də effektlidir. Belə ki, hər bir gənc yüksək vətənpərvərlik ruhuna malik olmalı, özündən sonrakı nəslin də bu ruhda böyüməsinə xidmət etməlidir. Bu baxımdan Qarabağ tarixinin tədrisi çox əhəmiyyətlidir.

Qarabağın qədim dövrdən müasir dövrədək tarixini 2 bölmə üzrə öyrənilməsi nəzərdə tutulur. Birinci bölmə Qarabağın tarixi qədim dövrdən XX yüzilliyin əvvəllərinə qədərki dövrü əhatə edir.

Qeyd etmək lazımdır ki, Qarabağ tarixinin öyrənilməsinə dair ən mötəbər mənbələr "Qarabağnamələr"dir.

Girişdə "Qarabağ tarixi" fənninin predmeti və öyrənilməsinin əhəmiyyəti, tarixi biliklər sistemində Qarabağ tarixinin yeri və rolu, Qarabağ tarixinin qaynaqları və tarixşünaslığının zənginliyi, Azərbaycan tarixinin tərkib hissəsi olan Qarabağın tarixinin dövrləşdirilməsi nəzərə alınaraq ayrı-ayrı mövzular üzrə tədris olunmasından bəhs edilir.

İlk mövzuda Qarabağın tarixi coğrafiyasına dair məlumat verilir. Azərbaycanın Qarabağ regionunun ibtidai icma dövrü tarixi geniş işıqlandırılır. Konkret və hərtərəfli şəkildə Azərbaycanın Qarabağ bölgəsində insan cəmiyyətinin ən qədim inkişaf mərhələləri, qədim Azıx adamı – azıxantrop, Quruçay mədəniyyəti, Orta paleolit – Mustye mədəniyyəti, Üst paleolit, Mezolit və Neolit mədəniyyəti, istehsalın meydana çıxması şərh edilir. Eyni zamanda xronoloji ardıcıllıqla Azərbaycanın Qarabağ bölgəsində eneolit dövrü abidələri, yaşayış məskənləri, təsərrüfat həyatı, erkən tunc dövrü, Kür-Araz mədəniyyəti, ilk tayfa birliklərinin yaranması, orta tunc dövrü, son tunc və erkən dəmir dövrü, Xocalı-Gədəbəy mədəniyyəti, təsərrüfatın və sənətkarlığın yüksəlişi, qəbilələrarası mübadilə, həmin dövrün ictimai münasibətləri, həmçinin mənəvi mədəniyyəti öyrənilir.

Azərbaycanın ilk dövlətlərinin yarandığı dövrdə Qarabağ regionunun tarixinə dair mövzu ilkin tayfa ittifaqlarının yaranması, utilər, qarqarlar, sovdeylər, saklar, hurritlər haqqında məlumat verilir, həmçinin kimmer, skif, sak tayfalarının yürüşləri və Azərbaycanın Qarabağ bölgəsində onların tarixi izlərinə, Azərbaycan ərazisində Skif çarlığı və bunun Qarabağ tarixi ilə bağlılığına dair məsələlərə toxunulur. Eləcə də, Əhəmənilər dövlətinin süqutu və Albaniya dövlətinin yaranması, Qarabağ bölgəsinin Albaniya dövlətinin tərkibində mərkəzi bölgələrdən biri olması vurğulanır. Burada Azərbaycanın Qarabağ bölgəsinin e.ə. IV - b.e. III yüzilliklərində əhalisi, təsərrüfat həyatı, ticarəti, ticarət yolları, şəhərlər və başqa yaşayış məskənləri, sosial münasibətlər, maddi mədəniyyət abidələri, incəsənət və din, həmçinin siyasi həyat şərh edilir.

Azərbaycanın Qarabağ regionunun erkən orta əsrlər tarixi (III-VII yüzilliklər) mövzusu üzrə erkən orta yüzilliklərdə Albaniyada siyasi-inzibati vahidlər, Azərbaycanın Qarabağ regionunun tarixi coğrafiyası, şəhərləri və digər yaşayış məskənləri, qədim şəhəri Bərdənin Albaniyanın siyasi, iqtisadi və mədəni mərkəzi – paytaxtı olması və s. məsələlər öyrənilir. Eləcə də, Azərbaycanın Qarabağ regionunda yeni ictimai münasibətlər, feodal istehsal üsulunun meydana çıxması və inkişafı, mövcud olan torpaq mülkiyyət növlərinin, torpaqdan istifadə formalarının, vergi və mükəlləfiyyətlərin xarakterik səciyyəsi, ictimai həyat və siyasi hərəkatlar, regiona manniçilik və məzdəkilər hərə-

katının təsiri şərh edilir. Qarabağ regionunun xristian dininin təsiri altında olması, xristianlıq dövrü maddi və mənəvi mədəniyyətinin əlamət və xüsusiyyətləri barədə məlumat verilir.

Azərbaycanın Qarabağ regionunun Sasani imperiyasının işğalı dövründə, alban arşaqlılarının və mehranlıların hakimiyyəti dövründə əhalinin etnik və sosial tərkibi, təsərrüfat həyatı, ticarət əlaqələri, həmçinin dinlərin və dini ideologiyaların (zərdüştlik və xristianlıq) yayılması şərh edilir. Eyni zamanda, Azərbaycanın Qarabağ regionunun mədəniyyəti, yazı, incəsənət, memarlıq və şəhərsalmaya dair məsələlərə toxunulur.

Azərbaycanın Qarabağ regionunun ərəb xilafətinin hakimiyyəti dövrünün tarixinə dair mövzuya ərəb yürüşləri ərəfəsində Azərbaycanın Qarabağ regionunda siyasi vəziyyəti, ərəblərin ilk yürüşü və onun nəticələri, ərəblərin növbəti yürüşləri, Qarabağ regionunda ərəb işğalına qarşı xalq müqaviməti daxil edilir. Bununla bərabər Alban hökmdarı Cavanşirin xarici siyasəti, Bərdə məclisi, Albaniya hakimiyyətinə son qoyulması və Azərbaycanın qəti olaraq Xilafət hakimiyyətinə tabe edilməsi, Xilafətin inzibati siyasətinin Qarabağ regionunda təzahürləri, idarəetmə, köçürmə və vergi siyasətinin regionunun həyat şəraitinə təsiri, dini proseslər və onların yerli əhali üçün nəticələri, İslam dininin yayılması, həmçinin Xilafət əleyhinə mübarizə şərh edilir. Həmçinin Azərbaycanın Qarabağ regionunun ictimai vəziyyətinə, təsərrüfat həyatına, ticarət və ticarət əlaqələrinə yer verilir, maddi və mənəvi mədəniyyət, elm və fəlsəfi fikir, ədəbiyyat, memarlıq və şəhərsalmaya dair məsələlərə toxunulur.

Azərbaycanın Qarabağ regionunun IX yüzilliyin ikinci yarısı–XII yüzillikdə tarixini tədris etmək üçün xilafətin zəifləməsi, ucqarlarda mərkəzi hakimiyyətdən ayrılma prosesinin başlandığı dövrdə Qarabağ regionunda siyasi və sosial-iqtisadi vəziyyəti, Qarabağ regionunun Salarilər dövləti tərkibində, rusların Qarabağ regionuna qarətçi yürüşü (X əsr), Bərdə şəhərinin talan-qarət edilməsi və yandırılması, həmçinin Qarabağ regionunun Səlcuqların ilk yürüşləri və Səlcuq imperiyası dövründə tarixi şərh edilir. Eyni zamanda, Azərbaycan Atabəylər dövlətinin yaranması və güclənməsi dövründə Qarabağ regionunun tarixi, sosial-iqtisadi vəziyyəti, kənd təsərrüfatı, torpaq münasibətləri, şəhərlərin tərəqqisi, sənətkarlıq və ticarət, karvan yolları və beynəlxalq ticarət əlaqələrində Qarabağ regionunun yeri, həmçinin mədəniyyətin intibahı dövründə maddi mədəniyyəti, memarlıq və şəhərsalma, dekorativ-tətbiqi sənət, epiqrafik abidələr, elm və təhsil, ədəbiyyat, fəlsəfə və s. məsələlərə dair məlumatlar verilir.

Azərbaycanın Qarabağ regionu monqol yürüşləri dövründə tarixinə dair mövzu üzrə Qarabağ regionu monqolların ilk yürüşü, Xarəzmşah Cəlaləddinin istilasına qarşı Gəncə və Qarabağın birgə mübarizəsi, monqolların ikinci yürüşü və Qarabağ regionunda monqol istilasının ağır nəticələri, monqolların üçüncü yürüşü zamanı, Qarabağ regionunun Hülakülərin hakimiyyəti dövrü, həmçinin Çobanilərin hakimiyyəti, Çobanilərə qarşı xalq hərəkatı, Cəlairilərin hakimiyyəti dövründə Qarabağ regionunun tarixi və s. məsələlər şərh edilir. Eləcə də, Azərbaycanın Qarabağ regionunda kənd təsərrüfatı və aqrar münasibətlər, vergi və mükəlləfiyyətlər, Qazan xanın islahatları, onun Qarabağ regionunda təsiri, Qarabağ regionunda sənətkarlığın inkişafı, ticarət, əmtəə-pul münasibətləri, ictimai vəziyyət, şəhərlər və şəhər həyatı haqqında məlumat verilir.

Azərbaycanın Qarabağ regionu XIV yüzilliyin sonu - XV yüzillikdə mövzusu üzrə Əmir Teymurun və Toxtamışın Azərbaycana hücumları və bunun Qarabağ regionunda izlərinə, Azərbaycanın Qarabağ re-

gionunda yadellilərə qarşı mübarizəsinə, Azərbaycanın Qarabağ regionunun Qaraqoyunlular və Ağqoyunlular dövründə, XV yüzillikdə Azərbaycanın Qarabağ regionunda siyasi-inzibati vəziyyət, Gəncə-Qarabağ bəylərbəyliyi, Qarabağ regionunda sosial-iqtisadi həyata dair məsələlərə toxunulur. Qarabağ regionunda kənd təsərrüfatı və aqrar münasibətlər, şəhərlər, sənətkarlıq və ticarət, əmtəə-pul münasibətləri, torpaq mülkiyyəti, vergilər və mükəlləfiyyətlər şərh edilir. XIV-XV yüzilliklərdə mədəniyyət, ədəbiyyat, epiqrafik abidələr, incəsənət və memarlıq, maddi mədəniyyət şərh edilir.

Azərbaycanın Qarabağ regionu XVI-XVII yüzilliklərdə mövzusu üzrə XV yüzilliyin sonu–XVI yüzilliyin əvvəllərində Azərbaycanın Qarabağ regionunda siyasi vəziyyət, Səfəvilər dövlətinin yaranması, Qarabağ Səfəvi dövlətinin tərkibində, Gəncə-Qarabağ bəylərbəyliyi, Səfəvi-Osmanlı münasibətlərində Qarabağ, I Şah Təhmasib dövründə Qarabağın vəziyyəti, Qarabağ Səfəvilər dövlətinin zəifləməsi dövründə, Qarabağ Osmanlı dövlətinin yeni yürüşləri dövründə, Qarabağ I Şah Abbasın islahatları zamanı eləcə də, Azərbaycanın Qarabağ regionu yadellilərə qarşı azadlıq mübarizəsi illərində, Qarabağ Cəlalilər hərəkatı dövründə, XVII yüzilliyin birinci yarısında Azərbaycanın Qarabağ regionu Osmanlı-Səfəvi müharibələri dövründə, həmçinin XVII yüzilliyin ikinci yarısında Azərbaycanın Qarabağ regionunda ictimai-siyasi vəziyyət, XVI-XVII yüzilliklərdə Azərbaycanın Qarabağ regionunda iqtisadi həyat, kənd təsərrüfatı və aqrar münasibətlər, torpaq sahibliyi, vergi və mükəlləfiyyətlər, şəhərlər, sənətkarlıq, təsərrüfat həyatı, ticarət, Qarabağ bölgəsinin Azərbaycanın xarici iqtisadi əlaqələrində yeri və rolu, XVII yüzilliyin sonlarında Qarabağ bölgəsi Azərbaycanın iqtisadi tənəzzülü dövründə, XVI-XVII yüzilliklərdə Azərbaycanın Qarabağ bölgəsində mədəniyyəti və s. şərh edilir.

Azərbaycanın Qarabağ regionu XVIII yüzilliyin birinci yarısında tarixinə dair mövzuda XVIII yüzilliyin əvvəllərində Qarabağda sosial-iqtisadi və siyasi vəziyyət, Azərbaycanın Qarabağ regionu Səfəvi dövlətinin tənəzzülü və Azərbaycanda xalq azadlıq hərəkatının qüvvətlənməsi dövrü, I Pyotrun Xəzərboyu əyalətlərə dair iqtisadi siyasəti, işğalçılıq planları və Qarabağ tarixində bunun mənfi rolu, 1724-1735-ci illərdə Azərbaycanın Osmanlı dövləti tərəfindən tutulması, Qarabağ regionunun Osmanlıların hakimiyyəti dövrü, Səfəvi-Osmanlı müharibələri, Qarabağ regionunun Nadir şahın hökmranlığı dövrü, XVIII yüzilliyin birinci yarısında Azərbaycanın Qarabağ regionunda sosial-iqtisadi həyat, kənd təsərrüfatı və aqrar münasibətlər və şəhərlər tarixinə geniş yer verilir.

Azərbaycanın Qarabağ regionu XVIII yüzilliyin ikinci yarısında tarixi mövzusu üzrə Azərbaycanda xanlıqların yaranması, Azərbaycanın şimalındakı xanlıqlar və Qarabağ xanlığı, Pənahəli xanın Qarabağ xanlığını möhkəmlətmək uğrunda mübarizəsi, Qarabağın alban xristian məlikləri, Qarabağ xanlığının sərhədlərinin genişləndirilməsi, Qarabağ xanlığına qarşı müqavimətlər, İbrahimxəlil xanın hakimiyyəti dövründə Qarabağ xanlığının güclənməsi, Qarabağ xanlığının sosial-iqtisadi münasibətləri və dövlət idarəçiliyi, Qarabağ xanlığı XVIII yüzilliyin son rübündə, Qarabağ xanlığının xarici siyasəti, qonşu xanlıqlarla əlaqələri, Qacarların hakimiyyətə gəlməsi, Ağa Məhəmməd şah Qacarın hücumları, Şuşanın müdafiəsi, Rusiyanın Azərbaycana işğalçı yürüşü, işğal olunmuş torpaqlarda Rusiyanın siyasi-iqtisadi tədbirləri, Ağa Məhəmməd şah Qacarın Şimali Azərbaycana ikinci yürüşü və bunun nəticələri, XVIII yüzilliyin ikinci yarısında Qarabağın sosial-iqtisadi vəziyyəti, kənd təsərrüfatı və aqrar müna-

sibətlər, şəhərlər, sənətkarlıq və ticarət, Qarabağ xanlığında sosial-silki quruluş və idarəçilik, XVIII yüzillikdə Qarabağın mədəniyyəti, maarif və elm, ədəbiyyat, musiqi, aşıq yaradıcılığı, incəsənət və memarlıq məsələlərinə yer verilir.

Azərbaycanın Qarabağ regionu XIX yüzilliyin birinci yarısında mövzusu üzrə XIX yüzilliyin başlanğıcında Qarabağ xanlığında ictimai-siyasi durum, Qarabağ xanlığı Rus çarizminin müstəmləkəçilik siyasəti və Azərbaycan ərazilərinin Rusiya tərəfindən işğalının başlanması dövründə, Qarabağ xanlığının Rusiya ilə ittifaqı, Kürəkçay müqaviləsi (1805), Qarabağ Rusiya-İran (1804-1813, 1826-1828) və Rusiya-Türkiyə (1806-1812, 1828-1829) müharibələri dövründə, Gülüstan (1913-cü il) və Türkmənçay (1928-ci il) müqavilələri, Rusiyanın köçürmə siyasəti, Azərbaycanın Qarabağ regionunda ermənilərin yerləşdirilməsi, XIX yüzilliyin I yarısında Qarabağda sosial-iqtisadi vəziyyət, Azərbaycanın Qarabağ regionunda çarizmin iqtisadi siyasətinin təsiri, milli zülm və etnik toqquşmalar, iqtisadi zülmə qarşı xalq hərəkatı, XIX yüzilliyin birinci yarısında Qarabağın mədəniyyəti, dini və dünyəvi məktəblər, maarif, elm, ədəbiyyat, incəsənət (Mirzə Adıgözəl bəy, Mirzə Camal Cavanşir Qarabaği, Əhməd bəy Cavanşir, Qasım bəy Zakir, Mir Mövsüm Nəvvab) daxil edilir.

Azərbaycanın Qarabağ regionu XIX yüzilliyin ikinci yarısında mövzusu üzrə XIX yüzilliyin 60-70-ci illərində Qarabağda yeni sosial-iqtisadi münasibətlər, Azərbaycanın Qarabağ regionunda iqtisadi vəziyyət, 1870-ci il kəndli islahatı və bunun Qarabağın iqtisadi həyatına təsiri, inzibati islahatlar, sosial münasibətlər, şəhərlər, XIX yüzilliyin ikinci yarısında Azərbaycanın Qarabağ regionunda maarif və mədəniyyət, mətbuat, ədəbiyyat və incəsənət və s. şərh edilir.

Beləliklə, "Qarabağ" proqramında tarixlik, elmilik və obyektivlik metodologiyasına əsaslanaraq, son illərin hadisələrini və tarixi proseslərə verilən yeni qiymətin öz əksini tapmasına ciddi əməl edilmiş, ölkəmizin ərazi bütövlüyü məsələsi inandırıcı faktlarla əsaslandırılmışdır.

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumtəhsil məktəblərinin V-XI sinifləri üçün tarix proqramları. Bakı, 2000.

2. "Qarabağ tarixi" proqramı. (Tərtibçi Q.Hacıyev). Bakı, 2011.

3. www.kurikulum.az (Azərbaycan tarixi V-IX siniflər üzrə fənn kurikulumu).

4. Ümumi təhsilin fənn standartları (I-XI sinifləri). Bakı, 2012.

**К.Гаджиев**

**Особое место темы Карабахской истории в обучении истории**

**Резюме**

В статье говорится о том, как после восстановления государственной независимости в Азербайджане, уделялось особое внимание на исследование Карабахской истории. В связи с этим составлена программа и утверждена министерством. Планируется выпуск учебного пособия по этой проблеме.

**G.Hajiyev**

**Teaching the history of Nagorno-Karabakh in history lessons**

**Summary**

In this article it is spoken about the investigations on the history of Nagorno-Karabakh after Azerbaijan Republic gained independence. In compliance to this a new programme has been compiled and ratified by the Ministry. A new textbook on the history of Nagorno-Karabakh is planned to publish.

***<u>Təhsil islahatı fəaliyyətdədir</u>***

# UĞURLARIMIZ BİZİ ARXAYINLAŞDIRMIR

**Rafael Hacıyev**
***Siyəzən Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *islahat, məktəb, təhsil, idarəetmə, innovasiya, metodika, qiymətləndirmə, inteqrasiya.*

***Ключевые слова:*** *реформа, школа, образование, управление, инновация, методика, оценивание, интеграция.*

***Key words:*** *reform, school, education, management, innovation, methodology, evaluation, integration.*

Müstəqil Azərbaycanda təhsil sahəsində aparılan islahatların əsası ulu öndərimiz tərəfindən qoyulmuş və hal-hazırda onun layiqli davamçısı cənab İlham Əliyev tərəfindən uğurla həyata keçirilir. Təhsilimizə dövlət başçısı tərəfindən get-gedə daha çox qayğı göstərilir.

Ölkəmizdə gedən islahatlar, siyasi və iqtisadi inkişaf, dövlət başçısının təhsilə göstərdiyi qayğı bütün təhsil işçilərinin də üzərinə böyük məsuliyyət qoyur. Ona görə də hər il olduğu kimi 2012-2013-cü dərs ilində rayonumuzun bütün ümumtəhsil müəssisələrində təhsilin demokratikləşdirilməsi, humanistləşdirilməsi, kurikulum islahatı, təhsilin dünyəvi xarakter daşıması, təhsilin məzmununun müasirləşdirilməsi, ölkə üçün layiqli vətəndaşların yetişdirilməsi istiqamətində əsaslı işlər görülmüşdür. Rayon Təhsil Şöbəsi tərəfindən təhsilin keyfiyyətinin yüksəldilməsi, tədris-metodik və informasiya təminatı, əlaqələndirmə və tənzimləmə ilə əlaqədar mütəmadi işlər aparılmışdır. Bu gün rayonumuzda təhsil sisteminin müasir tələblərə cavab verən hüquqi-normativ bazasının yaradılması, təhsil sahəsində ölkə və beynəlxalq təcrübənin dərindən öyrənilməsi, rayon məktəbləri arasında pedaqoji təcrübənin mübadiləsi sahəsində də xeyli iş görülür. Təhsilə rəhbərlik sahəsində də demokratik prinsiplərə əsaslanan, qeyri-inzibati rəhbərlik metodlarından istifadə olunur. İdarəetmədə cəmiyyəti inkişaf etdirən və cəmiyyət tərəfindən müsbət qəbul edilən idarə üsullarına üstünlük verilir.

Respublikamızın hər yerində olduğu kimi Siyəzən rayonunda da təhsilin əsas strateji xətti Azərbaycan hökuməti tərəfindən qəbul edilmiş 10 illik (2003-2013) Təhsil İslahat Proqramının həyata keçirilməsinə yönəldilmişdir. Cari dərs ilində I-VI sinif şagirdləri yeni tədris proqramları (kurikulumları) ilə dərs keçəcəklər. Bu proqramların tətbiqi ilə əlaqədar:

- Fənn üzrə təhsil standartları, onların xüsusiyyətləri,
- Fənn üzrə inteqrasiyanın özünəməxsus cəhətləri və təlim prosesində onun nəzərə alınması,
- Fənn üzrə strateji yanaşmalar: iş forması və təlim üsulları, müəllimin fəaliyyətinin planlaşdırılması (illik və gündəlik planların hazırlanması və ondan istifadə),
- Məzmun standartlarının şərh olunması,
- Qiymətləndirmə mexanizmləri və

onlardan təlim, tədris prosesində istifadə edilməsi kimi məsələlər yeni dərs ilində diqqət mərkəzində olacaqdır.

Bütün bunları nəzərə alaraq Təhsil şöbəsi öz fəaliyyətini Təhsil İslahat Proqramında və Təhsil Qanununda nəzərdə tutulan ümumtəhsilin keyfiyyəti və təhsilin real tələblərə uyğunluğunu təmin etməyə yönəltmişdir.

2013-cü ildə rayon təhsili üçün ən əsas amil buraxılış imtahanlarının, ali və orta ixtisas məktəblərinə qəbulun nəticələridir. IX və XI siniflərdə buraxılış imtahanları Tələbə Qəbulu üzrə Dövlət Komissiyası tərəfindən mərkəzləşdirilmiş şəkildə aparılmışdır. IX sinif şagirdlərindən imtahana buraxılmış 511 nəfərdən ana dili üzrə 331 nəfəri, riyaziyyat üzrə 321 nəfəri, XI sinif şagirdlərindən imtahana buraxılmış 365 nəfər şagirddən ana dili üzrə 282 nəfəri, riyaziyyat üzrə 321 nəfəri müvəffəq qiymət almışlar. Bu nəticə keçən dərs ilinin nəticəsindən qismən zəif olsa da respublika göstəricisindən yüksəkdir.

Qeyd etmək lazımdır ki, ötən ildən başlayaraq imtahanların nəticələrindən asılı olmayaraq IX və XI sinfi bitirmiş bütün məzunlara ümumi orta təhsil haqqında şəhadətnamə və tam orta təhsil haqqında attestat verilmişdir. Bu, gənclərimizə göstərilən xüsusi diqqətin və dövlət qayğısının bariz nümunəsidir. Bu qayğı və diqqətə məzunlar, müəllimlər və valideynlər minnətdarlıqla yanaşırlar.

Rayon təhsili üçün ən önəmli olan, təhsilin bilavasitə nəticələrini əks etdirən fakt ali məktəblərə qəbuldur. Rayonun tam orta məktəblərini bitirmiş 365 nəfər məzundan 228 nəfəri ali məktəblərə qəbul imtahanlarında iştirak etmişlər. 96 nəfər məzun ali məktəblərə qəbul olunmuşlar. Onlardan 90 nəfəri TQDK-nın xətti ilə ölkəmizin ali məktəblərinə (3 nəfəri hərbi yönümlü ali məktəblərə), 6 nəfəri isə xarici ölkələrin ali məktəblərinə qəbul olunmuşlar.

Statistik nəticələrə əsasən qəbul olmuş məzunların 66 nəfəri I, 11 nəfəri II, 14 nəfəri III və 6 nəfəri isə IV ixtisas qrupları üzrə ali məktəblərə daxil olmuşlar. Qəbul imtahanlarında ən yüksək nəticəni Siyəzən şəhər 1 nömrəli tam orta məktəbin məzunları 635 bal toplamış Nəzərov Fuad Rafiq oğlu və 630 bal toplamış Məmmədli Nərmin Zahid qızı, Siyəzən şəhər 2 nömrəli tam orta məktəbin məzunu 616 bal toplamış Zərbəli Əli Vüqar oğlu göstərmişdir.

Əvvəlki illərin məzunlarından da 24 nəfər ali məktəb tələbəsi olmuşdur. Bundan əlavə tam orta təhsil bazasından 41 nəfər orta ixtisas məktəblərinə daxil olmuşdur ki, onların da 22-i 2013-cü ilin məzunlarıdır.

Ötən dərs ilinin ən sevindirici hadisələrindən biri odur ki, Siyəzən şəhər 6 nömrəli tam orta məktəbin ibtidai sinif müəllimi Tatyana Səlimova “Ən yaxşı müəllim” müsabiqəsində uğurla iştirak etmiş, möhtərəm Prezidentimiz cənab İlham Əliyevin sərəncamı ilə müsabiqənin qalibi hesab edilmişdir.

Məlum olduğu kimi, cari dərs ilində VI siniflərdə təlim yeni təhsil proqramları ilə - kurikulumla aparılır. Bu məqsədlə Azərbaycan Respublikası TN-nin müvafiq əmrinə əsasən V-VI siniflərdə dərs deyəcək, lakin kursdan keçməmiş fənn müəllimləri üçün 60 saatlıq kurikulum kursları (iyul-sentyabr) təşkil edilmiş, 8 fənn üzrə kurslarda 169 nəfər müəllim və məktəb rəhbəri iştirak edərək I və II dərəcəli sertifikatlar almışlar. Bundan əlavə 12 nəfər məktəb rəhbəri, müəllim və tərbiyəçi AMİ-də ixtisasartırma kurslarından keçmiş, onlara da müvafiq sertifikat verilmişdir.

Siyəzən Rayon Uşaq Yaradıcılıq Mərkəzində təşkil edilən dərnəklərdə iştirak edən uşaqlar rayon, zona, respublika baxış-müsabiqələrində fəal iştirak etmişlər. Belə ki, 6 yanvar 2013-cü ildə “Floristika” nomi-

nasiyasında Zeynalova Nərmin 3-cü yer tutub. 18 aprel 2013-cü il tarixində Siyəzən şəhər mədəniyyət evində təşkil edilmiş narkotik maddələrə aludəçiliyin ağır xəstəlik olduğunu göstərən rəsm əsərlərindən təşkil olunmuş müsabiqədə fərqlənən 2 əsərin müəllifi olan uşaqlar Siyəzən Rayon Gənclər və İdman İdarəsi tərəfindən Fəxri fərman ilə təltif olunmuşdur. UYM-nin əsas problemi xüsusi binasının olmaması, maddi-texniki bazanın çox zəif olması və qrupların rayonun səviyyəsinə görə azlığıdır.

Rayonda fəaliyyət göstərən ikinci məktəbdənkənar təhsil müəssisəsi Uşaq Gənclər İdman Mərkəzidir.

Burada 21 qrupda 282 nəfər məktəbli yeniyetmə: boks üzrə 9 qrupda 113 nəfər, sərbəst güləş üzrə 10 qrupda 133 nəfər, futbol üzrə 2 qrupda 36 nəfər idmançı məşğul olur. Rayon UGİM-in qruplarında məşqlər 15 nəfər məşqçi-müəllimin rəhbərliyi altında keçirilir. Məşqçilərin 11 nəfəri ali, 4 nəfəri isə orta ixtisas təhsillidir. Müəllimlərin 2 nəfəri Azərbaycanın əməkdar məşqçisi fəxri adını daşıyır. Məşqlər şəhərin Gil-Gilçay qəsəbə və 4 nömrəli tam orta məktəblərin idman zallarında, şəhər stadionunda yerləşən “Nefçi” İSM-nin bazasında, uyğunlaşdırılmış boks və sərbəst güləş zallarında keçirilmişdir.

UGİM-in ən hazırlıqlı idmançıları respublika yarışlarında qüvvələrini sınamışlar. Onlardan 16 nəfəri (on nəfər boks üzrə, 4 nəfər sərbəst güləş üzrə, 2 nəfər futbol üzrə) respublika yarışlarında mükafata layiq yerlər tutmuşlar. Məktəbin yetirmələri Təhsil RİM-nin ölkə birinciliyində futbol üzrə 3-cü yeri, boks üzrə zona yarışında 2 nəfər 1-ci yeri, məktəblilərin V Respublika oyunlarında güləş üzrə 2 nəfər 1-ci yeri, 4 nəfər 3-cü yeri, məktəblilərin VI Respublika oyunlarında boks üzrə 2 nəfər 2-ci yeri, sərbəst güləş üzrə 2 nəfər 1-ci, 1 nəfər 2-ci, 2 nəfər 3-cü yeri tutmuşlar.

Rayon Təhsil Şöbəsinin çox sahəli fəaliyyət sahələrindən biri də gənclərin hərbi vətənpərvərlik tərbiyəsidir. Bu məsələ ilə əlaqədar rayonun ümumi təhsil məktəblərində fasiləsiz iş aparılır. Əldə edilən nəticələrin dinamikası təsdiq edir ki, 2012-2013-cü dərs ilində rayon məktəblərində hərbi vətənpərvərlik işləri düzgün istiqamətdə inkişaf edir. Rayon təhsil şöbəsinin 2012-2013-cü dərs ili üçün fəaliyyət planında şagirdlərin hərbi vətənpərvərlik tərbiyəsini yaxşılaşdırmaq, onlarda vətənə, torpağa, milli-mənəvi dəyərlərimizə məhəbbət hislərini formalaşdırmaq, düşmənə qarşı nifrət və barışmazlığı aşılamaq üçün silsilə tədbirlərin keçirilməsi nəzərdə tutulmuşdur. Bu dərs ilində həm məktəblərdə, həm də ümumrayon tədbirlərində bir çox tədbirlər keçirilmişdir. Qarabağ müharibəsinin iştirakçıları ilə məktəblərdə görüşlər keçirilmiş, “20 Yanvar”, “Xocalı Soyqırımı”, “31 Mart azərbaycanlıların soyqırımı günü” münasibəti ilə bütün məktəblərdə tədbirlər keçirilmişdir. Keçən dərs ilində əksər məktəblərdə şagirdlərin hərbi vətənpərvərlik tərbiyəsinin yaxşılaşdırılması üçün xeyli iş görülmüşdür. Rayonun əksər məktəblərində gənclərin çağırışaqədərki hazırlıq dərslərində şagirdlərə hərbi vətənpərvərlik hislərinin aşılanması daim diqqət mərkəzində olur. Müntəzəm olaraq dərslərdə şagirdlərə Azərbaycanın görkəmli sərkərdələri, hərbi tarixi barədə ətraflı məlumat verilmişdir.

2012-2013-cü dərs ilində Siyəzən rayon tam orta məktəblərində X və XI siniflərdə Gənclərin çağırışaqədərki hazırlıq dərsləri Azərbaycan Respublikası Müdafiə Nazirliyi ilə razılaşdırılmış və Təhsil Nazirliyi tərəfindən təsdiq edilmiş proqram əsasında tədris edilmişdir.

2012-2013-cü tədris ilində Siyəzən rayonunun ümumtəhsil məktəblərini 365 nəfər şagird bitirmişdir ki, onların da hamısı gənclərin çağırışaqədərki hazırlıq fənnindən

tədris materialını 100% mənimsəmə ilə başa vurmuşlar.

2012-2013-cü dərs ilində rayon məktəblərinin X və XI sinif şagirdlərindən ibarət komandaları "Cəsurlar və Mətinlər", "Şahin" hərbi idman oyunlarında iştirak etmiş, Siyəzən şəhər 1, 2 və 6 nömrəli tam orta məktəblərin komandaları fərqlənmişlər. Fövqəladə Hallar Nazirliyinin təşkil etdiyi "Gənc xilasedici və yanğınsöndürən" yarışında Siyəzən şəhər 2 nömrəli tam orta məktəbin komandası beynəlxalq müsabiqədə 4-cü yeri tutmuşdur.

Təhsilin inkişafını təşkil edən ən əsas amillərdən biri məktəblərin maddi-texniki bazasının möhkəmləndirilməsidir. Regionların Sosial-İqtisadi İnkişafı Proqramının həyata keçirilməsi ilə əlaqədar yeni məktəblərin tikilməsi, mövcud məktəblərin əsaslı təmir edilib təhsil üçün tam yararlı hala salınması, məktəblərin İKT avadanlığı, dərsliklər və inventarla təchizat prosesləri fasiləsiz olaraq 2012-2013-cü dərs ilində də davam etmişdir. Dərs ilinin birinci yarısında məktəblər üçün ümumi dəyəri 24050 manat, ikinci yarısında isə 52980 manat (cəmi 77831 manat) olan 353 ədəd masa, şkaf, yazı lövhəsi, İKT avadanlığı, mebel və digər avadanlıqlar alınmışdır. Məktəblərə 7533 ədəd pulsuz dərslik çatdırılmışdır ki, onların 164 ədədi rus bölməsi, 7369 ədədi azərbaycan bölməsinə aiddir.

2012-2013-cü dərs ilinin rayon təhsili üçün ən böyük hadisələrindən biri ölkə başçısının Siyəzən rayonuna təkrar gəlişi, məktəb tikintisinin görünməmiş vüsət almasıdır. Məhz bu dərs ilində dövlətimizin təhsilə göstərdiyi qayğı sayəsində rayonumuz üçün heç vaxt rast gəlmədiyimiz sayda, 3 nömrəli tam orta məktəb (Gil-Gilçay qəsəbə, Məşrif kənd və Siyəzən şəhər 3 nömrəli tam orta məktəbləri) üçün yeni məktəb binası tikilib istifadəyə verilmiş, Sədan və Dağquşçu kənd tam orta məktəbləri üçün isə yeni məktəb binalarının inşası başa çatmaq üzrədir. 2013-cü ildə rayonda daha iki məktəbin - Siyəzənkənd ümumi və Böyük Həmyə kənd tam orta məktəbləri üçün yeni məktəb binalarının tikintisinə başlanacaqdır. Qeyd etmək lazımdır ki, təhsil sahəsində uğurlarımız dövlətimizin və onun yerli orqanlarının ardıcıl qayğısı sayəsində mümkün olmuşdur. Son 7 ildə 10 məktəbin tikilib istifadəyə verilməsi və 2 məktəbdə tamamlanma işlərinin getməsi bizim üzərimizə böyük məsuliyyət qoyur. Təhsil işçiləri bunu dərindən anlayır və ona cavab olaraq əllərindən gələni əsirgəməyəcəklər.

Rayonumuzun təhsil işçiləri əldə etdikləri uğurları yeni dərs ilində daha da inkişaf etdirəcək, təhsilimizdə olan nöqsan və çatışmazlıqları aradan qaldırmaq üçün öz bilik və bacarıqlarını daha da artıracaq, pedaqoji ustalığını təkmilləşdirəcəklər.

*Rəyçi: TPİ-nin bölmə müdiri R.Hüseynov*

**Р.Гаджиев**

**Удачи не успокаивают нас**

**Резюме**

В статье говорится о мероприятиях ведущихся в направлении интеграции в мировое образование. Отмечается, что реформы, происходящие в стране, политическое и экономическое развитие, забота, оказанная главой государства образованию, призывают к ответственности работников образования районных отделов.

**R.Hajiyev**

**Achievements don't satisfy us**

**Summary**

In the article it is spoken about the works done towards integration of our education into world education system. It is mentioned that, the reforms in our country, political and economical growth, the care of our president for education, demands great responsibility on regional education employees.

# MÜASİR TƏHSİL SİSTEMİ QARŞIYA YENİ VƏZİFƏLƏR QOYUR

**Afət Allahverdiyeva**
***Qubadlı Rayon Təhsil Şöbəsinin müdiri***

***Açar sözlər:*** *dərs, monitorinq, innovasiya, yeni təlim üsulları.*
***Ключевые слова:*** *урок, мониторинг, инновация, новые учебные методы.*
***Key words:*** *lesson, monitoring, innovation, new teaching techniques.*

Birləşmiş Millətlər Təşkilatı XXI əsri “təhsil əsri” adlandırmışdır. Çünki müasir dünyada hər bir ölkənin uğurlu gələcəyi həmin ölkədə təhsilin səviyyəsi ilə müəyyən olunur. Möhtərəm Prezidentimiz İlham Əliyev cənabları təhsilə yüksək qiymət verərək demişdir: “Təhsil Azərbaycanda davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biridir.” Təhsil sistemi müstəqil Azərbaycan vətəndaşının ümumi dəyərlərini bölüşdürən bir vətəndaş formalaşdırmalı, qloballaşan və müasir dünyada rəqabətli, peşəkar biliklərə malik bir insanı, bir məhsulu yetişdirməlidir. Bu vəzifələr ilk növbədə məktəbin üzərinə düşür. Çünki müasir məktəb-ailənin, cəmiyyətin və dövlətin maraqlarına uyğun olaraq, zəruri biliklərə, həyati bacarıqlara yiyələnən, əxlaqi-mənəvi dəyərlər zəminində tərbiyə alan vətəndaş yetişdirmək vəzifəsini keyfiyyətlə yerinə yetirməlidir.

Bunun üçün qarşıya müəyyən şərtlər daxilində tələb olunan çox mühüm vəzifələr qoyulmuşdur.

Qubadlı rayonu timsalında demək olar ki, əsas vəzifələrin yerinə yetirilməsi üçün mühüm şərtlərdən biri və həm də birincisi hər bir məktəbin iş şəraitinin əsaslı şəkildə yaxşılaşdırılmasıdır.

Dövlət başçısı cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı sayəsində respublika miqyasında yeni tikilmiş, əsaslı təmir edilmiş məktəb binalarının sayı durmadan artmaqdadır. Bunu rayonumuzun timsalında da görmək olar. Belə ki, cari ildə şagird kontingenti ildən-ilə güclənən Çaytumas məktəb-liseyinin binasına əlavə olaraq 6 sinif otağı, akt zalı tikilmiş, Çardaxlı tam orta məktəbi üçün əlavə 4 sinif otağı şagirdlərin istifadəsinə verilmişdir.

İkinci əsas məsələ, məktəbdə şagird kontingenti, onun artması və azalmasının diqqətdə saxlanılmasıdır.

Bu baxımdan 2012/2013-cü tədris ilində rayonun Xanlıq-3, Fərcan, Y.Mollu, Çaytumas, A.Mollu, Hal, Qaralar və Çardaxlı məktəblərində şagird artımı müşahidə edilmiş, Şəhər 1 nömrəli, Mahmudlu, Qəzyan və Mərdanlı məktəblərində isə şagird nisbəti sabit saxlanılmışdır. Bununla yanaşı bəzi məktəblərdə 1-7 nəfər daxilində şagird azalmaları olmuşdur ki, bu da şagirdin yaşadığı ailənin yaşayış yerini dəyişməsi ilə bağlıdır.

Ən əsas və başlıca məsələlərdən biri kimi məktəbə rəhbərlik bacarığı, məktəbdaxili intizamın gözlənilməsi də qarşıda duran vəzifələrin həlli üçün böyük əhəmiyyət kəsb edən məsələlərdəndir. Nə qədər müasir, zəngin maddi-texniki bazaya malik məktəb olsa da, əgər orada yüksək rəhbərlik bacarığına malik rəhbər və bunun müqabilində məktəbdaxili intizam yoxdursa, həmin məktəb heç vaxt əxlaqi-mənəvi dəyərlər zəminində tərbiyə alan vətəndaş yetişdirmək vəzifəsini yerinə yetirə bilməz. Rayonumuzda işinin öhdəsindən gələn məktəb rəhbərləri, güclü məktəbdaxili intizamı olan məktəblər

az deyildir. Belə məktəblərə Çaytumas məktəb-liseyini, Şəhər 1 və 2 nömrəli, Mahruzlu, Qəzyan, Xələc, Mahmudlu, Hal tam orta məktəblərini misal göstərmək olar.

Hər bir təhsil müəssisəsinin müvəffəqiyyətinin əsas və başlıca səbəblərindən biri də təhsil verənlərin keyfiyyətli təhsil vermə bacarığıdır. Bu əsas məsələ, təbii ki, müəllimlərin, yəni təhsil verənlərin səviyyəsini, onların keyfiyyətli təhsil vermələrini aşkarlayır. Bu da həqiqətdir ki, hər hansı məktəbdə peşəsinin vurğunu olan, öz ixtisasını gözəl bilən hətta bir müəllim varsa, o, sözsüz ki, məktəbin bütün şagirdlərini arxasınca aparacaqdır, şagirdlərin ixtisas seçimində özlərində inam yaradacaqdır. Təəssüflə qeyd etmək lazımdır ki, belə müəllimlər azlıq təşkil edir. Lakin bu gün rayon məktəblərində işinin öhdəsindən gələ bilən, peşəsinə vurğun olan, ixtisasını dərindən bilən, fədakar müəllimlərimiz az da olsa vardır. Belə müəllimləri aşkarlamaqda, təbii ki, keyfiyyət göstəricilərini açıqlayan fənn monitorinqlərinin rolu böyükdür. Həmişə olduğu kimi cari ildə 4-5-6 və 7-ci siniflər üzrə yalnız Sumqayıt şəhərində fəaliyyət göstərən məktəblərdə təhsil şöbəsi tərəfindən keçirilən monitorinqlər zamanı həmin məktəblərin keyfiyyət göstəriciləri müəyyən edilmişdir.

Məlum olmuşdur ki, Xələc, Mərdanlı, Mahruzlu, Mahmudlu və Hal məktəblərində keyfiyyət göstəricisi daha yüksək, şəhər 4 nömrəli məktəbində isə çox aşağıdır.

Müasir dövrün səciyyəvi xüsusiyyətlərindən biri də İKT-nin istisnasız olaraq hər bir fəaliyyət sahəsinə nüfuz etməsidir. Hazırda İKT-dən istifadə bacarıqlarına yiyələnmədən inkişafa nail olmaq mümkün deyildir. Möhtərəm Prezidentimizin 2013-cü ili İKT ili elan etməsi ilə bağlı sərəncamı da bu sahədəki çətinliklərin tədricən aradan qaldırılması məqsədi daşıyır. Bu isə məktəblərimizdə təhsil alan şagirdlərin İKT-nin imkanlarını hərtərəfli mənimsəmələrini zəruri edir. Belə bir dövrdə, əlbəttə, çox vacib məsələlərdən biri kimi rayon məktəblərinin kompyuterlərlə təminatı əsas vəzifə olaraq qarşıya qoyulmuş və bu istiqamətdə müəyyən işlər görülmüşdür. Hazırda şagirdlərin istifadəsində 316 ədəd kompyuter (hər 20 şagirdə 1 kompyuter), 9 ədəd noutbuk, 13 ədəd proyeksiya aparatı vardır. 30 məktəbdə kompyuter kabinetləri yaradılmışdır. Məktəblərdə çoxlu sayda müxtəlif fənlərdən elektron təlim materialları, eləcə də digər əyani vəsaitlər var. Amma məktəblərdə kompyuter kabinetlərinin yaradılması və digər vəsaitlərin verilməsi işin yalnız bir tərəfidir. Daha vacib iş, onlardan səmərəli istifadə etmək bacarığıdır. Təbii ki, əgər gözlənilən səviyyədə istifadə olunarsa, bu, təlimin keyfiyyətinə əsaslı təsir göstərər. Bu sahədə məktəb rəhbərlərinin üzərinə böyük məsuliyyət düşür. Ona görə də bütün imkanların səfərbər olunması, bu vacib işin yerinə yetirilməsinə çalışılması diqqət mərkəzində saxlanır. Etiraf etmək lazımdır ki, bu gün tədris prosesində hələ də bir çox müəllimlər əvvəlki ənənəvi təlim üsullarından istifadə edir, yeniliklərdən çəkinirlər. Amma zamanın tələbi budur ki, müasir müəllim çox çalışmalı, yaradıcı olmalıdır ki, kompyuter əsrində yaşayan, demək olar ki, hər cür texniki vəsaitdən baş çıxaran şagirdin diqqətini özünün istədiyi istiqamətə yönəldə bilsin.

Ümumi orta və tam orta təhsil kursları üzrə mərkəzləşdirilmiş buraxılış imtahanlarının keçirilməsi təhsilin keyfiyyət göstəricilərinin yaxşılaşdırılması baxımından olduqca əhəmiyyətlidir.

Bütün illərdə mərkəzləşdirilmiş buraxılış imtahanlarında rayonun ümumtəhsil məktəblərinin göstəriciləri 92-98 % təşkil etmişdir. 2012-2013-cü tədris ilinin yekun mərkəzləşdirilmiş buraxılış imtahanlarının nəticələrinə görə də 92% nəticə ilə rayon təhsili Sumqayıt və Bakı təhsilindən öndə

olmaqla Respublikada ən yaxşı nəticə göstərən rayon kimi qiymətləndirilmişdir. 2012/2013-cü tədris ili və eləcə də əvvəlki illərdə qeyri-kafi qiymət alan bütün məzunlara attestat, qeyri-kafi alan IX sinif şagirdlərinə isə şəhadətnamə verilməsi də rəğbətlə qarşılanmışdır.

Cari ildə rayon məktəblərini bitirən 339 nəfərdən 286 nəfəri (83%) ali məktəblərə sənəd vermişdir. Sənəd verənlərin 58%-i ali məktəblərə qəbul olunmuşdur. Onlardan 10 nəfəri 600-dən yuxarı nəticə göstərmişdir. Belə ki, Şəhər 3 nömrəli tam orta məktəbin şagirdi İmanov Elməddin 600 balla ADNA-ya, Qaralar kənd tam orta məktəbin şagirdi Mehdiyeva Gülnar 602, Dəmirçilər kənd tam orta məktəbin şagirdi Təhməzov İsa 667, Çaytumas kənd tam orta məktəbin şagirdi Atakişiyeva Şəfəq 607, A.Mollu kənd tam orta məktəbin şagirdi Dünyamalıyeva Nərmin 614 balla BDU-ya, Qaralar kənd tam orta məktəbin şagirdi Rzayeva Gülnar 618, Xanlıq tam orta məktəbin şagirdi Mehrəliyeva Xədicə 643, A.Mollu kənd tam orta məktəbin şagirdi Səmədova Sahibə 621 balla ADU-ya, Xanlıq 3 nömrəli tam orta məktəbin şagirdi Babayeva Xəyalə 627 balla Qafqaz Universitetinə, Qaralar kənd tam orta məktəbin şagirdi Nəcəfov Heydər 634 balla Ali Neft məktəbinə qəbul olunmuşlar.

Şagirdlərin dünyagörüşünün qabiliyyət və bacarığının formalaşmasında məktəbdənkənar və sinifdənxaric tədbirlər xüsusi rola malikdir. Şöbədə istedadlı şagirdlərlə aparılan işlərin yeni texnologiyalar əsasında qurulmasına diqqət artırılmış, bunun da nəticəsində fənn olimpiadalarının respublika mərhələsində 6 nəfər iştirakçı olmuşdur.

Hər il olduğu kimi, bu il də bütün məktəb kollektivləri il daxilində tarixi və əlamətdar günlər münasibətilə diqqətçəkən tədbirlər keçirməklə məktəb şagird kollektivinin məktəbdən və sinifdəkənar tədbirlərdə fəallıqlarını formalaşdırmış, ayrı-ayrı şagirdlərin istedad və bacarıqlarının aşkar edilməsinə şərait yaratmışlar. Xocahan, Çaytumas, A.Mollu, Mahruzlu, Mahmudlu, Xələc məktəblərində bütün tarixi günlər, bayramlar, həmçinin görkəmli ictimai-siyasi xadim, yazıçı və şairlərin yubileylərinin keçirilməsi istiqamətində öz əlamətdarlığı ilə daha yaddaqalan tədbirlər, insan hüquqları, narkomaniyaya qarşı mübarizə ilə bağlı və digər əhəmiyyətli mövzularda dəyirmi masalar keçirilmişdir. Vətənpərvərlik tərbiyəsinin aşılanması istiqamətində aparılan məqsədyönlü işlərin nəticəsidir ki, “Şahin” hərbi idman oyununda şəhər 2 nömrəli tam orta məktəbin komandası artıq 3-cü ildir şimal bölgəsi üzrə zona yarışında iştirak edən 11 rayon içərisində I yerə layiq görülərək respublika birinciliyinə vəsiqə alırlar. Cari ildə də respublikada öncül yerlərdən birinə sahib olmuşlar. Bu tədbirlərin keçirilməsində hərbi komissarlıq, hüquq mühafizə orqanları və rayon gənclər idman şöbəsinin əməkdaşlarının da yaxından köməkliyi qeyd olunmalıdır.

Ümummilli lider H.Əliyevin anadan olmasının 90-cı ildönümü münasibəti ilə silsilə tədbirlər həyata keçirilmişdir. Xocahan məktəbinin şagirdi “Heydər Əliyev məktəblilərin gözü ilə” Respublika inşa yazı müsabiqəsində iştirak edərək uğur qazanmışdır. Ümumtəhsil məktəbləri arasında təşkil olunmuş “Bilik yarışı”, “Şən startlar” idman yarışı çox yaddaqalan, güclü rəqabətə səbəb olan bir yarışma olmuşdur. Eyni zamanda məktəb şagird və müəllimləri arasında idman, şahmat üzrə müxtəlif yarışların keçirilməsi də artıq ənənəyə çevrilmişdir.

Təhsil şöbəsinin tabeçiliyində olan məktəbdənkənar müəssisələrin fəaliyyəti də nəticəsiz olmamışdır. Dəfələrlə zona yarışlarında müvəffəqiyyətlə iştirak edən müdavimlər həmişə diplom və “Fəxri fərman”-lara layiq görülmüşlər.

Məktəblərin pedaqoji proseslərdə əldə etdikləri nəticələrdə maddi-texniki bazanın, eləcə də yeni dərs ilinə hazırlığın təşkili xüsusi əhəmiyyət kəsb edən məsələlərdəndir. Yuxarıda qeyd edildiyi kimi, bütün ümumtəhsil məktəblərində cari, Çaytumas məktəb-liseyində isə əsaslı təmir işləri aparılmışdır.

Yerli büdcə vəsaiti hesabına, cəmi 164553 manat dəyərində məktəb rəhbərlərinin sifarişi əsasında tələb olunan inventar, avadanlıq, zəif imkanlı məktəblilər üçün 342 ədəd məktəbli dəsti alınıb məktəblərə verilmişdir. Hər il olduğu kimi, bu il də Heydər Əliyev fondu tərəfindən verilmiş 922 ədəd məktəbli çantası bütün ləvazimatları ilə birgə, məktəblərə çatdırılmışdır. Təhsil Nazirliyi bütün məktəb şagirdlərini pulsuz olaraq 12000 dərsliklə təmin etmişdir. Eyni zamanda cari ilin yanvar və fevral aylarında bütün məktəb rəhbərləri nazirliyin tələbi əsasında “Mədəd” təşkilatı tərəfindən İKT, 5-ci və 6-cı siniflərdə dərs deyəcək fənn müəllimləri isə iyul və avqust aylarında kurikulum üzrə xüsusi kurslardan keçmişlər. Artıq neçə illər olduğu kimi bu il də bütün məktəblərdə məktəb rəhbərlərinin təşəbbüsü ilə pulsuz olaraq 1-ci sinfə qəbul olunacaq uşaqlarla hazırlıq kursları təşkil edilmişdir.

Göründüyü kimi, ötən dərs ilində qarşıya qoyulmuş vəzifələrin həlli istiqamətində xeyli işlər görülmüşdür. Bu işlər Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təhsilə xüsusi diqqət və qayğısı, Təhsil Nazirliyinin güclü tələbkarlığı və nəzarəti sayəsində yerinə yetirilmişdir.

Təhsil naziri cənab M.Cabbarovun son dövrlər təhsil sahəsində atdığı humanist addımlar da göstərir ki, bu sahədə ciddi yeniliklərin başlanğıcı qoyulmuşdur, çox yaxın gələcəkdə təhsilimizdə böyük uğurlar qazanılacaqdır. Burada ölkə Prezidentinin daha bir fikrini yada salmaq yerinə düşər: “Oxumaq hamıya lazımdır. Azərbaycanda təhsilin səviyyəsi artır və biz buna çox sevinirik. Biz istəyirik ki, gənc nəsil bilikli, savadlı olsun, eyni zamanda vətənpərvərlik ruhunda tərbiyə alsın. Gələcəkdə həm özlərini təmin etsinlər, cəmiyyətdə özlərinin yerini tutsunlar, eyni zamanda ölkəmizin ümumi inkişafına öz töhfələrini versinlər.” Bu müddəalara əməli cavab olaraq Qubadlı rayonunun təhsil işçiləri daha məsuliyyətlə işləməklə qarşıda duran vəzifələrin layiqincə yerinə yetirilməsi üçün səylə çalışacaqlar.

*Rəyçi: dos. Ə.Abbasov*

**А.Аллахвердиева**

**Современная образовательная система и новые задачи**

**Резюме**

В статье говорится об удачах в области образования в последние годы. Она касается анализа проблем, ожидающихся в будущем. Также говорится о роли сотрудничества между учителем и учениками.

**A.Allahverdiyeva**

**Modern education system demands new duties**

**Summary**

In this article it is spoken about achievements gained in the recent years. Upcoming challenges are mentioned. It is spoken about the role of teacher-student cooperation in achievement of success.

***Tərbiyə məsələləri***

# UŞAQLARA SEVİNC BAĞIŞLAMAQ QAYƏSİ

**Zahid Xəlil**
***Azərbaycan Dövlət Pedaqoji İnstitutunun kafedra müdiri, filologiya elmləri doktoru, professor***

**Uşaq xəyalı bəzən ağ buludların cərəyanına qoşulub uçur, aydınlıq gecələrdə sayrışan ulduzlar içində gəzib seyr edir, ayla batır, günlə doğur, dərin dəryalarda qəvvas kimi üzür, keçilməz ormanlardan, dağlıq və qayalıqlardan öz zərif ayaqları ilə keçir, şirlər və pələnglərlə pəncələşir. Biz bütün bu sonsuz xəyallar dünyasında qəhrəmanlıq, yüksəliş, uca arzular və əməllər görürük.**

**Səməd Vurğun**

***Açar sözlər:*** *humanizm, əqidə təmizliyi, daxili monoloq, təsviri sənət.*

***Ключевые слова:*** *гуманизм, прозрачность убеждений, внутренний монолог, изобразительное искусство.*

***Key words:*** *humanism, faith, monologue, descriptive art.*

Məktəblilərimizin seçdiyi şairlər içərisində Ə.Cəmilin xüsusi yeri var. Azərbaycan lirik şeirinin misilsiz ustadı, özünəməxsus deyim tərzi ilə müasirlərindən fərqlənən “Can nənə, bir nağıl de...”, “Qaçqınlar”, “Nişan üzüyü” kimi süjetli əsərlərin, “Laylay”, “Dünyanın gözəlliyi”, “Bahar azadlığım, səadətimdir”, “Gülür günəş, gülür çəmən” kimi lirik şeirləri dillər əzbəri olan Ə.Cəmilin bu il 100 yaşı tamam olur. Bu əsərlər 30-cu illərdən üzü bəri yaranan poeziyamızın ən yaxşı nümunələrini təşkil edir. Müharibənin ən ağır illərində belə qələmindən incilər tökülən Ə.Cəmilin poeziyasındakı bu güc hardandır? Bunun əsərlərinin bu qədər sevilməyinin sirri nədədir? Bu suallara cavab tapmaq üçün Ə.Cəmilin yaradıcılığını nəzərdən keçirək. Ə.Cəmil elə ilk qələm təcrübələrini yaradarkən hiss etdirdi ki, o, müasiri olduğu cavan nəslin ideya qardaşı olsa da lirik şeir yazmaq üslubu tam özünəməxsusdur. Onu qələm yoldaşlarından fərqləndirən cəhətlər şairin 30-cu illərin sonu və 40-cı illərdə yazdığı şeirlərdə daha parlaq görünməyə başladı. Həmin illərdə yazdığı “Can nənə, bir nağıl de”, “Nişan üzüyü”, “Qaçqınlar” kimi şeirləri Ə.Cəmili süjetli lirikanın mahir ustası kimi tanıtdı. Ə.Cəmil şeiri ədəbiyyatı təqlidçilikdən, folkloru yamsılamaqdan, yalançı hay-küyçülükdən çıxarıb orijinal poeziya yaratmaq yoluna qoydu. Sonralar həmin bulaqdan su içən onlarla cavan şair gözəl şeir nümunələri yaratdı. Həmin poeziyaya xas olan əsas cəhət hər sözün poetik yükünün olması, fikrin aydınlığı, inamlı deyim tərzidir.

Ə.Cəmil ilk lirik əsərləri ilə humanizm carçısı, insanın yüksək ideallarının tərənnümçüsü olduğunu nümayiş etdirdi. Bu əsərlərdə güclü enerji, gələcəyə parlaq ümid-

lər, sarsılmaz ruhi qüvvə mövcud idi. Ə.Cəmilin lirikasında həyata tükənməz məhəbbət duyğusu aşıb-daşırdı. Bu əsərlər üzdən sakit axan, amma altdan iri daşları belə öz burulğanında batırmağa qadir olan Kür çayına bənzəyirdi. Müdriklik bu poeziyanın sadəliyində, həyatın böyük həqiqətlərinin ifadəsində idi. O, həyatın gözəlliyinə artıq rənglər vurmur, onun təbii boyalarına isə toxunmurdu. Bu şeirləri oxuyanda hiss olunur ki, ədəbiyyat tariximizin inkişaf zəncirində Ə.Cəmil poeziyası xüsusi bir həlqədir. Bu poeziya ədəbiyyat dənizinə tökülən elə bir çeşmədir ki, sonralar bu bulağın suyundan bəhrələnməyən bir şair təsəvvür etmək çətindir. Bu poeziyada ürəyə məlhəm olan səhər mehinin ilıq nəfəsi, sakit axan çeşmələrin lətafəti var.

Bu poeziyada həyata bağlılıq, qurub yaratmaq ehtirası, həyatın gözəlliyini duymaq və ona məhəbbət yaratmaq bacarığı çox güclüdür.

Bədii ədəbiyyatda işlənən hər bir söz təkcə fikir daşıyıcısı deyil, həm də insanlara müsbət impuls verən enerji mənbəyidir. Xalq çox sadə dildə bunu belə ifadə edir: “Hoho var, dağa çıxarır, hoho var dağdan endirir”. Xalqın “hoho” şəklində ifadə etdiyi məfhum sözdür. Sözün canında enerji nə qədər çox olsa, o insanı nəinki dağa, hətta uca səmalara qaldıra bilər.

Ə.Cəmil poeziyasında diqqət çəkən mühüm bir cəhət şairin əqidə təmizliyidir. Bu poeziyanın məqsədi insanlara xoş duyğular, ləyaqətli hislər aşılamaqdır.

Biz dünyaya gəlmişik,
Səhraya meşələrdən,
Dərələrə lalədən,
Dağlara şəlalədən
Özü boyda don biçək.

**(Dünyanın gözəlliyi)**

Bu, təmiz, ləyaqətli bir əqidə sahibinin düşüncələridir. Bu poeziyanın məqsədi bəşəriyyətə xidmət etməkdir. Onun tərkibində boğazdan yuxarı deyilən söz tapmaq mümkün deyil. Arıya şəkər tozu versən saxta bal alacaqsan. Əhməd Cəmil poeziyasının damarlarından axan qan təmiz olduğu üçün o, bulaq suyu kimi şəffaf, nəğmələri dağ şəlaləsi kimi həzindir.

Sözlə portret yaratmaq, təsvir olunan hadisəni oxucunun gözü qarşısında canlandırmaq Ə.Cəmil poeziyası üçün son dərəcə xarakterikdir. Bu cəhətlər şairin “Laylay”, “Məni yada salırmı”, “Can nənə, bir nağıl de” şeirlərində xüsusilə bariz şəkildə görünür.

Bu şeirləri oxuyanda oxucunun gözü qarşısında sevgi nəğməsi zümzümə edə-edə bulaqdan su dolduran xoşbəxt çöhrəli bir qız canlanır. Onun ürəyi sevgi ilə doludur. Görəsən, müharibə bu sevgini məhv edə bilməyib ki? Görəsən, o qız bulaq başına gələndə ürəyində və dilində sevgi zümzüməsi qalıbmı? Bunu qızın başının üstündə dövrə vuran quşlar, bir də dünyanı belədən belə gəzən buludlar görə bilər. Lirik qəhrəmanın ürəyində elə bir güman var ki, qanlı müharibə o sevgi zümzüməsini söndürə bilməyib.

Düzlər oddur, dağlar duman, sular qan...
Qan içində batır günəş, sökür dan...
Yanır ellər, yanır vətən torpağı,
Yoxsa, quzum, budur səni ağladan?

Bu da müharibənin dəhşətli bir mənzərəsi. Göydən od yağır, günəşin doğması da, batması da bu alovun içində baş verir. Bu yanğın hamını – böyükləri də, uşaqları da ağladır.

Nənə yığır düyünçəyə iynəsini, sapını,
Külək hərdən taqqıldadır pəncərəni, qapını.
Körpə çəkir təzə, güllü yorğanını üzünə,
Gözlərini yumur... amma yuxu getmir gözünə.

**(Can nənə, bir nağıl de)**

İynəsini, sapını düyünçəyə yığan nənənin və yatmağa hazırlaşan nəvənin portre-

ti yaradılmışdır. Üzdə sakit görünsə də nənənin daima oğlunun yanında olan ürəyi narahatdır. “Külək hərdən taqqıldadır pəncərəni, qapını” misrası da təsadüfi deyil. Sanki təbiət nənənin nəvəsini ovutmaq üçün söylədiyi yalanın üstünü açmaq istəyir. Amma müəllif süjetin sükanını möhkəm saxlayır. Uşağın yatdığını və gözəl yuxu gördüyünü təsvir edir.

Ə.Cəmilin böyük istedadı onun süjetli əsərlərində çox parlaq şəkildə görünür. Süjetli əsərlər o qədər də çox deyil: “Can nənə, bir nağıl de”, “Nişan üzüyü”, “Qaçqınlar”. Bu əsərlərdə şairin bir sıra sənətkarlıq bacarıqları üzə çıxır. Süjetin mükəmməlliyi, adi bir ştrixlə obrazın daxili aləmini açmaq bacarığı, bədii nitqin sərrastlığı bu əsərləri poeziyamızın üzük qaşı səviyyəsinə qaldırmışdır. Müharibənin gətirdiyi fəlakətləri əks etdirmək baxımından “Qaçqınlar” şeiri xüsusilə xarakterikdir. Məzmununun dolğunluğuna görə güclü bir poema təsiri bağışlayan bu əsəri sakitcə oxumaq mümkün deyil. Əsərdə olan təsvirlər, dialoqlar çox yığcamdır. “Qaçqınlar” sanki böyük dramatik poemanın kiçildilmiş modelidir və həmin modeldə poemaya xas olan bütün cəhətlər var.

Müharibənin ən ağır illərində yazılan bu şeiri dəmirçi kürəsində qızdırılıb döyülən və gözəl bir şəklə salınan təsviri sənət əsərinə bənzətmək olar. Sözlər, təsvirlər o qədər mükəmməldir ki, bu sarayın bir kərpicini belə başqasıyla əvəz etmək mümkün deyil .

Taxt üstündə ana-bala oturublar yanaşı,

Gör, necə də qələm çəkib təbiətin nəqqaşı:

Biri qəmli son bahardır, biri gülərüzlü yaz!

Hələ bilmir bu dünyada qüssə nədir qızcığaz.

**(Qaçqınlar)**

Ana da, qızı da çiçəkdi. Biri təzəcə açılan bahar ətri verən gözəl bir qönçədir. O biri payız çiçəyidir. Biri atılıb-düşmək, oynamaq, xoşbəxt olmaq istəyir. O biri sakitcə dayanmağı da qənimət bilir. Çünki vətəndən didərgin düşən bu insanlara azğın faşist soldatları sükutu da çox görə bilər. Ana vəziyyətin gərginliyini duyur, hər an onu balasından ayıra bilərlər. Ölüm təhlükəsini hiss edən ana uşağının ən gözəl paltarlarını geyindirir, ona doyunca baxmaq istəyir. Ana qəşəng paltarlarını geyinən uşağına dərin kədər içində baxır. Ürəyinin harasındansa bir sevinc qığılcımı da keçir. Ana bu sevinc anlarının az olduğunu, hər an qurtara biləcəyini dərk edir. Uşaq isə elə güman edir ki, anası onu gəzməyə aparacaq. Buna görə sevinir. Beləliklə, xoşbəxtliklə bədbəxtliyin üz-üzə, göz-gözə dayandığı dramatik bir səhnə yaranır.

- Can ana, biz gəzməyəmi gedəcəyik?
- Yox, qızım!
- Niyə, ana?
- Qürbət eldə hara gedək, a quzum?
- Axı, çiçi paltarımı geydirəndə, ay ana,

Sən gəzməyə aparardın hərdən məni bir yana...

Bu sadə dialoq mürəkkəb bir situasiya yaradır. Bu situasiyanın bir komponenti insanları məhvə aparan faşizm, o biri öz sadə həyatını sevən, yaşamaq istəyən insandır. Bu insanın heç bir qəbahəti olmadığı halda müharibənin amansız qanunları onu faciə ilə üzləşdirir. Bu faciədən çıxış yolunu tapa bilməyən insan zamanın əlindən kiçik bir təsəllini qapmaq istəyir.

Sözün məna yükünü artırmaq, bir-iki kəlmə ilə adi bir eyhamla obraz yaratmaq məharəti Ə.Cəmil poeziyasının xarakterik cəhətlərindən biridir. Onun şeirdə yaratdığı situasiyalar isə təkcə oxucunu heyrətləndirməyə xidmət etmir. Şair bu situasiyalardan istifadə edərək işlətdiyi hər bir sözün təsir gücünü artırır.

Səndələyib iki sərxoş soldat girdi içəri...
Gözlərinə qan sağılmış bir gestapo nəfəri
Oğrun-oğrun evi süzdü... o birisi irişdi:
(Qızsa qorxub anasının qucağına girmişdi)

**(Qaçqınlar)**

Oğrun-oğrun evi süzən soldatın niyyəti haqqında əlavə söz deyilmir. "Oğrun-oğrun evi süzdü" sözləriylə şair qarətçi soldatın obrazını yaradır. İkinci əsgərin xarakterini isə cəmi bir sözlə - "irişdi" kəlməsi ilə açır. Bu sözün sinonimi çoxdur. Amma bu situasiyada həmin söz həm əsgərin niyyətini – pozğun simasını göstərir, həm də psixologiyasını açır. "Bu dünyada ümid azdır sabaha! Ümid azdır, ha, ha, ha!..." deyən soldatın qarşılaşdığı bu qadınla müqayisədə nə qədər cılız olduğu görünür. Onun həyat fəlsəfəsinin çürüklüyü üzə çıxır. "Dedim qızım, bu paltarda sənə baxım doyunca" deyən qadınınsa ailəsinə, övladına, vətəninə bağlılığı, ərinə sədaqəti görünür. Bu səhnədə həyat haqqında iki düşüncə tərzi üz-üzə gəlir. Şair bu qarşılaşma vasitəsi ilə oxucuda haqsızlığa, çürük həyat fəlsəfəsinə nifrət oyatmaqla yanaşı, bəşəri duyğuların, vətən-övlad sevgisinin əbədiliyinə inam hissi aşılayır. Vətənini, ərini itirən qaçqın ananın ürəyinə damıb ki, fəlakət çox da uzaqda deyil. Ana bu fəlakət anlarında xoşbəxt günlərinin bircə dəqiqəsini yaşamaq istəyir. Bu bir dəqiqəni ağır günlərin əlindən zorla qapmaq istəyən ana daxilən nə qədər də güclüdür. Bircə anın xoşbəxtlik duyğusu azğın düşmən üzərində onun qələbəsidir. Şübhəsiz ki, ana bir saniyəlik xoşbəxtliyi üçün çox gərgin situasiyalar yaşayır. Məhəbbət duyğusu azğın düşmənin ana ilə balanı ölümə sürüklədikləri vaxt daha yüksək zirvəyə qalxır.

- Yaxşı xanım, götür qızı, qalx, gedək! -
Lakin ana nə sezdisə soldatın bu sözündən,
Tez o yazıq qızcığazı kənar etdi özündən.
- Yox! Allaha and verirəm!..
Yox, yox! Allah eşqinə...
Aparmayın o körpəni!
Aparmayın, ah... o nə...
O, nə qızım, nə qohumum, nə bir kəsim deyildir...
Özgələrin uşağıdır, saxlayıram üç ildir! –
Soldat çəkib tez qadını qapıya səmt apardı.
Ürək dələn hıçqırıqla körpə şivən qopardı.

**(Qaçqınlar)**

Bu poema dünyanı fəlakətə sürükləyən müharibə törədənlərə bir ittihamdır.

Yeri gəlmişkən deyim ki, Ə.Cəmil Azərbaycan uşaq ədəbiyyatının ən parlaq simalarındandır. Onun əsərlərinin öyrədici xarakteri, humanist keyfiyyəti, uşaqlara daim sevinc bağışlamaq qayəsi Ə.Cəmil şeirlərinin dillər əzbəri olmasına səbəb olmuşdur.

**З.Халил**

**Цель – дарить детям радость**

**Резюме**

Статья посвящается творчеству талантливого поэта Ахмеда Джамиля, в чьих лирических стихах выражаются желания и чувства детей.

**Z.Khalil**

**To make the children happy**

**Summary**

The article is dedicated to the beloved poems by great poet Ahmad Jamil and his lyrics are treasured highly.

# ŞANLI NƏSİLLƏRİN YADİGARI

**Təranə Rəhimli**
***filologiya üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *poeziya, müasir, vətən, ədəbi qəhrəman, novatorluq xüsusiyyətlər.*
***Ключевые слова:*** *поэзия, современная, родина, художественный герой, новаторские особенности.*
***Key words:*** *poetry, contemporary, native land, artistic hero, innovative special features.*

Azərbaycan poeziyasına yeni ruh gətirən, onun inkişafına təkan verən şairlər içərisində Nigar Rəfibəylinin öz yeri vardır. Orta məktəb illərində şagirdlər çağdaş milli ədəbiyyatımızın bir neçə qadın şairinin adını tez-tez eşidirlər: Nigar Rəfibəyli, Mirvarid Dilbazi, Mədinə Gülgün, Hökumə Billuri və b. Lakin onlar bu sıralamada adı həmişə birinci çəkilən Nigar Rəfibəylinin nə tərcümeyi-halının ağır kədər qatını bilirlər, nə yaşının gənc çağlarında siyasi rejimin təzyiqlərinə, təqiblərinə məruz qaldığından, nə də mənsub olduğu nəslin, soy-kökün əsilzadəliyi ucbatından, millətinə sədaqəti üzündən çəkdikləri əzablardan xəbərdar olurlar. Ancaq şairin dillər əzbəri olan bir neçə şeiri bu poeziyanın mayasında, cövhərində dərin bir ağrının, dərdin, kədərin varlığından xəbər verir. Şairin misralarında məharətlə “gizlənən” kədər bu şeirlərin müəllifinin çəkilməz qəm yükü daşıdığını, hansısa nisgili, həsrəti illərlə qəlbində əzizlədiyini pıçıldayır. 80-ci illərdə unudulmaz bəstəkar Emin Sabitoğlunun şairin sözlərinə bəstələdiyi “Neyləyim” mahnısının çox sürətlə məşhurlaşması, Akif İslamzadənin yanıqlı səsi ilə bütün Azərbaycanı evbəev dolaşması, könülbəkönül fəth etməsi də bu həzin kədərin əsrarəngiz poetik ahəngi ilə bağlıdır. “Mən işıq qızıyam, işıq övladlı” deyən şairin fotoşəkillərində, portretlərində də işıqlı çöhrəsinin nurunu bir qədər də artıran xəfif təbəssümünün altında kölgədə qalmış bu kədəri də sezmək çətin olmur.

Nigar Rəfibəylidən söz düşəndə qeyri-ixtiyari şairin “Günəşdən gənclik istədim” şeiri yada düşür. Bu şeirdə zərif ruhlu şairin yaşantılarının, arzularının, xarakterinin, bütövlükdə ömür yolunun yığcam və aydın mənzərəsini görmək mümkündür: Şair “günəşdən gənclik”, “dənizdən coşğun həvəs”, “meşədən dinclik”, “küləkdən ılıq nəfəs”, “güllərdən ətir istəyir”. O, bununla kifayətlənməyib, həm də “quşlardan iti qanad”, “yarpaqdan çətir”, “ömürdən coşğun həyat”, “dağdan əzəmət”, “insanlardan məhəbbət” istəyir. Sonra da onun bəhrəsini görür: “Nə istədim, nə istədim verdi mənə təbiət”…

Allah Nigar Rəfibəyliyə hər şeyi – ondan istədiyini də, istəmədiyini də səxavətlə vermişdi. Hamıya gün kimi aydındır ki, mənsub olduğumuz soy-kökü, doğulduğumuz ailəni seçmək imkanımız olmur. Nigar xanımın Allahdan istəmədən ona bəxş etdiyi xoşbəxtliklərdən birincisi dövrünün nüfuzlu şəxsiyyətlərindən biri, əzəmətli, əsilzadə bir nəslin nümayəndəsi, Azərbaycan Xalq Cümhuriyyəti dövründə Gəncə qubernatoru olmuş, Azərbaycanın ilk ali təhsilli cərrahı Xudadat bəy Rəfibəylinin ailəsində dünyaya göz açması ilə bağlı idi. Yaşadığı şərəfli ömürdə öz soy-kökünün adını əməlləri ilə,

uca şəxsiyyəti ilə daha da yüksəklərə qaldıran N.Rəfibəyli şeirlərində ulu bir nəslin yadigarı olduğunu iftixarla dilə gətirir: "Mən könül mülkünün tacidarıyam, xəyal dünyasının şah nigarıyam, vətən torpağında iftixar olan şanlı nəsillərin yadigarıyam".

İlk olaraq genlərdən, qan yaddaşından ruhuna axan kübarlıq, ziyalı ailə mühitində günbəgün zənginləşən mənəvi dünyası N.Rəfibəylinin gələcəkdə milli ədəbi şəxsiyyət kimi formalaşmasında başlıca amil rolunu oynadı. Lakin eyni zamanda, bolşevik işğalından sonra milli hökumətin səlahiyyətli nümayəndəsi kimi dərhal cəzalandırılan atasının və şanlı soy-kökünün adı müəyyən vaxt dönəmində şairi kommunist rejiminin təbliğatçılarının "diqqət mərkəzində" saxladı. N.Rəfibəylinin gənc yaşlarında yaradıcılığında milli ideologiyanı əks etdirən, "əksinqilabi mövqedən yazılmış" şeirlərinə hücum edən sovet mətbuatı onu "öz ulularının işini davam etdirən", "Müsavatçı mülkədarın qızı" kimi təqib edirdi. Belə bir vəziyyətdə şairin bədii nailiyyətlərinin, sənət uğurlarının, sovet dövrü ədəbiyyatının görkəmli sənətkarlarından biri səviyyəsinə yüksəlməsinin hansı mürəkkəb situasiyaların, ziddiyyətlərin içindən keçdiyini təsəvvür etmək çətin deyil. Onun həyat yolundakı maneələri dəf etmək bacarığı isə bu maneələrdən daha güclü olan xarakteri ilə bağlı idi.

İngilis yazıçısı Cefris yazırdı: "Kamil qadın yüz əlli ildə bir dəfə yaranır." Gözəllik – qeyri-adi işığı ilə hamını cəlb edən sima, yüksək intellekt, bədii istedad, ali zəka, evdarlıq səliqə-səhmanı, fövqəladə bir analıq duyğusu, xoş xasiyyət və s. bu kimi dəyərli keyfiyyətlərin vəhdətini nadir halda bir qadının şəxsində görmək olur. Nigar Rəfibəyli isə bu keyfiyyətlərin hamısını məharətlə öz varlığında cəmləşdirmişdi. O, gözəl qadın və şair kimi oxucularını həm çöhrəsinin nuru, həm də sənətinin işığı ilə əfsunlayırdı. Yüksək intellekti, kübarlığı, milli dəyərlərə sədaqəti, möhkəm, güclü xarakteri də bu işığa əlavə rəng çaları qatırdı. Şairin vəfatından ötən otuz ildən artıq vaxt dönəmində onun poeziyasına oxucu sevgisinin, rəğbətinin nəinki azalmaması, getdikcə daha da artması təkcə inci misraların ahəngdar düzümü, orijinal fəlsəfi yükü, məntiqi fikir axını ilə bağlı deyil, eyni zamanda şəxsiyyət amili ilə də sıx əlaqəlidir.

N.Rəfibəyli poeziyası əzəmət, vüqar, milli qeyrət hislərinə köklənən, Yaradana, Vətənə, təbiətə, insana sevgidən güc alan, millətinə, torpağına, "ala gözlü"sünə, övladlarına, ağaca, yarpağa, dənizə… bəslədiyi ülvi məhəbbətin qanadlarında göylərə ucalan bir poeziyadır. Bu poeziyanın əsas zinəti isə onu yaradanın qəlbindəki işıqdır. Şairin bütün şeirlərindən bu işıq selinin süzülüb keçdiyini müşahidə edirik: "Mən işıq övladı, işıq qızıyam, dünyanı qaranlıq görə bilmərəm, zülmətlə girərəm pəncə-pəncəyə, işıq yandıraram qara gecəyə".

N.Rəfibəylinin poetik dünyasının üfüqləri hüdudsuzdur, o, heç bir sədd, heç bir çərçivə tanımır. Onun şeirlərinin fikir tutumu kimi mövzuları da sərhədsizdir. Şairə görə, "Güllü bir bağça da şeir ola bilər, adi bir mətbəx də…" N.Rəfibəylinin "Mətbəx şeirləri" bu məntiqin bariz örnəyi kimi dərin təsir bağışlayır. "Mətbəx şeirləri"nin lirik "mən"i şairliklə qadınlığı bir araya sığdıran ali varlığın yaşantılarını dilə gətirir: Bu varlıq bəzən mətbəx aləmində darıxıb "səhəri dəniz qırağında qayaların üstündə açmaq", "ciyərləri dolusu dəniz havasıyla nəfəs almaq", "sahillərin gözə görünməyən səfasıyla" baş-başa qalmaq istəyir, sinəsini "səhər rüzgarına" açmaq, Abşeron bağlarına həzin nəğmələr qoşmaq arzusuyla çırpınır. Lakin ətrafına göz gəzdirib qadınlığın ayrılmaz qayğısı olan mətbəxi görür və buna təəssüflənmək yerinə "bunlar nədən şeir olmasın?" deyir. Bu orijinal yanaşma "Mət-

bəx şeirləri”nin əsas bədii məntiqini təmin edir: Şeirin mövzuları gəlməz saya, yalnız şair gözlərilə baxılarsa bu dünyaya…

N.Rəfibəylinin lirik qəhrəmanının dünyaya “kiçik mətbəx pəncərəsindən” baxan gözləri pəncərə önündəki boylu-buxunlu qovağın ilin dörd fəslində dəyişən halını izləyir, onun “əzablarla gözlədiyi” bahara sağ-salamat çıxmaq üçün şaxtayla, ayazla mübarizəsini müşahidə edir və sonda bu qənaətə gəlir ki, ürək geniş olarsa, xəyal dərin olarsa, nə arzular ölər, nə fikir sönər…könüldə bir işıq, bir atəş varsa, balaca bir mətbəxdən də böyük bir dünya görünər…

Elə bir şair tapmaq olmaz ki, vətənə şeir həsr etməsin, doğulub boya-başa çatdığı torpağı, yurd yerini, yaşadığı doğma şəhəri, ölkəni vəsf etməsin. N.Rəfibəylinin poetik yaradıcılığında da vətən sevgisi zirvədə yer alır, vətən qoxulu misralar üstünlük təşkil edir. Şair vətəni yalnız gözəlliklərindən zövq aldığı üçün, səfalı təbiətində dincəldiyi üçün sevmir, o, qürbətdə vətənin hər halı üçün qəribsəyir, Bakının Qara şəhəri üçün də, “əsəbi” küləkləri üçün də darıxır: “Şirindir vətəndə hər acı tüstü, şirindir vətənin küləkləri də!”

Şairin təkcə vətən mövzusunda yazdığı şeirlərdə deyil, məhəbbət, müharibə, təbiət və siyasi lirikasında da Vətən obrazı aydın görünür. “Komandan”, “Əlvida”, “Borcluyam”, “Təranə qucağında bizə bahar gətirdi”, “İnsan hərarəti”, “Yaxşı yol”, “Düşmən güllə yağdırırdı işığa”, “Dənizdə bir qız çimirdi”, “Eşq olsun” şeirləri müxtəlif mövzuları əhatə etsə də, onların hər birində Vətən sevgisinin izharı var. Məsələn, “Əlvida” şeirində şairin lirik qəhrəmanı istirahət etdiyi Baltik sahilləriylə vidalaşır, “suda qanad açan yelkən”ə, “qumda qalan ayaq izləri”nə, “dənizdən əsən rüzgar”a, “sahilə düzülən qağayılar”a, “yollara tökülən xəzəl”ə, şimalın “soyuq təbiətli gözəl”inə “əlvida” deyir. Lakin bu ayrılıqda kədər motivi yoxdur. Çünki bu ayrılıq vüsala yol açır, lirik qəhrəmanı başqa bir dənizə – doğma şəhərdəki Xəzərə qovuşdurur, “Gözləyir həsrətlə məni Xəzərim”, - deyir.

“İnsan hərarəti” şeirində də şimalın soyuğunda darıxan, qürbətin qış mənzərələrindən zövq almayan lirik qəhrəman vətən həsrətini dilə gətirir: “Bakının iliklərimə işləyən əsəbi küləklərini istəyirəm. Axşamları boz dumana bürünən Qaraşəhəri istəyirəm”…

Məhəbbət mövzusunda yazılmış “Yaxşı yol” şeirinin lirik qəhrəmanı isə səyahətləri sevən, tez-tez uzaq ölkələrə səfərə çıxan sevgilisinə uğurlu yol arzulayır, lakin ondan zərif bir təmənnası var: “Hara gedirsən get, mənim vətənə bağlı ürəyimi getdiyin uzaq yollara aparma, əzizim, aparma”.

Nigar Rəfibəylidən danışanda onun bədii ilhamının mənbəyində yer alan, poetik hislərinin, düşüncələrinin zirvəsini fəth edən Rəsul Rza məhəbbətindən bəhs etməmək mümkün deyil. Rəsul Rzanın layiqli bir ömür-gün yoldaşı, qəlb həmdəmi, sənət dostu kimi N.Rəfibəylinin həyatında və ədəbi fəaliyyyətində önəmli rolu danılmazdır. Rəsul Rza bütün ömrü boyu Nigar xanımın yaradıcılığını zinətləndirmiş, şairin ölməz sənət örnəklərinin yaranmasına səbəb olmuşdur. N.Rəfibəyli lirikasının şah əsəri olan “Neyləyim” öndə olmaqla, şairin ülvi məhəbbət ətirli bütün misraları bu mənbədən qidalanıb, sonsuz səmimiyyəti ilə ürəklərə yol tapıb.

Ümumiyyətlə, ədəbiyyat tariximizdə silinməz izlər qoymuş hər iki böyük sənətkarın bir-birinin yaradıcılıq imkanlarının genişlənməsində, poetik dünyasının zənginləşməsində, eləcə də möhtəşəm sənət uğurlarına yol açmasında qarşılıqlı xidmətləri olmuşdur. Nigar Rəfibəyli Rəsul Rzanın “könül mülkü”nün “şah nigarı” olduğunu bilir və bunu son dərəcə zərif poetik deyimlə şeirlərində ifadə edirdi. Rəsul Rza poezi-

yasında Nigar obrazı həmişə aydın görünür. Ədəbiyyatşünas-tənqidçi Gülrux Əlibəylinin müşahidə etdiyi kimi, "Nigar Rəfibəylinin həyat və yaradıcılığı, onun həzin hislər və incə duyğular tərənnüm edən poeziyası nəinki milli ədəbiyyat tariximizdə möhkəm yer tutmuş, eyni zamanda böyük şair, ictimai xadim Rəsul Rzanın həyat və yaradıcılığına əsaslı təsir etmişdir."

N.Rəfibəylinin böyük qadın ürəyi, şəfqətli ana qəlbi vardı. Bu qəlb təkcə üç övladı üçün döyünmürdü, yalnız onların gələcəyi üçün narahat deyildi, bütünlükdə millətinin övladlarına qayğıyla dolu idi. Şairin dostlarının, həmkarlarının, müasirlərinin dərdlərinə, könül ağrılarına misilsiz qadın-ana qayğısı onlarla şeirlərində öz bədii əksini tapıb. Dost itkisinə ürəkdən yanan, dost kədərinə bütün qəlbiylə həmdərd olan şairin "Şair Hüseyn Arifə", "Müşkünaz xanımın əziz xatirəsinə", "Rəfiqəm mənim", "Sənin", "Musa" adlı şeirləri bu qəbildəndir. Müşkünaz xanıma ünvanladığı şeirdə böyük Cavidin ilham məbədinin həyata gözlərini yumması acı bir tarixi şairin yadına salır. N.Rəfibəyli tarixin vərəqlərində gizlətdiyi 37-ci il faciəsinin acı nəticələrinin zaman-zaman millətimizin qəlbini göynədəcəyini, bu dəhşətli tarixin əsrin vicdanında qara ləkə kimi qalacağını ürək ağrısı ilə yazır. Müşkünaz xanımın timsalında 37-ci il qurbanlarının ailəsinin yaşadığı dəhşətləri təsirli poetik dillə oxuculara çatdıran şair H.Cavidin ömür-gün yoldaşının ölümünü dövrə, zamana ağır töhmət hesab edir və "əsrin vicdanında qalar bu ləkə", - deyirdi.

1977-ci ildə xalq şairi Hüseyn Arif yeganə oğlu Arifin gənc yaşda vəfatıyla sarsılanda sənət dostları şeirləriylə şairin yaralı ürəyinə məlhəm qoydular. Nigar Rəfibəyli "Şair Hüseyn Arifə" və "Sənin" adlı iki şeirilə şairin bu ağır günlərində dərdinə təsəlli oldu. Gənc Arifin erkən ölümünə ürəkdən yanan, sızlayan ana qəlbilə yazırdı: "Bir damcı təsəlli olsaydı sənə, bir dərya göz yaşı axıdardım mən".

"Qoy şair ilhamı çatsın dadına", "Təsəlli yazdığın şeirlər olsun" – deyə şair dostunu qələmə sarılmağa, dərdini sözlə ovutmağa, "sənət sarayına daş qoyaraq", Arifin adını şeirlərdə yaşatmağa səsləyir.

N.Rəfibəylinin şair xəyalları, ana arzuları, qadın ümidləri… ümman qədər geniş, səma qədər sonsuzdur. Bir şeirində "arzularım böyük, meydan darısqal" deyir. Bu sovet rejiminin millətimiz üçün daraltdığı meydandırmı, yoxsa daha dəhşətli müharibələrin anaları gözüyaşlı qoyduğu, soyuq silahların bəşəriyyəti məhv olmaq təhlükəsinə sürüklədiyi siyasi oyunlar meydanıdır?! Bu sualın cavabını şairin bütünlükdə poeziyasında axtarmaq lazımdır. Bir həqiqət isə aydındır ki, şairin yaşadığı dövr, bu dövrün amansız qanunları həqiqətən onun yaradıcılıq meydanını daraltmış, təkcə yazıçı Anarın qeyd etdiyi kimi, "analıq vəzifəsi, böyük evin qayğıları" deyil, siyasi rejim də "yaza biləcəklərinin yüzdə birini yazmasına" imkan verməmişdir.

…Onu sənətə fəxri ad, titul, mükafat, şan-şöhrət həvəsi gətirməmişdi. Nigar Rəfibəyli möhtəşəm söz dünyasına, sənət adlı müqəddəs aləmə – daxili mənəvi tələbatla, bədii istedadın təhrikilə və böyük poeziya sevgisi ilə qədəm qoymuşdu. Elə buna görə də dövrünün bir çox mötəbər sənət mükafatlarını, fəxri adlarını almasına rəğmən, təravətli bədii yaradıcılığının ən böyük şöhrət tacı, ən ali mükafatı heç vaxt qocalmayan, zaman keçdikcə dəyərini daha da artıran xalq sevgisi oldu. Tarix sənətkara verilən fəxri adları, mükafatları zaman keçdikcə yaddaşlardan silə bilir, unutdurur, lakin əsl sənətin qəlblərdə yandırdığı işığı əsrlərin tufanı da söndürə bilmir. Əksinə, bu işıq getdikcə istisini, nurunu daha da artırıb sönməz məşələ çevrilir, könüllərin mənəviyyata gedən yolunu aydınladır. Poeziya sevgisin-

dən doğulan, sevgi poeziyası ilə qəlblərdə əbədiyaşarlıq hüququ qazanan Nigar Rəfibəylinin şeiriyyət dünyası kimi…

*Rəyçi: prof. H.Qasımov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Anar. Sizsiz. Bakı, 1982.
2. Rəfibəyli N. Seçilmiş əsərləri. I cilddə. Bakı: Şərq-Qərb, 2004.
3. Rəfibəyli N. Seçilmiş əsərləri II cilddə, Bakı: Azərnəşr, 1993.
4. Rəfibəyli N. Bir həzin axşamda düşsəm yadına. Bakı: Gənclik, 1982.
5. Rəfibəyli N. Bizə bahar yaraşır. Bakı: Gənclik, 1978.
6. Rəfibəyli N. Günəşdən gənclik istədim. Bakı: Gənclik, 1974.

**Т.Рахимли**

**Наследница знаменитого рода**

**Резюме**

В статье повествуется о поэзии известного представителя современной азербайджанской литературы Нигяр Рафибейли. Художественные достижения поэтессы оценены с современной научной позиции. С большим вниманием прослежен творческий путь поэта, с 20-х годов до 80-х годов XX века. Новаторские особенности поэзии привлечены к исследованию на основе конкретных художественных образцов. Творчество Нигяр Рафибейли исследовано на фоне основных творческих направлений, художественно-эстетической проблематики современной поэзии.

Материалы статьи могут быть применены на научных семинарах филологических факультетов высших школ, посвящённых вопросам спецкурсов и спецсеминаров.

**T.Rahimly**

**The representative of honorable generation**

**Summary**

The article deals with the poetry of the well-known representative of contemporary Azerbaijani literature Nigar Refibeyli. The poetess’s literary achievement is appreciated by contemporary point of view. The poetess’s creative activity at the beginning of XX century is attentively viewed up to now and innovative properties of her poetry is analysed on the base of concrete fiction samples. N.Refibeyli’s creativity is investigated on the background of main directions of contemporary poetry and literary-aesthetic problems.

Article has applicable value at the scientific seminars of the philological departments of higher institutions dedicated to the issues of special courses and special seminars.

*Metodika, qabaqcıl təcrübə*

# TƏDRİS PROSESİNDƏ MÜASİR TƏLİM ÜSULLARINDAN İSTİFADƏ

**Xuraman Səlimova**
***TPİ-nin Kurikulum Mərkəzinin böyük elmi işçisi***

***Açar sözlər:*** *məişət mədəniyyəti, sanitariya-gigiyena, təhlükəsizlik qaydaları.*
***Ключевые слова:*** *обшественная культура, санитарно-гигиенический, техника безопасности.*
***Key words:*** *housing culture, sanitation, safety rules.*

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin 15 iyun 1999-cu il tarixli, 168 nömrəli sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasının təhsil sahəsində islahat Proqramı" ölkəmizdə təhsil sahəsində islahatların həyata keçirilməsi üçün ilkin təkan oldu. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2006-cı il tarixli 233 nömrəli qərarı ilə "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum)" kimi dövlət əhəmiyyətli mühüm sənəd qəbul olunmuşdur. Daha sonra, 3 iyun 2010-cu ildə Azərbaycan Respublikası Nazirlər Kabinetinin 103 nömrəli qərarı ilə "Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları" (kurikulumları) təsdiq edildi. Bu sənədə əsasən fənn kurikulumları hazırlanmağa başlanmış və bu iş davam etdirilməkdədir. Qəbul olunmuş yeni sənədə əsasən "Əmək təlimi" fənninin adı "Texnologiya" adlandırılmışdır. Həyati bacarıqların əsasını texnoloji bacarıqlar təşkil etdiyi üçün bir çox inkişaf etmiş ölkələrin təhsil sistemlərində texnologiya fənninin öyrənilməsinə xüsusi diqqət yetirilir. "Texnologiya" təhsil sahəsinin əsas məqsədi şagirdləri müstəqil əmək fəaliyyətinə hazırlamaq, geniş təhsilli, mədəni, yaradıcı, innovasiyalı və tədbirli şəxsiyyətin inkişafı və tərbiyəsidir. Bu fənnin ümumtəhsil məktəblərində tədris olunması, ilk növbədə həmin zərurətdən irəli gəlir və şagirdlərə həyati bacarıqların aşılanması baxımından böyük əhəmiyyət daşıyır.

Müasir dövrdə elə bir vəziyyət yaranmışdır ki, dar bir ixtisasla kifayətlənmək mümkün deyildir. Şagirdlər öz texnoloji bacarıqları sayəsində universal istehsal sahələrində fəaliyyət göstərə bilməli, beləliklə, onların texnologiya bacarıqlarının inkişafı üçün məzmun xətləri arasındakı inteqrativliyə əməl olunmalıdır. Ona görə də məktəblərdə gələcəyin geniş profilli mütəxəssisinin formalaşdırılmasının ilkin təməlinin qoyulması aktual problem kimi vacib hesab olunur. Beləliklə, texnologiya fənn kurikulumlarının məzmun xətlərindən biri olan məişət mədəniyyəti xətti üzrə qazanılmış bilik və bacarıqlar vasitəsilə şagirdlər həyatda insana lazım olan davranış qaydalarına riayət etmək, ailənin və onun büdcəsinin idarə olunmasında iştirak etmək, sadə təmir-tikinti işlərini yerinə yetirmək kimi vərdişlərə yiyələnirlər. Bundan başqa onlarda ailə-məişət mədəniyyəti və ənənələri, interyer tərtibatı və dizayn, ictimai yerlərdə davranış və ünsiyyət qaydalarına əməl etmək bacarıqları formalaşır. Bu baxımdan V sinif "Mətbəx qab-qacağı və onlara qulluq" mövzusun-

da keçirdiyim dərs nümunəsini sizin nəzərinizə çatdırmaq istəyirəm.

Mövzu: Mətbəx qab-qacağı və onlara qulluq.

Dərsin məqsədi: Mətbəxdə istifadə edilən əl alətlərinə uyğun emal texnologiyalarını izah edir (1.1.1.).

Qrup tərkibində işləyərkən birgə fəaliyyət bacarığını nümayiş etdirir (1.3.3.).

Mətbəxdə işin xarakterinə uyğun təhlükəsizlik və sanitariya-gigiyena qaydalarına riayət edir (1.3.4.).

Mətbəxdə işlədilən alətləri təsnif edir və növlərini sadalayır (2.1.1.).

Əl alətlərindən istifadə edir (2.2.1.).

İnteqrasiya: H-b: 1.1.1.; 4.1.1.; 4.2.1.; 4.3.1.; A-d: 1.2.1.; 1.2.2.

İş forması: Kollektiv iş, kiçik qruplarla iş.

İş üsulu: Müzakirə, beyin həmləsi, klaster.

Resurslar: qab-qacaq və ləvazimat nümunələri, yuyucu və təmizləyici vasitələrin nümunələri, dərslik, müxtəlif şəkillər, iş vərəqləri.

Dərsin gedişi.

Motivasiya üçün slaydlarda müxtəlif şəkillər nümayiş etdirirəm. Şəkillər qonaq otağı, yataq otağı, iş otağı, uşaq otağı və mətbəxdən ibarət olur. Sinfə belə bir sualla müraciət edirəm:

- Uşaqlar siz necə düşünürsünüz, bu gördüyünüz otaqların hansı birində yemək hazırlamaq olar?

Şagirdlərdən düzgün cavab olan “mətbəx” sözünü aldıqdan sonra sinfə yönəldici suallarla müraciət edirəm:

- Mətbəxdə ancaq yemək hazırlamaq olar?

- Mətbəxdə yemək hazırlamaq üçün nə tələb olunur?

- Mətbəx ləvazimatları dedikdə nə başa düşülür?

- Qab-qacağın necə yuyulması barədə nə isə bilirsinizmi?

- Bəs mətbəxdə işləyərkən hansı sanitariya-gigiyena qaydalarına əməl edilir?

Şagirdlərdən müxtəlif cavablar gəlir. Sonra şagirdlərə dərslikdən mətnin oxunuşuna keçmələri tapşırılır. Bundan sonra şagirdləri 3 qrupa bölürəm. Stolun üstünə 3 fərqli rəngdə zərf qoyuram. Hər qrupun liderinə 1 zərfi seçib, götürmələrini xahiş edirəm. Hər qrup zərfi açıb, tapşırıqları ilə tanış olur. Zərfin içində müxtəlif şəkil var. Tapşırıq bundan ibarətdir:

Mavi zərf.

Şəkillərin içində çay dəstinə aid olan qab - qacaqları seçib, sadalayın.

Çəhrayı zərf.

Yemək dəstinə aid olan şəkilləri seçib, sadalayın.

Yaşıl zərf.

Yemək alətlərinə aid olan şəkilləri seçib, sadalayın.

Şagirdlərə tapşırığı yerinə yetirmək üçün 3 dəqiqə vaxt verilir. Təqdimatlar dinlənilir. Lövhədə klaster üsulundan istifadə edib, çay dəsti, yemək dəsti, yemək alətlərinin adlarını yazırlar. Sonra sinfə müraciət edirəm.

Uşaqlardan müxtəlif cavablar gəlir. Onların fikirlərinə əlavə olaraq, bu məlumatı verirəm.

- İlk növbədə onu demək istəyirəm ki, qidanın iştahla yeyilməsi üçün yeməyi hazırladığımız və qida qəbul etdiyimiz qab-qacağın təmiz olması əsas şərtlərdən biridir. Sağlamlığımız üçün bədənimizə zərərli maddələrin düşməməsi üçün də mətbəxdə sanitariya-gigiyena qaydalarına əməl etmək lazımdır.

Qrupların hər birinə iş vərəqi təqdim edirəm.

İş vərəqi 1.

Mətbəxdə istifadə edilən qab-qacağı və ləvazimatları sadalayın.

İş vərəqi 2.

Qab-qacağın yuyulması zamanı hansı vasitələrdən istifadə edilir?

Qabları yumamışdan əvvəl nə etmək lazımdır?

Hansı təhlükəsizlik və sanitariya-gigiyena qaydaları mövcuddur?

Qab-qacağı nə üçün əvvəl soyuq, sonra isti su ilə yumaq lazımdır?

Suallar cavablandırıldıqdan sonra, belə bir nəticəyə gəlmək lazımdır ki, şagirdlər mətbəxdə istifadə edilən əl alətlərinə uyğun emal texnologiyasını izah edir. Birgə fəaliyyət bacarığı nümayiş etdirir.

Mətbəxdə işin xarakterinə uyğun təhlükəsizlik və sanitariya-gigiyena qaydalarına əməl edir.

Mətbəxdə işlədilən alətləri təsnif edir və növlərini sadalayır. Əl alətlərindən istifadə edir.

Ev tapşırığı.

İnternetdən müxtəlif avadanlıqlarla (müasir dizayn ilə) təchiz olunmuş mətbəx şəkilləri çıxartmaq və dərs zamanı eşitmədiyimiz sanitariya-gigiyena və təhlükəsizlik qaydalarından bir neçə nümunə göstərmək.

Qiymətləndirmə aşağıdakı meyarlara əsasən aparılır.

Emal texnologiyasını izah etmə,

Birgə fəaliyyət bacarıqlarını nümayiş etdirmə,

Təhlükəsizlik və sanitariya-gigiyena qaydalarına əməl etmə,

Qab-qacağı təsnif etmə,

Növlərini sadalama,

Əl alətlərindən istifadə etmə.

*Rəyçi: dos. N.Axundov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 2006-ci il tarixli 233 nömrəli qərarı ilə “Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum) “ un təsdiq edilməsi haqqında. səh. 29.

2. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin 103 nömrəli qərarı “Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları)” nın təsdiq edilməsi haqqında. Bakı, 3 iyun 2010-cu il, səh. 27.

**Х.Салимова**

**Использование современных учебных методов в процессе обучения**

**Резюме**

В статье говорится об активных методах обучения на уроках технологии и о применении методов обучения и их реализации. В статье показано что, учителю необходимо использовать технологии, отвечающие требованиям настоящего времени. Данные технологии активизирируют процесс обучения, делают его более продуктивным, а также формируют и далее развивают мотивацию обучения. Современные уроки по предмету “Технология” - это подготовка учащихся к самостоятельной трудовой деятельности, развитие и воспитание широко образованной, культурной, творческой, инициативной и предприимчивой личности.

**Kh.Salimova**

**Using new teaching strategies in education**

**Summary**

In the article it is spoken about active methods of learning technology in the classroom and on the application of teaching methods and their implementation. It is shown that the teacher needs to use technology to meet the requirements of the present time. These technologies will enhance the learning process and make it more productive, as well as form, and further develop learning motivation. Modern lessons for the technology subject prepare students for self-employment, development and education, widely educates cultured, creative, proactive and entrepreneurial individuals.

# FƏAL TƏLİM ZAMANI QRUPLARLA İŞİN TƏŞKİLİ

**Nizami Abdullayev**
***Tovuz şəhər N.Tusi adına məktəb-liseyin müəllimi, əməkdar müəllim***

***Açar sözlər:*** *interaktiv, qrupla iş, təlim prosesi, didaktika, pedaqoji təcrübə.*
***Ключевые слова:*** *интерактивный, работа в группах, учебный процесс, дидактика, педагогический опыт.*
***Key words:*** *interactive, group work, teaching process, didactic, pedagogical experiment.*

"Təhsil əsri" kimi qəbul etdiyimiz XXI əsrdə ümumtəhsil müəssisələrinin əsas vəzifəsi intellektual potensiallı, mənimsədiyi bilik və bacarıqlardan maksimum istifadə etməyi bacaran, dünyagörüşü hərtərəfli inkişaf etmiş, milli və ümumbəşəri mənəvi-əxlaqi keyfiyyətlərə yiyələnmiş şəxsiyyətin yetişdirilməsindən ibarətdir. Təhsil sahəsində aparılan islahatlar da demokratik cəmiyyət üçün hərtərəfli inkişaf etmiş, sağlam düşüncəli, sərbəst fikirli, ətrafda baş verənlərə tənqidi yanaşmağı və dərslərdən nəticə çıxarmağı bacaran istedadlı gənclər yetişdirməyi tələb edir.

Ölkəmizdə tədris prosesinin təşkilinin yeni, daha səmərəli formalarını tətbiq etmək, təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilir. Çoxşaxəli aparılan islahatların müsbət cəhətlərindən biri də tədris prosesində yeni təlim metodları və texnologiyalarından istifadəyə üstünlük verilməsidir. Belə metodlardan biri də fəal (interaktiv) təlim metodudur.

Dünya təcrübəsinə nəzər saldıqda görünür ki, məktəbdə hər bir dərsə şagirdlər üçün, sözün əsl mənasında, təfəkkür və intellekt məkanı kimi baxılır. Bu məqsədlə müasir təlim metodlarının, interaktiv təlim texnologiyalarının düzgün və məqsədyönlü tətbiqi başlıca şərt hesab edilir. Əgər ənənəvi dərs üsulunda əsas biliklər müəllim tərəfindən verilirdisə, interaktiv təlimdə üstünlük şagirdlərə verilir. Şagirdlər daim axtarışda olur, fikirlərini aydın şəkildə ifadə etməyə, əldə etdikləri bilik və bacarıqların düzgün tətbiqinə çalışırlar. İnkişaf etmiş ölkələrin təcrübəsi göstərir ki, fəal (interaktiv) təlim metodu təlimin keyfiyyətinin artırılmasına güclü təsir göstərir, şagirdlər üçün dərsi çox maraqlı və cəlbedici edir. Bu metodlar şagirdlərdə təfəkkürü inkişaf etdirdiyinə, onları düşündürdüyünə, axtarışlar aparmağa vadar etdiyinə, dərsdə fəallaşdırdığına və bir şəxsiyyət kimi formalaşdırdığına görə onları interaktiv metodlar adlandırırlar. Fəal metodların tətbiqi zamanı şagirdlərin psixi xüsusiyyətləri-duyğusu, qavrayışı, qabiliyyəti, xarakteri, meyil və maraqları inkişaf edir. Pedaqoji ədəbiyyatda interaktiv təlim metodları üçün aşağıdakıların səciyyəvi olduğu göstərilir:

- şagirdin aktiv fəaliyyəti;
- müəllimin şagirdlə və şagirdin bir-biri ilə əməkdaşlığı;
- didaktik, rollu oyunlardan istifadə olunması;
- şagirdlərin işgüzar fəaliyyəti üçün sinifdə sosial bərabərliyin və psixoloji mü-

* 5

hitin yaradılması;

- müəllimin bilik xəzinəsi rolunu deyil, biliklərin axtarılması və tədqiqatın aparıcısı rolunu ifa etməsi.

Respublikamızın ümumtəhsil məktəblərində fəal (interaktiv) təlim metodunun tədris prosesinə daxil edilməsi məzmunun öyrənilməsində səmərəliliyin artırılmasına, şagirdlərin dərketmə fəaliyyətinə, onlarda passivliyin aradan qaldırılmasına, yaradıcılıq qabiliyyətinin formalaşdırılması və təlim keyfiyyətinin yüksəldilməsinə şərait yaradır. Bu metoddan səmərəli və məqsədyönlü şəkildə istifadə etməklə demokratikləşdirmə, humanistləşdirmə, diferensiallaşdırma, fərdiləşdirmə, inteqrasiya və humanitarlaşdırma prinsiplərini arzu olunan səviyyədə həyata keçirmək olar. Təcrübə göstərir ki, fəal təlim zamanı şagirdlərin özünə inamı artır, şəxsiyyətlərarası münasibətlər yaxşılaşır, məktəbə və oxumağa meyil çoxalır, bir sözlə, təlimin keyfiyyətinin yüksəldilməsinə şərait yaranır. Şagirdlərdə sürətli şəkildə yeniləşən şəraitə uyğunlaşma və onun həyata keçməsinə imkan yaradan bu qabiliyyətlərin formalaşdırılması fəal təlimi zəruri etmişdir. Bunu da nəzərdən qaçırmaq olmaz ki, bu metodu konkret olaraq gündəlik fəaliyyətində tətbiq edən müəllimin özü də yeniliyə hazır olmalı, dünyada və ölkəmizdə gedən inkişaf tendensiyalarını izləməli, yenilikçi olmalıdır. Belə olarsa, o, fəal dərsin nə zaman, hansı məqsədlərə görə istifadəsini, necə qurulmasını, şagirdlərin səviyyəsinə uyğunlaşdırılmasını, ayrı-ayrı metod və texnikaların seçilməsi prinsiplərini və fəal dərsin nəticələrinin necə qiymətləndirilməsini düzgün müəyyənləşdirə bilər.

İnteraktiv təlim metodları o vaxt səmərə verə bilər ki, yüksək səviyyədə əməkdaşlıq şəraitində qurulsun. Əməkdaşlıq isə o vaxt mümkündür ki, qarşı tərəflər arasında (müəllim-şagird, şagird-şagird ) səmimiyyət, hörmət, ən başlıcası isə yüksək dərəcədə inam olsun. Sadalanan bu keyfiyyətlər humanistləşmə prosesinin komponentləridir. Bu komponentlər olmadan interaktiv təlimdə əməkdaşlıqdan söhbət belə gedə bilməz.

Dərs boyu şagirdlərin aktiv fəaliyyətini təmin etmək, fəallığına və müstəqilliyinə maksimum üstünlük vermək fəal təlimin əsas məqsədlərindən sayılır. Elə məqam yetişməli, güclü ehtiyac duyulmalıdır ki, ciddi fəaliyyətə başlamaq üçün hazır olasan. Sinifdə şagirdlərin aktiv fəaliyyəti onların daxili imkanlarının buna qədər əldə etdikləri bilik və bacarıqların, dolğun elmi məlumatların zəminində, normal sosial-psixoloji iqlim şəraitində baş verir. Beləliklə, şagird o vaxt canlı fəaliyyətə qoşulur ki, özünün öyrəndiyi, qazandığı elmi anlayışların düzgünlüyünə inansın və bunun tətbiqi prosesində öz cəsarətinə güvənə bilsin.

Aparılan müşahidələr onu da göstərir ki, interaktiv metod şagirdlərdə müstəqil düşünməyi, sərbəst fikir söyləməyi, özünüqiymətləndirməni, öz təcrübəsini və biliyini təhlil etmək qabiliyyətini, əməkdaşlıq etməyi, başqalarını dinləməyi, yoldaşlarının fikirlərinə hörmət etməyi, öz fikirlərini arqumentlərlə sübut və izah etməyi, qərar qəbul etməyi inkişaf etdirir. Bu tələblərin reallaşdırılması isə o vaxt mümkün olur ki, şagirdlərdə özünəinam, həqiqəti, düzgünlüyü müdafiə etmək bacarığı, daxili aləmin saflığı, qarşılıqlı hörmət, güzəştə getmək mədəniyyəti, xüsusilə də humanist hislər təşəkkül tapmış olsun. Suxomlinskinin dediyi kimi, ləyaqət olmadan mənəvi zənginlik ağılabatan deyil.

Deməli, müasir dərsdə şagirdin şəxsiyyət olduğu nəzərə alınmalı, o, təlim-tərbiyə prosesinin bərabərhüquqlu subyekti kimi qəbul edilməlidir. Digər tərəfdən, şagirdlərə münasibətdə ayrı-seçkiliyə son qoymaq, onların öz düşüncələrini sərbəst və azad ifadə etməyə imkan yaratmaq, onları təhsili və inkişafı üçün təhlükə törədə biləcək fəaliy-

yətdən qorumaq, hüquqlarının qorunmasına nail olmaq müəllimlərin ümdə vəzifəsidir. Bütün bunları müasir dərsə verilən tələblər də zəruri edir. Çünki şagird milli və ümumbəşəri səciyyəli bilikləri, bacarıq və vərdişləri, mənəvi keyfiyyətləri məktəbdə müəllimin köməyi ilə mənimsəyir.

Təlim prosesində tətbiq olunan interaktiv metodun ən təqdirolunası cəhətlərindən biri də şagird fəallığının maksimum artırılmasıdır. Dərsdən sonra şagird nə isə yeni bir şey öyrənə bilibsə, müəyyən bilik və bacarığa yiyələnibsə, yoldaşları və müəllimləri ilə faydalı ünsiyyətə girə bilibsə, müəllimi tərəfindən bir şəxsiyyət kimi qəbul edildiyini görübsə, deməli, həmin dərs səmərəli olmuşdur. Bu, hər bir müəllimin işinin ölçü vahidi kimi qəbul edilməlidir.

Müşahidələr belə qənatə gəlməyə imkan verir ki, fəal (interaktiv) təlim zamanı yeni pedaqoji texnologiyalardan düzgün istifadə edildikdə mövzunun 70-80%-i sinifdə şagirdlər tərəfindən mənimsənilir. Fəal təlim zamanı daha çox istifadə olunan iş forması qrup işidir. Bu iş forması şagirdlərə problemin birgə həll edilməsini, bir-birinin fikrinə hörmətlə yanaşılmasını, müstəqil düşünməyi, sərbəst fikir söyləməyi öyrədir. Qrupla iş müstəqil öyrənmə qabiliyyətinin inkişaf etdirilməsinə, təlimin fərdiləşdirilməsinə və şagirdin özünü tam mənada şəxsiyyət kimi hiss etməsinə imkan verir.

Qrupda işin müvəffəqiyyətlə aparılması üçün aşağıdakı prinsiplərə riayət edilməsi məqsədəmüvafiqdir:

- qrup işinin qaydalarını uşaqlara başa salmaq;
- qrup işinin məqsədini tam təsəvvür etmək;
- iş üçün lazım olan materialları əvvəlcədən hazırlamaq;

Bu prinsiplərin hər biri müəllimdən pedaqoji ustalıq, nəzəri cəhətdən hazırlıq və təcrübə tələb edir.

Təcrübə göstərir ki, qruplarla iş aşağıdakı kimi aparılarsa, arzu olunan nəticəni əldə etmək daha asan olar:

- şagirdlər sayından asılı olaraq 3-5 qrupa bölünür;
- qruplar ayrı-ayrı masaların arxasında əyləşirlər;
- müəllim qrupun işinin gedişini müşahidə edir, onun qərarının düzgün qəbul olunduğuna əmin olur, suallara cavab verir;
- verilmiş vaxt bitdikdən sonra müəllim işi dayandırır və məruzəçilərdən nəticələri bildirməyi xahiş edir;
- müəllim ümumi diskussiyanı idarə edir, qrupların işinin yekunlarını tutuşdurur və ümumiləşdirir.

Müəllim qruplarla iş qaydalarını müəyyənləşdirərkən qrup üzvlərinin vəzifələrini düzgün bölməli, qrup liderini düzgün müəyyənləşdirməli, hər kəsin öz şəxsi fikrini söyləməsi üçün imkan yaratmalı, mübahisəyə yol vermədən sağlam rəqabət aparılmasına nail olmalıdır. Bundan başqa, qrup işi zamanı fəal olmaq, öz fikrini faktlara əsaslandırmaq və problemin həllində kompromis yollar axtarmaq da bu iş forması üçün vacib şərtlərdəndir.

Fikrimizi konkret olaraq əsaslandırmaq üçün 9-cu sinifdə keçilən "Əsas triqonometrik eyniliklərin ifadələrin çevrilməsinə tətbiqi" mövzusunun tədrisi zamanı interaktiv metodun qrupla iş formasının tətbiqi prosesinə nəzər salaq:

Sinifdə olan şagirdlər hər birində 4-5 nəfər şagird olmaqla 4 qrupa bölünür. Şagirdlər masa arxasında qrup şəklində əyləşirlər. Qrupların lideri müəyyənləşdirilir. Sonra qruplara aşağıdakı adlar verilir və kağıza yazılaraq hər qrupun stolunun üstünə qoyulur. "Sinus", "Kosinus", "Tangens" və "Kotangens".

Dərsdə qarşıya qoyulan problem: "Əsas triqonometrik eyniliklər" haqqında nə bilirsiniz?

1. Vahid çevrə nəyə deyilir və tənliyi hansı şəkildədir?

2. Vahid çevrədə *sin* və *cos*-un tərifləri necədir?

3. Triqonometriyanın əsas eyniliyi necə alınır?

Mövzu ilə bağlı digər konkret suallar da qoyulur.

Belə suallar ayrıca vərəqdə əvvəlcədən yazılıb, hər bir qrupa verilir. Sonra hər bir sual ətrafında diskussiya aparılır və qrupların lideri və ya hər hansı bir üzvü sualları cavablandırır.

Bundan sonra qruplar üzərində müxtəlif çalışmalar yazılmış və lövhədən asılmış plakata yönəldilir.

Şagirdlər ifadələri sadələşdirir və eyniliyi hesablayırlar. Nəticədə ifadələrin ən böyük və ən kiçik qiymətlərini tapırlar.

Belə çalışmalar qrup üzvləri və ya liderləri tərəfindən lövhədə yerinə yetirilir. Əgər çətinlik yaranarsa, onlara istiqamət verilir. Bundan sonra şagirdlərə bugünkü mövzunun adı elan edilir: "Əsas triqonometrik eyniliklərin ifadələrin çevrilməsinə tətbiqi".

Sonra qruplara mövzuya aid test tapşırıqları yazılmış iş vərəqləri verilir.

Hər qrup öz nəticəsini təqdim edir. İş vərəqləri lövhədən asılır. Testlərin cavabları olan plakat da lövhədən asılır. Müzakirə prosesində şagirdlərə suallar verilir. Şagirdlərin cavabında az da olsa faydalı fikir olarsa, həmin fikri inkişaf etdirmək üçün bəzi əlavə suallar verilir. Şagirdlərin cavablarını ümumiləşdirib, testlərin cavabları qruplarla birgə yoxlanılır və nəticələri elan edilir.

Hər qrup üçün meyar cədvəli hazırlanır. Dərsin bütün mərhələlərində qiymətləndirmə aparılır. Qiymərləndirmə "+" və "-" işarələri ilə göstərilir. Son nəticədə bütün şagirdlərin (qruplarda olan) biliyi qiymətləndirilir.

Beləliklə, müəllim təlim zamanı qruplarla işin uğurlu nəticələrinə nail olur.

*Rəyçi: pedaqogika üzrə fəlsəfə doktoru E.Məmmədova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında ümumi təhsil konsepsiyası (Milli Kurikulum). Bakı, 2006.

2. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirləri. Bakı: Adiloğlu, 2006.

3. Veysova Z. Fəal (interaktiv) təlim. Müəllimlər üçün vəsait. Bakı, 2007.

4. E.Məmmədova. Yeni məzmun yeni yanaşma tələb edir. Azərbaycan məktəbi, № 5, 2013.

**Н.Абдуллаев**

**Организация групповой работы во время интерактивного обучения**

**Резюме**

В статье говорится о положительных результатах применения интерактивного метода. Он требует от учителя педагогического мастерства, теоретической готовности, и практики. Раскрывается сущность работы в группах.

**N.Abdullayev**

**Organizing group works in interactive teaching**

**Summary**

The article is dedicated to the positive results of applying interactive methods. These principles demand pedagogical mastery, theoretical preparation and experiences from teachers. It is also noted that students feel self confident while interactive teaching and they are involved in teaching with great pleasure.

# ОПРЕДЕЛЕНИЯ ПОНЯТИЙ В ШКОЛЬНОМ КУРСЕ МАТЕМАТИКИ

**Натаван Таирова**
***преподователь математики образовательного комплекса № 132-134***

***Açar sözlər:*** *anlayış, ədəd, anlayışın tərifi, cins-növ əlaməti.*
***Ключевые слова:*** *понятие, число, определение понятия, родо-видовое отличие.*
***Key words:*** *conception, number, definition of conception, kind-sort feature.*

Математические понятия, как и понятия по другим наукам, являются формами мышления. Математические понятия делятся на:

1) определяемые;

2) неопределяемые.

Неопределяемые понятия относятся к первичным, которых невозможн определять и потому их принимают без определения. Например, точка, прямая, плоскость и т.д.

Определением понятия называется такая логическая операция, с помощью которой раскрывается содержание вводимого в рассмотрение понятия. Определяя новое понятие, мы ее включаем в систему уже нам известных понятий. Например, определение прямоугольника или ромба и т.д.

В школьном курсе математики часто встречаются понятия, которые определяются через ближайший род и видовое отличие. В таких случаях сначала указывают родовое понятие как вид, а затем указывают видовое отличие, то есть признак, отличающий определяемое понятие от других видов того же рода.

В логике определение понятия через ближайший род и видовое отличие строится по схеме:

А есть В+С,

Где А – определяемое понятие,

В – ближайший род,

С – видовое отличие.

В школьном курсе геометрии большинство определений являются определениями через ближайший род и видовое отличие. Но есть определения, которые не являются определениями через ближайший род и видовое отличие.

В школьном изучении математики понятие числа проходит этапы:

- формирование понятия числа,
- расширение понятия числа,
- развитие понятия числа.

Известный астроном математик Насирэддин Туси в XII веке впервые определил понитие числа “как отношение двух однородных величин. Так как всякое число – это значение величины, которое было измерено. Количественными характеристиками и дискретных и непрерывных величин являются числа.

Рассмотрим этот вопрос несколько подробнее.

1. Потребность измерения величин, допускаюших деление на равные части и необходимость решения уравнения ax=b, где a и b – любые натуральные числа, привело к необходимости дробных чисел.

2. Потребность измерения величин, могущих изменяться в противоположных

направлениях и неоходимость решения уравнения вида x+a= b, где a и b – любые положительные числа, вызвали введение отрицательных чисел.

3. В результате измерения отрезков встречались случаи, когда два отрезка не имели общую единицу измерения, что привело к понятию о несоизмермых отрезков.

4. Решение ряда вопросов естествознания и техники привело к необходимости решения уравнения вида x2+a=0, где a - любое действительное число, вызвало введение понятия комплексного числа.

Итак, как видно, новые числа (понятия) вводятся в математике при помощи формально-логического метода и при помощи определений – называемых определениями посредством соглашения. Все эти определения охватывают следующие положения:

- введение символов для обозначения новых чисел,
- определение соотношений (равенства, неравенства) между “новыми числами”, а так же между “новыми” и “старыми” числами,
- определения арифметических действий.

Вводимые определения должны удовлетворять принципу перманентности, состоящему в следующем:

1) множество новых числовых обьектов должно включать в себя числа прежней числовой области как свою часть,

2) формальные законы действий должны быть сохранены для чисел новой области,

3) определения порядка и действия над новыми числами не должны противоречить ранее установленным определениям для чисел прежней числовой области,

4) действие, не выполнявщееся в прежней числовой области, в новой области должно оказаться всегда выполнимым (однозначно).

Таким образом, мы убедились в том, что научное положение теории “новых чисел” (например, рациональных) основано на введении целого ряда определений, которые называются условными соглашениями. Иногда говорят – “было принято”. Расширение понятия числа в математике характеризуется при помощи цепи определений, главными из которых являются:

- определение равенства и неравенства,
- определение операции сложения,
- определение операции умножения.

На основании этих операций определяются правила вычитания и деления.

При изучении элементов теории множеств тех или иных чисел в V-VI классах нужно придерживатвся конкретно – индуктивной схемы:

- реально – конкретное истолкование чисел,
- реально – конкретное истолкование операций над числами.

В старших классах при изучении комплексных чисел на первый план выходит абстрактно – дедуктивный метод.

В учебной и методической литературе вопрос о введении определений посредством соглашения решается в процессе изложения учебного материала по математике.

Известно, что в школе ученики сначала знакомяится с арифметическими и параллельно с ним и геометрическими понятиями. По понятным причинам арифметические понятия играют ведущую роль в процесс обучения. Понятие натурального числа являеся восновном неопределяемым понятием.

Определение сложения натуральных чисел не имеет точного логического определения, но опирается на аксиомы Пеано:

1. 1 – единица единственное число, которое не следует ни за каким натуральным числом.

2. После каждого натурального числа следует единственное натуральное число, которое на 1 больше предшествующего.

3. Если число, отличное от единицы, то каждому натуральному числу предшествует единственное натуральное число, которое на 1 меньше последующего.

После этого сложение натуральных чисел определяется так: “прибавление единицы к какому-нибудь натуральному числу a есть действие дающее непосредственно следующее за a натуральным число a1, т.е. a1=a+1.

В учебниках по математике сложение определяется так: “Действие, состоящее в образовании суммы нескольких чисел, называется сложением этих чисел”. Эта формулировку нельзя считать определением действия сложения, так как “сумма” называется результатом сложения. Ее можно назвать как описание действия сложения. Здесь не может идти речь о логическом определнии.

Переход к дробным числам требует от учителя более тонкого подхода.

Истолкование понятия дроби и операции над дробями должно быть конкретно-индуктивным. Определение дроби, данные в учебниках математики так же не являются логическим определением. Они носят описательный – индуктивный характер.

*Рецензист: к.п.наук Е.Мамедова*

**Литература**

1. Молодший В. Учение о числе. М.: Просвещение, 1985.

2. Рупасов К., Рупасова В. Математические понятия и определения в школе. М.: Просвещение, 1987.

3. Ümumtəhsil məktəblərinin riyaziyyat kurikulumu (V-IX siniflər). Bakı: Təhsil, 2012.

**N.Tahirova**

**Məktəb riyaziyyat kursunda anlayışların tərifi**

**Xülasə**

Məqalədə aşağıdakı məsələlərə toxunulmuşdur:

- anlayış, tərif verilən və verilməyən anlayışlar,
- məntiqi tərif və təsviri təriflər,
- məktəb riyaziyyat kursunda anlayışların məntiqi tərifləri və təsviri və ya qəbul olunmuş tərifləri,
- ədəd anlayışının genişləndirilməsi prinsipləri,
- hesab əməllərinin tərifləri və məktəb təlimində tətbiqləri.

**N.Tahirova**

**Definition of conceptions in school mathematic course**

**Summary**

The article is dedicated to;

- Definition, conception with definition and conception without definition
- Logical definition and descriptive definition,
- Logical, descriptive or accepted definition of conceptions in school Math course
- The principles of broadening number conception,
- Definition of calculation and its application in school training.

***Dilimiz, mənəviyyatımız***

# “ÇƏTİN SÖZLƏR” ANLAYIŞININ MAHİYYƏTİ VƏ METODİK BAXIMDAN AÇIQLANMASI

**Samirə Həsənova**
***Azərbaycan Mətbuat Şurası, Təhsil məsələləri üzrə məsləhətçi, ARTPİ-nin doktorantı***
***E-mail: samiraqasanova@gmail.com***

***Açar sözlər:*** *şəxsiyyət, çətin sözlər, problem, orfoqrafiya, orfoepiya, semantika, şagird, tədqiqatçı, eksperiment.*

***Ключевые слова:*** *личность, трудные слова, проблема, орфография, орфоэпия, семантика, ученик, исследователь, эксперимент.*

***Key words:*** *personality, difficult words, problem, orthography, orthopedically, semantics, students, Investigator, experiment.*

Müasir təhsilin əsas məqsədi hərtərəfli inkişaf etmiş, geniş dünyagörüşə malik şəxsiyyət yetişdirməkdir. Odur ki, respublikamızda təhsil sahəsində aparılan islahat proqramına uyğun olaraq hər bir fənnin, o cümlədən “Azərbaycan dili” fənninin qarşısında konkret tələblər qoyulmuşdur. Dil düşüncəyə şəkil verən, onu işarələr sistemi ilə ifadə edən bir vasitədir. İnsanın düşüncə tərzi dilə hansı dərəcədə hakim olması ilə səciyyələnir. Deməli, nitq mədəniyyəti, dilin lüğət ehtiyatının zənginliyi şəxsiyyət üçün əvəzolunmaz keyfiyyətdir. Məhz bu səbəbdən hər bir ifadənin məna yükünün dərk edilməsi, sözə həssas münasibətin formalaşdırılması olduqca böyük önəm daşıyır. Lakin elə tip sözlər var ki, onların öyrədilməsi yalnız xüsusi fəaliyyət planının qurulması zamanı mümkün ola bilər. Adətən, onlar “çətin sözlər” anlayışı altında araşdırılır. Bu, şərti termindir və nisbi xarakter daşıyır. Təhlillər göstərir ki, elmi-metodik ədəbiyyatlarda “çətin sözlər” daha çox orfoqrafik baxımdan təlim prosesində çətinlik yaradan sözlərə şamil edilmiş və bu istiqamətdə tədqiqatlar aparılmışdır. Bunlardan bəzilərini nəzərdən keçirək:

Professor Ə.Əfəndizadə “çətin sözlər” anlayışını izah edərkən sırf orfoqrafik istiqaməti əsas götürmüş, “yazılışı çətin sözlər” və “yazılışı ümumi orfoqrafik qaydalarla müəyyənləşməyən sözlər”lə əlaqələndirmişdir. Lakin müəllif ifadəni dar məzmunda işlətsə də, belə bir qeyd verməyi lazım bilmişdir: “Həmin terminlər metodik nöqteyi-nəzərdən daha geniş məna kəsb edir” [1, 3]. Azərbaycan dili tədrisi metodikasının elmi-nəzəri əsaslarını işləyən görkəmli araşdırıcılardan sayılan alim yazılışı çətin sözlərin əsas xarakter xüsusiyyətlərini şərh edərkən onları aşağıdakı kimi qruplaşdırmışdır:

1. “Yazılışı tələffüzündən fərqlənən sözlər;
2. Bitişik və ya ayrı yazılmasına görə çətin fərqlənən mürəkkəb sözlər; dilimizə rus dili vasitəsi ilə keçib, həmin dildəki eyni sözlərdən yazılışı və tələffüzünə görə fərqlənən sözlər;
3. Orfoqramı ümumi qaydalarla müəyyənləşən, lakin yazılış qaydası şagirdlərə məlum olmayan sözlər” [1,11].

Bu tipli sözlərin mənimsənilməsində mühüm rol oynayan təlim metodları və vasi-

tələrinə toxunan tədqiqatçı dərsliklərin imkanlarını qiymətləndirərək yazmışdır: "...Azərbaycan dili dərsliyi şagirdlərə başqa vərdişlərlə bərabər, çətin sözlərin düzgün yazılışına dair vərdişlər verilməsində də, heç şübhəsiz, çox mühüm rol oynamalıdır" [1,8].

K.Mikayılovun tədqiqatlarında isə "çətin sözlər" anlayışının mahiyyəti nitqin inkişaf xüsusiyyətləri, lüğət üzrə iş prosesində açıqlanmış və rus metodisti V.A.Dobramıslovun fikirlərinə əsaslanaraq, "mənası aydın olmayan, yaxud aydın olub nitqində istifadə edə bilmədiyi sözlər" anlamında təqdim olunmuşdur. Problemlə bağlı müəyyənləşdirici eksperiment keçirən alim məktəb təcrübəsindəki vəziyyəti ümumiləşdirərək bu nəticəyə gəlmişdir:

1. "Şagirdlər sözlərin mənasını bilmədikdə onları konteksdə işlədərkən və yazarkən səhvə yol verirlər;

2. Çoxmənalı sözlərin nitq inkişafında rolu;

3. İfadə yazıya hazırlıq dövründə lüğət işinin aparılması;

4. Yaradıcı inşalar vasitəsi ilə bir sıra sözlərin şagirdlərin fəal lüğət ehtiyatına daxil edilməsi" [3, 6].

Göründüyü kimi, pedaqoq şagirdlərə tanış olmayan çətin sözlərin öyrədilməsi zamanı onların nitqindəki rolun nəzərə alınmalı olduğunu xüsusi vurğulamışdır. Müəllif çətin sözlər anlayışını həm də orfoqrafik baxımdan çətin mənimsənilən sözlərə də aid etmişdir.

Ana dili tədrisi metodikası sahəsində xüsusi xidmətləri olan professor Y.Kərimov da "çətin sözlər" anlayışının mahiyyətini lüğət üzrə iş prosesində təqdim etmişdir. Burada termini ayrı-ayrı kontekslərdən deyil, sırf lüğət işinin əsaslarının tərkib hissəsi kimi vermişdir. O, çətin sözləri məzmunca "şagirdlərə tanış olmayan və az tanış olan sözlər" kimi açıqlamışdır. Şagirdlərdə sözə həssas münasibət formalaşdırmaq üçün aparılan üsul və vasitələri müqayisəli şəkildə təqdim edən pedaqoq rus metodistlərinin fikirlərini də ayrı-ayrılıqda təhlil etmiş və problemə metodik aydınlıq gətirmişdir.

Onun mövzu üzrə apardığı eksperiment materiallarına da diqqət etdikdə tədqiqatın hansı istiqamətdə müəyyənləşdirildiyini görmək mümkündür. Bunun üçün seçilmiş mətnə (birinci mərhələdə "İlk bahar", ikinci mərhələdə isə "Mayak") və əsas məqsədə ("Uşaqların tanış olmayan və az tanış olan sözləri seçmə bacarığını müəyyənləşdirmək") nəzər yetirsək, alimin təhlillərini daha aydın dərk edə bilərik [3, 106 - 112].

Metodist alim belə sözlərin öncə məna baxımından izah edilməsini daha səmərəli sayır. O, lüğət üzrə işin qrammatika və orfoqrafiyanın tədrisi ilə qarşılıqlı əlaqəsində çətin sözlərin mahiyyətindən doğan orfoepik cəhətdən izah məsələsinin diqqətdən yayınmamasını nəzərə çarpdırır [2, 133].

Y.Ş.Kərimovun son onillikdəki təhlillərində isə əvvəlki şərhlərindən uzaqlaşma və ya məsələyə yeni baxış təqdim etməsi nəzərdən yayınmır. "Yazılışı çətin sözlər üzərində işin təşkili" sərlövhəli material orfoqrafiya təlimi bölməsinə daxil edilmiş və yalnız sözlərin yazılış xüsusiyyətləri diqqət mərkəzində saxlanılmışdır: "Yazılışı çətin sözlər termini əslində şərtidir. Əgər uşağın nitqinin, ümumi inkişafının səviyyəsi, məktəbə nə kimi hazırlıqla gəlməsi, şəhərdə və ya kənddə yaşaması, nitqinə hansı dialektin təsir göstərməsi, intellektual hazırlığı, fərdi xüsusiyyətləri nəzərə alınarsa, bizim çətin hesab etdiyimiz bəzi sözlərin isə onlar üçün çətin olması aşkara çıxar", "yazılışı çətin sözlərin xarakteri və mənbələri müəllimə imkan verir ki, şagirdlərin hazırlığına, proqram tələblərinə, yerli şəraitə uyğun sözlər seçsin, lakin bu vəzifənin çətinliyi nəzərə alınaraq proqramda hər bir sinif üçün yazılışı çətin sözlərin minimumu verilmişdir" [7,

358-359].

Professor A.Rəhimov məsələyə orfoqrafiya çərçivəsində yanaşmış və "yazılışı çətin sözlər" adı altında qısa təhlillər vermişdir [5, 320]. Onun fikrincə, yazılışı çətin sözlər iki qrupa ayrılır:

a) heç bir ümumi orfoqrafik qaydaya tabe olmayan sözlər;

b) ədəbi tələffüzlə yoxlanmayan sözlər [4, 341].

Buradan aydın olur ki, pedaqoq "çətin sözlər" anlayışını yalnız bir yönümdə izah etmişdir.

Bütün bunlar onu göstərir ki, metodik araşdırmalarda çətin sözlər üç istiqamətdə şərh olunmuşdur:

1) orfoqrafik baxımdan yazılışı çətin sözlər;

2) orfoepik baxımdan deyilişi çətin sözlər;

3) semantik baxımdan mənaca tanış olmayan sözlər.

Fikrimizcə, bu yanaşmalar zəncirvari şəkildə bir-biri ilə bağlıdır və təlim prosesində kompleks şəkildə öz metodik həllini tapmalıdır .

Mövzunun elmi yeniliyi ondadır ki, "çətin sözlər" anlayışı metodik baxımdan geniş anlamda açıqlanmışdır.

Mövzunun praktik əhəmiyyəti: "Çətin sözlər" anlayışının əsl mahiyyətinin təqdim edilməsi bu istiqamətdə aparılacaq işlərə birbaşa müsbət təsir göstərə bilər.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əfəndizadə Ə. Yazılışı çətin sözlər və onların öyrənilməsi yolları. Bakı: Azərtədrisnəşr, 1964, səh. 58.

2. Məlikova T. Yazılışı çətin sözlər üzərində iş. // Kurikulum, 2013, №1. səh. 93-94.

3. Mikayılov K. Şagirdlərin lüğət ehtiyatının zənginləşdirilməsi (V sinif Azərbaycan dili dərsləri üzrə). Bakı: Maarif, 1968, səh. 128.

4. Rəhimov A. Ana dilinin tədrisi metodikası (ibtidai siniflərdə). Bakı: Nurlan, 1997, səh. 360.

5. Rəhimov A. Ana dilinin tədrisi metodikası (ibtidai siniflərdə). Bakı: Nurlan, 2003, səh. 408.

6. Kərimov Y. İbtidai siniflərdə Azərbaycan dili dərslərində lüğət işinin əsasları. Bakı: Maarif, 1968, səh. 216.

7. Kərimov Y. Ana dilinin tədrisi metodikası (Dərslik). Bakı: Nasir, 2005, səh. 520.

**С.Гасанова**

**Сущность понятия "трудные слова" и раскрытие его с методической точки зрения**

**Резюме**

В научной статье раскрывается сущность понятия "трудные слова", в том числе представляется описание в широком и узком его смысле. Здесь также нашли свое отражение краткой форме исследования педагогов в этом направлении. В результате была представлена настоящая сущность понятия "трудные слова", пояснение понятия с точки зрения орфографии, орфоэпии и семантики.

**S.Hassanova**

**"The essence of "difficult words" and disclosure from methodological standpoint**

**Summary**

In this article the essence of difficult words are explained, at the same time their explanation is introduced in concrete and broad meaning. On these issue teachers carried out researches, analyses and made presentations. As a result the main essence of the terminology of difficult words and their orthographical, orthopedically and semantically explanation was introduced.

# ANA DİLİMİZ – MİLLİ QÜRURUMUZDUR

**Kəmalə Əliyeva**
***Bakı şəhəri 234 nömrəli orta məktəbin***
***Azərbaycan dili və ədəbiyyat müəllimi***

***Açar sözlər:*** *dövlət dili, milli qürur, bədii əsərlər, lirik şeirlər.*
***Ключевые словы:*** *государственный язык, национальная гордость, художественные произведения, лирические стихотворения.*
***Key words:*** *state language, pride, fictions, lyrical poems.*

Azərbaycan dilinin dövlət dili səviyyəsinə yüksəldilməsində ciddi addımların müəllifi olan ümummilli liderimiz Heydər Əliyev demişdir: "Bu gün müstəqil bir dövlət kimi ən çox fəxr etdiyimiz bir də odur ki, bizim gözəl Azərbaycan dilimiz var. Azərbaycan dilinin formalaşmasında, inkişaf etməsində, bugünkü səviyyəyə çatmasında yazıçılarımızın, şairlərimizin, ədəbiyyatşünasların, dilçi alimlərin xidməti var".

Qədim diyarımız Azərbaycan adı bizim dilimizin adında yaşayır. Məktəblərimizdə 21 fevral – Beynəlxalq Ana Dili Günü həmişə təntənə ilə qeyd olunur. Doğma Azərbaycanımızın özü qədər qədim, özü qədər müqəddəs dilimizdən fəxrlə danışmağa haqqımız vardır: "Ana dilində xalqın əqli, hikməti" vardır.

Ona görə də hər bir Azərbaycan dili və ədəbiyyat müəllimi çalışmalıdır ki, şagirdinin canında, qanında olan bu məhəbbət hissi daha da gücləndirilsin, dilimizin tarixi, quruluşu, zənginliyi, musiqililiyi haqqında ətraflı məlumat verilsin, xalqımıza, dilimizə ehtiram aşılansın.

Müxtəlif dövrlərdə görkəmli şəxsiyyətlər dilimizə yüksək qiymət vermişlər. X əsr dilçisi Mahmud Kaşğarlı türk dünyasının ensiklopediyası sayılan "Divani-lüğəti-ət-türk"əsərini müqəddəs peyğəmbərimiz Məhəmməd salavatullahın bu kəlamı ilə başlayırdı: "Türk dilini öyrənin! Onların uzun sürən hakimiyyəti vardır". Müasir türkologiya üçün önəmli mənbə sayılan bu əsərdə daha sonra yazılırdı: "Dərdini dinlədə bilmək və türklərin könlünü almaq üçün onların dilləri ilə danışmaqdan başqa yol yoxdur".

XI əsr Azərbaycan şairi, "Divan" ədəbiyyatının ilk ən qüdrətli nümayəndəsi Qətran Təbrizi dilimizi "ruhumuzun ölçüsü" kimi dəyərləndirmiş, XII əsrdə Şirvanşahlar sarayında məliküş-şüəra olmuş Əbül-üla Gəncəvi dilimizi "könül dəryasındakı söz gövhərinə carçı" adlandırmışdır.

XII əsr görkəmli Azərbaycan şairi Əfzələddin Xaqani Şirvani "Töhfətül-İraqeyn" poemasında "dil" sözünü 2 mənada – danışıq üzvü və ünsiyyət vasitəsi kimi işlətmiş, dilin, sözün qüdrətini vəsf etmişdir.

XIV əsrdə Azərbaycan türkcəsində fəlsəfi şeirin ilk və ən qüdrətli nümunələrini yaradan İmadəddin Nəsimi qəzəllərindən birində:

Heç kimsə Nəsimi sözünü fəhm edə bilməz,

Bu, quş dilidir, bunu Süleyman bilir ancaq, - deməklə bir tərəfdən özünün əsl hürufi kimi rəmzlərlə danışmasına işarə edirdisə, digər tərəfdən dilimizin yalnız peyğəmbərlərə əyan olan bir qüdrətə malik olmasını göstərirdi.

XV əsrdə 16 yaşında Səfəvilər dövlətini yaradan Şah İsmayıl Xətayi Azərbaycan dilini bu dövlətin rəsmi dövlət dili səviyyə-

sinə qaldırmış, təkcə rəsmi sənədlərin bu dildə aparılması ilə kifayətlənməmiş, özü də bu dildə bədii əsərlər – lirik şeirlər, "Nəsihətnamə" və "Dəhnamə" məsnəvilərini yazmışdır. O, "Dəhnamə" poemasında yazırdı:

Gah dili əcəm, gah ərəbdir,
Ba rəsmi-üsul ba ədəbdir.

Bununla şair dövrünün məktub dilinə etiraz edir, tam Azərbaycan dilində məktublaşmağa üstünlük verirdi.

XVI əsrdə qəzəl dahisi Məhəmməd Füzuli "Ənisül-qəlb" qəsidəsində özünün dil haqqında fikirlərini əks etdirərək yazır ki, o, ana dilində yazıb-yaratmağa hədsiz dərəcədə zəruri bir iş kimi baxmışdır. Təsadüfi deyildir ki, o, dahi Nizaminin farsca yazdığı "Leyli və Məcnun" əsərini türkcə yazmaq ehtiyacı duymuş və bu işi böyük sənətkarlıq məharəti ilə icra etmişdir.

XVII əsrdə Məsihi dilimizi yüksək qiymətləndirmiş, "Vərqa və Gülşa" əsərində bu dilə ögey münasibət bəsləyənlərə etirazını bildirmişdir:

Türki dilini qoyər rəsuli,
De, necə olur xuda qəbuli?

XIX əsr böyük Azərbaycan mütəfəkkiri, görkəmli dramaturq M.F.Axundov Azərbaycan dilini "dünya dillərinin daha şirini" adlandırmışdır. Məşhur ədəbiyyatşünas və pedaqoq Firudin bəy Köçərli isə Azərbaycan dilini "bütün müsəlman Şərqinin ən gözəl və ən çox işlənən bir dili" adlandıraraq yazırdı: "Hər millətin özünəməxsus ana dili var ki, onun məxsusi malıdır. Ana dili millətin mənəvi diriliyidir, həyatının mənası mənziləsindəndir. Ana südü bədənin mayesi olduğu kimi, ananın dili də ruhun qidasıdır. Hər kəs öz anasını və vətənini sevdiyi kimi, ana dilini də sevir".

Görkəmli ictimai xadim və yazıçı Sultan Məcid Qənizadə yazırdı: "Həqiqətən də Azərbaycan dili öz təbiətinə görə çox elastikidir və asanlıqla zərif üslubi formalara düşmə bacarığına malikolma xüsusiyyətləri ilə fəxr edə bilər". Görkəmli yazıçı-publisist Nəriman Nərimanov isə: "Firəng dili Avropada nə məqama haiz isə bizim ana dilimiz Asiyada o məqama haizdir" – deyə fəxrlə bildirmişdir.

Cəlil Məmmədquluzadə 1917-ci ildə yazdığı "Azərbaycan" məqaləsində:

"- Dilim nə dilidir?

Azərbaycan dilidir", - deyə bəyan edir, xalqa məhz onun ana dilində müraciət etməyi vacib sayırdı. O, ana dilimizdə danışmağı ar bilən ziyalılara müxtəlif publisistik məqalələri və məşhur "Anamın kitabı" dramı ilə etirazını bildirmişdir.

Böyük sənətkarımız - xalq şairi Süleyman Rüstəm "Təbrizim" şeirində milli köklərimizdən uzaqlaşdırmaq üçün ana dilimizə təcavüz edilməsinə öz kəskin etirazını bildirmişdir.

Cənublu şairimiz Məhəmmədhüseyn Şəhriyar ana dilimizin keşiyində mərdi-mərdanə dayanır, bu dildə möhtəşəm sənət əsərləri yaradırdı. "Türkün dili" şeirində o , üzünü bütün azərbaycanlılara tutaraq belə deyirdi:

Türkün dilitək sevgili, istəkli dil olmaz,
Ayrı dilə qatsan, bu əsil dil əsil olmaz.

Böyük şairimiz Bəxtiyar Vahabzadə "Latın dili" şeirində:

"Mən azadam, müstəqiləm" sözlərini öz dilində deməyə də ixtiyarın yoxsa əgər, de kim sənə azad deyər?! – deməklə dilimizin sıxışdırılması ilə bağlı narahatlığını bildirmiş, müxtəlif şeirlərində ana dilini "xalqın əqli, hikməti", "söz hünəri, söz bayrağı", "xalqın pasportu" adlandırmışdır.

Mənim ana dilim – mənim kimliyim,
Pasportum, özümə öz hakimliyim, -

deyən şair ana dilində danışmağı ar bilənlərə kəskin iradını bildirirdi.

İstiqlal şairimiz Xəlil Rza Ulutürk: "Sağdır dilim, demək, sağdır milyard yaşlı məmləkətim" deyərək ana dilində danışmağı bacarmayanları tənqid edirdi:

Xalq şairi Nəbi Xəzri ana dilimizi "günəşə, şəfəqə, bəzən qəzəblə çaxan şimşəyə" bənzədir, Balaş Azəroğlu isə onu "çox

döyüşlər, çox qanlar görmüş pəhləvan, inqilablar, üsyanlar görmüş dağ dözümlü qəhrəman” adlandırır.

Çağdaş Azərbaycan ədəbiyyatının aparıcı simalarından biri olan Zəlimxan Yaqub “ruhumuza işləyən, qanımıza hopan, sazın pərdəsindən süzülən”, “bayatı beşiyi, layla yuvası” olan tarlı-kamanlı dilimizi vəsf edərkən demişdir:

Füzuli zirvəli, Vaqif arxalı,
Mənim Qorqud dilim, Ələsgər dilim.
Ömrümün naxışı, bəxtimin xalı,
Dadda, şirinlikdə bal, şəkər dilim!

XIX əsrdə Azərbaycan dili ümumən Orta Asiyada, xüsusən də Qafqazda yaşayan xalqlar arasında ümumi anlaşma vasitəsi olmuş, hətta Qafqazın bir sıra xalqlarından olan aşıqlar öz qoşmalarını, əsasən, Azərbaycan dilində söyləmişlər.

XIX əsr böyük rus şairi M.Y.Lermantov 1837-ci ildə dostu S.A.Rayevskiyə məktubunda yazırdı: “Tatarca (yəni azərbaycanca) öyrənməyə başlamışam. Avropada fransız dilini bilmək nə qədər zəruridirsə, burada və ümumiyyətlə, Asiyada bu dili bilmək bir o qədər vacibdir”.

Ümummilli liderimiz Heydər Əliyev cənabları dilimizə, onun incəliklərinə yaxşı bələd idi, dilimizin üslubi imkanlarından, hər bir söz və ifadənin müxtəlif məna çalarlarından yerində və məqsədyönlü istifadə edirdi. O, azərbaycanlı olduğu ilə fəxr etdiyi kimi, Azərbaycan dili kimi zəngin ana dili olduğu üçün, məhz bu dildə danışdığı üçün də qürur duyurdu və bunu fəxrlə etiraf edirdi: “Dilimiz çox zəngin və ahəngdar dildir, dərin tarixi kökləri vardır. Şəxsən mən öz ana dilimi çox sevir və bu dildə danışmağımla fəxr edirəm”.

Bu böyük insan müdrik bir ağsaqqal kimi bizlərə-öz həmvətənlərinə, soydaşlarına nəsihət edirdi: “Öz dilinizi heç vaxt unutmayın və öz ana dilinizi başqa dilə dəyişməyin”.

Ümummilli liderimiz demişdir: “Millətin milliliyini saxlayan onun dilidir. Şübhəsiz ki, musiqi də, ədəbiyyat da, ayrı-ayrı tarixi abidələr də millətin milliliyini təsdiq edir. Amma millətin milliliyini ən birinci təsdiq edən onun dilidir. Əgər Azərbaycan dili olmasa, Azərbaycan dilində mahnılar olmaz, musiqi olmaz. Bunların hamısı bir-birinə bağlıdır. Azərbaycan dilinin dövlət dili kimi yaşaması, möhkəmlənməsi, inkişaf etməsi də bizim ən böyük nailiyyətlərimizdən biridir. Bu, təkcə dil məsələsi deyil, bu, həm də azərbaycançılıq məsələsidir”.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı, 1995.

2. “Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında” 18 iyun 2001-ci il tarixli Sərəncamı. “Azərbaycan” qəzeti, 19 iyun 2001.

3. “Azərbaycan Əlifbası və Azərbaycan dili gününün təsis edilməsi haqqında” 9 oktyabr 2001-ci il tarixli Sərəncam. “Azərbaycan” qəzeti, 10 oktyabr 2001.

**К.Алиева**

**Родная речь - национальная гордость**

**Резюме**

В статье повествуется о возвышении азербайджанского языка на уровень государственного и об удачах, завоеванных в этой области. Приводятся ссылки на мысли классиков об азербайджанском языке.

**K.Aliyeva**

**Mothertongue is national pride**

**Summary**

The article is dedicated to Azerbaijan language which has become state language and gained successes in this field. Some opinions of Azerbaijan classics are also investigated.

# BİR DƏRSİN NÜMUNƏSİ

**Sevil Abdinova**
***S.C.Pişəvari adına humanitar fənlər gimnaziyasının müəllimi***

Təlimin təşkilinə verilən tələblər əsas götürülərək yeni təlim üsullarından istifadə etməyin bir nümunəsi kimi III sinifdə "Sifət" mövzusu seçilmişdir. Bu mövzu şagirdlərə ilk anlayış kimi verildiyindən onların səviyyəsinə uyğun qurulmuşdur.

**Dərsin məqsədi:** ***Leksik və qrammatik mənalarına görə sözləri adlandırıb, fərqləndirmişdir.***

**Bunun üçün:** ***1. Sifətləri məna növlərinə görə (əlamət və keyfiyyət) fərqləndirmək;***
***2. Əlaməti bildirən sözləri tanımaq;***
***3. Sifətin isimlə bağlılığını müəyyənləşdirmək.***

***Dərsin tipi:*** ***Öyrədici***
***İnteqrasiya:*** ***Ana dili, Həyat bilgisi, Riyaziyyat***
***İş forması:*** ***Kollektivlə və qruplarla iş.***
***İş üsulu:*** ***Beyin həmləsi, müzakirə, problemli vəziyyət.***
***Resurslar:*** ***Dərslik, iş dəftəri, iş vərəqləri, şəkillər və s.***

***Dərsin gedişi:***

Zəng vurulur.
Sinif dərsi salamlaşma ilə başlayır.

***Gəlin, gəlin, uşaqlar,***
***Bu gün görüşümüz var.***
***Gəlin, əl-ələ tutaq,***
***Dostluq dövrəsi vuraq.***
***Əvvəlcə salamlaşaq,***
***Sonra dərsə başlayaq.***

Müəllim sinfə müraciət edir.
Biz həftənin beş günü məktəbə gəlir, yeni bilik öyrənməyə səy göstəririk.
M:- Bəs, siz istirahətinizi necə təşkil edirsiniz?
Ş:- Gəzintiyə gedirik;
Ş:- Əlavə kitablar oxuyuruq;
Ş:- Televizora baxırıq.
M:- Televizorda əsasən nələrə baxmağı sevirsiniz?
Ş:- Cizgi filmlərinə;
Ş:- Bədii filmlərə.
M:- Kim, hansı cizgi film və bədii filmlərə baxdığını deyər?
Ş:- "Tom və Cerri ";
Ş:- "Şirinlər";
Ş:- "Bir qalanın sirri";
Ş:- "Sehrli xalat";
Ş:- "Şərikli çörək".

M:- Afərin!

Bəs kim deyər adlarını çəkdiyiniz bu filmlərdən biri olan “Sehrli xalat”da əsas söhbət nədən gedir?

Bu filmdə hansı qəhrəman və obrazlar var?

Onların filmdəki rolları nədən ibarətdir?

Ş:- Rəşid, Zərifə, Xan, Sehrbaz və başqaları.

Ş:- Şagirdlərin sarayı bəzəmələri;

Ş:- Sehrbazın onlara xalat verməyi;

Ş:- Rəşidlə Zərifənin bu xalatla keçmişə və gələcəyə yollanması və s.

M:- Deməli, onlar bu xalatla keçmişə səyahət edirdilər.

İndi isə gəlin, biz də onlar kimi keçmişimizə qayıdaq. Görək orada bizi nələr gözləyir?

Bu zaman monitorda “Sevimli qəhrəmanlar” bölməsindən olan obraz və qəhrəmanların təsvirləri “Sehrli xalat” filmində ifa olunan musiqi ilə canlandırılır.

(Karlson, Dədə Qorqud, Basat, Göyçək Fatma, Fitnə, Şahzadə və Tom, Qavroş, Qaraca Qız, Qaraca Çoban və başqaları).

***Motivasiya:***

İndi isə gəlin görək bu qəhrəmanlarımızın bizə tapşırığı nədən ibarətdir? Gəlin diqqətlə onların verəcəkləri sual və tapşırıqlara baxaq, yadımızda saxlayaq.

Monitorda “Sevimli qəhrəmanların” təsvirləri və özləri ilə bərabər gətirdikləri tapşırıqlar canlanır.

***Karlson*** – Mən Balaca oğlanın qeyri-adi dostuyam. Kim mənim adımda olan ikinci hecanın birinci hərfini tapa bilər?

Ş:- **“S”**

***Molla Nəsrəddin*** – Mən həmişə zülmkar, nadan, haqsız insanlara qarşı gülmüş və bu gülüşümlə bir çox insanı düşündürmüşəm. Mənim adımda olan qoşa samitlərdən sonra gələn incə sait hansıdır?

Ş:-**“İ”**

***Fitnə*** - Mən öz hərəkətimlə Bəhram şaha sübut etdim ki, yaxşı ov etmək heç də məharət deyil. Siz tapın, mənim adımın ilk hərfi nədir?

Ş:-**“F”**

***Qaraca Qız*** – Bəlkə də mən kasıb olduğum üçün xanım məni gözəl qızı olan Ağca ilə oynamağa qoymurdu. Bu xanımın adı iki müxtəlif sözün birləşməsindən yaranan mürəkkəb sözdür. Əlifba sırasında gələn yeddinci hərf onun adının birinci hecasını yaradıb. Bu hərf hansıdır?

Ş:-**“Ə”**

***Təpəgöz*** – Məni nəhəng olduğuma və çox yediyimə görə evdən uzaq bir yerə apardılar. Tək gözüm vardı, onu da Basat çıxartdı. Adımın baş hərfini tapın.

Ş:- **“T”**

M:- Gəlin, indi qəhrəmanlarımızın bizə verdikləri sualların cavablarını toplayaq görək nəticədə nə alınacaq?

Ş:- ***SİFƏT.***

M:- Xatırlayırsınızsa, bu qəhrəmanlarımız bir-birlərindən müəyyən xüsusiyyətlərinə görə fərqlənirlər. Hətta onların bizə çatdırdıqları suallarda da bu öz əksini müəyyən qaydada tapmışdı.

***Tədqiqat sualı:***

İnsanları, ətrafımızda gördüklərimizi bir-birindən hansı əlamət və keyfiyyətlərinə görə fərqləndiririk?

**M:**- Biz bu gün bütün dərs ərzində gördüyümüz sual ətrafında araşdırmalar aparıb nəticədə bu sualın cavabını tapacayıq.

İndi isə gəlin, bu sualın cavabını tapmaq üçün qruplarda iş görək.

***Tədqiqatın aparılması:***

Şagirdlərin sayı nəzərə alınaraq sinif altı nəfərdən ibarət beş qrupa bölünür.

Beləcə həm bütün sinif yeni mövzu ətrafında işləyir, həm də "Sifət"in əlamət və keyfiyyətləri ayrı-ayrılıqda araşdırıla bilir.

Tapşırıqlara başlamazdan əvvəl müəllim lövhədə qruplarla iş zamanı gözlənilməsi lazım olan əsas qaydaları izah edərək bir daha nəzərlərinə çatdırır və bu qaydalara əməl etmələrinin vacibliyini qeyd edir.

Şagirdlərin nəzərinə çatdırılır ki, bu meyarların onların qiymətləndirilməsində də xüsusi rolu var.

Daha sonra onlara bu tapşırıqları 10 dəqiqə ərzində yekunlaşdırmaları deyilir.

*QIZIL QAYDALAR*

**1.Bir-birinizlə əməkdaşlıq etmək;**
**2.Bir-birinizin sözünü kəsməmək;**
**3.Bir-birinizi dinləməyi bacarmaq;**
**4.Fikirlərinizə hörmət etmək;**
**5.Qruplar arasında sağlam rəqabət aparmaq.**

**I QRUP:**

***"GÖY QURŞAĞI"***

***Təbiətdə.***

*Payız fəsli idi. Hər tərəf al-əlvan rəngə boyanmışdı. Ağaclar yaşıl donunu dəyişmiş, yarpaqlar qırmızı, sarı, qızılı rənglərlə əvəz olunub xəzələ çevrilmişdilər. Səma əvvəlki kimi mavi olsa da, qara buludlar parlaq günəşin qarşısını kəsmişdi.*

**Tapşırıq-1.**

***Mətndən əlamət və keyfiyyət bildirən sözləri seçib yazın və sifətin hansı formasına aid olduğunu qeyd edin.***

***Tapşırıq-2.***

***Verilmiş varlıqların rəngini yaz.***

***Pomidor-*** ***Kələm-***
***Neft-*** ***Şabalıd-***
***Portağal-*** ***Limon-***

**II QRUP:**

**"XARAKTER"**

**Ailəmiz.**

*Sadəlik ən gözəl insani keyfiyyətlərdən biridir. Hansı ki, bu mehriban ailə təməlinin qurulmasına təsir göstərən müsbət amillərdən biridir. Qayğıkeş ata, sevimli və gülərüz ana ailəni qoruyub saxlamağa qadirdir. Lovğa insan ailəsini uçuruma apara bilər. Səbrli və təmkinli insan isə ailəsini hər çətinlikdən çıxara biləcək qədər qüvvəyə malikdir.*

***Tapşırıq-1.***

***Mətndəki əlamət və keyfiyyət bildirən sözləri seçib yazın.***
***Sifətin hansı formasına aid olduğunu deyin.***
***Tapşırıq-2.***
***Verilmiş sözləri cümlədə işlədin.***
***Mərd, ağıllı, göyçək, qoçaq.***

**III QRUP:**
**"ŞİRİNLƏR"**
**Mətbəxdə.**

*Aydın mətbəxdən gələn ləziz yeməklərin qoxusunu hiss edib ora getdi. O, anasından şorbaya acı bibər vurmamasını xahiş etdi.*

*Dadlı şorbanı yedikdən sonra anasının bişirdiyi şirin kökələrdən yedi. Turş limon dilimi salınmış ətirli çayı bəh-bəhlə içdi.*

***Tapşırıq-1.***
***Mətndən əlamət və keyfiyyət bildirən sözləri seçib yazın.***
***Daha sonra qarşısında sifətin hansı formasına aid olduğunu qeyd edin.***
***Tapşırıq-2.***
***Təamları aid olduqları keyfiyyətləri ilə birləşdirin.***

| | |
|---|---|
| ***Pendir*** | ***Şirin*** |
| ***Limon*** | ***Acı*** |
| ***Tort*** | ***Turş*** |
| ***Bibər*** | ***Şor*** |

**IV QRUP:**
**"FORMA"**
**Oyuncaqlarım.**

*Zaur yoldaşlarını oyuncaqları ilə tanış etmək qərarına gəldi. O, yumru toplarını, qalın kartonlardan kəsib düzəltdiyi uzunsov avtobuslarını, yoğun ağac budağından hazırladığı raketi göstərdi. Zaur çox sevinirdi. Çünki ilk dəfə idi ki, əl işlərini nümayiş edirdi.*

***Tapşırıq-1.***
***Mətndən əlamət və keyfiyyət bildirən sözləri seçib yazın.***
***Bu sözlər sifətin hansı formasını bildirir.***
***Tapşırıq-2.***
***Gündəlik həyatımızda rast gəldiyimiz, ətrafımızda gördüyümüz varlıqların bir neçəsinin formaca əlamətini yazın.***

**V QRUP:**
**"CANLILAR"**
**Heyvanxanada.**

*Canlı varlıqların bir nümunəsi olan heyvanlar müxtəlif olur. Onlardan bir neçəsi ilə tanış olmaq üçün heyvanxanaya getmək olar. Orada böyük ayıları, nəhəng qartalı, uzun xortumu olan fili, qısa ayaqları olan dovşanları, hündür zürafələri görmək mümkündür.*

***Tapşırıq-1.***
***Mətndən əlamət və keyfiyyət bildirən sözləri seçib yazın.***
***Sifətin hansı formasına aiddir?***
***Tapşırıq-2.***

***Verilmiş sözlərin yaxınmənalılarını yazın.***
***Böyük-***
***Kiçik-***
***Qısa-***

**İnformasiyanın mübadiləsi:**

Qruplar işlərini yekunlaşdırdıqdan sonra sıra ilə qrup liderləri tapşırıqlarını nümayiş edirlər.

Müəllim və digər şagirdlər diqqətlə dinləyib qeydlərini aparırlar. Əlavələrini münasibət bildirməklə çatdırırlar.

Şagirdlərin yorğunluğunu nəzərə alaraq musiqili idman dəqiqəsi keçirilir.

***Çiyinlərim, çiyinlərim,***
***Qoy açılsın düyünlərim.***
***Əyilərik, qalxarıq,***
***Təndirə çörək yaparıq.***
***Sonra ruzi dilərik***
***Əlhəmdüllah deyərik.***

**İnformasiyanın müzakirəsi:**

Sistemləşdirilmiş şəkildə informasiyanın müzakirəsi təşkil edilir. Bu zaman dərsliyin 126-cı səhifəsinə nəzər salınaraq, nəzəri bilik bir neçə şagird tərəfindən oxunur.

***Birinci tapşırıq sxem şəklində izah olunur.***

***1.rəng ---------------------- yaşıl ot***
***əlamət-----------------2.ölçü ---------------------- böyük bina***
***3.forma -------------------- dairəvi meydan***

***1.dad -------------- acı bibər***
***keyfiyyət ------------------ 2.mənəvi cəhətlər -------------- inadkar uşaq***

Bu sxemin izahı ilə şagirdlərin nəzərinə bir daha çatdırılır ki, əlamət zahiri xüsusiyyətləri, yəni gözlə görülən; keyfiyyət isə daxili xüsusiyyətlər, yəni gözlə görünməyənlər nəzərdə tutulur.

Digər tapşırıqlar isə böyük qruplar şəklində yerinə yetirilir.

**Yaradıcı tətbiqetmə.**

Bu mərhələdə müəllim şagirdlərə yaradıcılıq işləri verir. Onlara müraciət edərək izah edir.

**M**:- İndi isə mən istərdim ki, sizin yeni mövzumuzu daha geniş mənimsəmə səviyyənizi yoxlayım.

Bunun üçün sizə müəyyən sözlər veriləcək və siz bu sözləri yaradıcılığınızla tətbiq edəcəksiniz.

Yenə şagirdlər qruplara bölünür və tapşırıqları təqdim olunur.

**I QRUP:**

Əlamət və keyfiyyət bildirən sözlər verilir.
Bu sözlərin işləndiyi atalar sözləri yazırlar.
Yaxın, dar, isti, acı, yaxşı, ağıllı.

**II QRUP:**

Varlıqların şəkilləri verilir.

Bu varlıqlara aid əlamət bildirən sözlərdən istifadə etməklə tapmacalar tərtib edirlər.

Qarpız, zürafə, ayı, göy qurşağı, meymun, günəbaxan

**III QRUP:**

Kiçik mətn verilir.

Bu mətni genişləndirirlər.

Qış gəldi. Qar yağır. Uşaqlar həyətdə oynayır. Şaxta onların üzünü qızartmışdı. Onlar görünürdülər.

Təbiət rəngə boyanmışdı. Buzlar sallanır. Ağaclar don geyinib.

**IV QRUP:**

Meyvə səbəti verilir.

Bu meyvələri əlamət və keyfiyyətlərinə görə qruplaşdırıb yazırlar.

Alma, armud, nar, üzüm, portağal.

**V QRUP:**

Şəkil verilir. Bu şəklə əsasən kiçik mətn tərtib edirlər.

Mətnə ad qoyurlar. Əlamət və keyfiyyət bildirən sözlərdən istifadə edirlər.

Qruplar yaradıcılıqlarını nümayiş etdikdən sonra dərslik və iş dəftərində olan tapşırıqlardan bəziləri ev tapşırığı olaraq verilir.

**Nəticələrin çıxarılması və ümumiləşdirmə.**

Nəticə və ümumiləşdirmə tədqiqat sualına əsasən aparılmalıdır.

Tədqiqat sualı yenidən lövhədə göstərilir. Eyni zamanda qruplarla işə başlamazdan əvvəl söylədikləri fikirlər də yenidən təqdim olunur və müqayisə olunur.

Ümumiləşdirici suallarla müraciət olunur.

**M:**-Biz bu gün bu sual ətrafında tədqiqat aparmaq üçün qruplarla işlədik və nəticədə hansı cavabı aldıq?

**Ş:**- Varlıqları əlamət və keyfiyyətlərinə görə fərqləndiririk.

**M:**- Sifət nəyə deyilir?

**Ş:**- Varlığın əlamətini və keyfiyyətini bildirən nitq hissəsinə.

**M:**- Sifətin sualları hansılardır?

**Ş:**- necə? nə cür? hansı?

**M:**- Bugünkü dərsimiz əsasında daha nəyi öyrəndik?

**Ş:**- Sifətin isimlə bağlı olub, ismə aid olduğunu və isimdən sonra gəldiyini .

**Ev tapşırığı:**

Dərslik və iş dəftərində verilən müəyyən çalışmaların yerinə yetirilməsi tapşırılır.

**Qiymətləndirmə:**

Qiymətləndirmə meyarlar əsasında aparılır.

| Meyarlar / Qruplar | Göy qurşağı | Şirinlər | Xarakter | Forma | Canlılar |
|---|---|---|---|---|---|
| Varlıqları fərqləndirir və adlandırır | | | | | |
| Başqa nitq hissələri ilə bağlılığını müəyyənləşdirir | | | | | |
| Varlıqları adlandırır | | | | | |
| Əməkdaşlıq | | | | | |
| Yekun | | | | | |

***Psixologiya***

# AUTİZM VƏ ONA PSİXOPEDAQOJİ YANAŞMALAR

**Tünzalə Verdiyeva**
***ARTPİ-nin doktorantı***
***E-mail: tunzaleverdiyeva@mail.ru***

***Açar sözlər:*** *Autizm, psixi pozuntu, autistik təfəkkür, somatika, nevroz.*
***Ключевые словы:*** *аутизм, психическое нарушение, аутистическое мышление, соматика, невроз.*
***Key words:*** *autism, psychological violence, autistic thinking, somatic, neurosis.*

Autizmə psixi inkişafı ləngiyən, eləcə də psixi inkişafdan qalan, sosiallaşmaya çətinliklə uyğunlaşan, psixomotor inkişafında problemlər olan şəxslər aid edilir. Kliniki, psixiatrik, psixoloji-pedaqoji tədqiqatlarda başlıca olaraq autist şəxslərin psixi inkişafında pozuntuların olduğu göstərilir. Psixiatr, psixoloq və pedaqoqlar (O.C.Nikolskaya, E.P.Baenskaya, M.M.Lublinq, L.Kanner, K.S.Lebedinskaya və b.) autizmin bioloji, koqnitiv və davranış sferalarında təzahür etdiyini göstərirlər.

Autizmlə bağlı ilk və əsaslı fikir 1801-ci ildə fransız alimi Jan İtard tərəfindən irəli sürülmüş, autizmin aradan qaldırılması yolları göstərilmişdir.

İtarddan əvvəl uşağın psixi inkişafı və sosiallaşması yönümündə fransız həkimi və dövlət xadimi F.Pinel tədqiqat aparmış, sonda belə qənaətə gəlmişdi ki, o, müalicəsi mümkün olmayan idiotdur.

Uşaq autizminin əlamətlərini, onun digər psixi pozuntulardan fərqini ilk dəfə L.Kanner 1943-cü ildə yazdığı "Emosional əlaqənin autistik pozuntusu" adlı əsərində göstərmişdir.

Bununla belə autizmin tarixi çox qədimdir. Lakin o, tarixən başqa xəstəliklər, daha çox ruhi (psixi) xəstəliklər kimi qəbul olunmuş, öyrənilmişdir. "Görünür autizm bütün dövrlərdə mövcud olmuşdur. Demək olar ki, bütün xalqlarda sadəlövh, "küt" adamların davranışı ilə bağlı hadisələrin təsvirinə rast gəlmək mümkündür" (A. Françesko, s. 19).

R.İ.Əliyev göstərir ki, psixi proseslərin dərinliyini əks etdirən uydurulmuş fantastik aləm bəzi insanlarda tədricən təfəkkürü şərtləndirən amilə çevrilir. Bu hadisəyə autistik təfəkkür deyilir.

Göründüyü kimi, autizm xəstəliyinin tarixi qədim olsa da onun ayrıca xəstəlik kimi araşdırılması və qəbul olunması tarixi son 70 ilə aid edilir. Ötən dövr ərzində aparılan əksər tədqiqatlarda o, psixi pozuntu kimi qəbul edilir.

XIX əsrin I yarısından başlayaraq psixi xəstəliklərin öyrənilməsində iki istiqamət: spirityalistik və somatik istiqamətlər geniş yayılmağa başladı. Bu iki istiqamət arasında başlıca fərq psixi xəstəliklər zamanı psixikanın, yoxsa bədənin xəstələnməsi barədə fikirlərlə bağlı idi. Daha sonra fizioloji istiqamət təşəkkül tapdı və sürətlə inkişaf etməyə başladı. Bu istiqamət daha çox psixi pozuntuları beynin fəaliyyəti ilə əlaqələn-

dirirdilər.

Psixi pozuntuların irsi amillərlə bağlı olduğunu irəli sürən nəzəriyyələr də mövcuddur. XIX əsrin ortalarından başlayaraq irsiyyətlə bağlı nəzəriyyələr klinik psixiatriyada tətbiq olunmağa başlandı. Bu sahədə aparılan tədqiqatlar (Broun, Seker, Fere və b.) uşaqlar arasında psixi pozuntuların irsi amillərlə bağlı olmasına istinad edirdi.

Azərbaycanda psixiatriyanın inkişafı XIX əsrin sonlarından başlamışdır. İlk azərbaycanlı psixiatr alim kimi İ.R.Rəhimovun (1849-1924) adı xüsusi qeyd olunur. İ.R.Rəhimov Vyana (Avstriya) və İen (Almaniya) Universitetlərinin tibb fakültəsində təhsil almış, 1880-ci ildə həkimlik fəaliyyətinə başlamışdır. Sonrakı illərdə azərbaycanlı alimlərdən Ə.Ə.Abasquliyev, Ə.S.Əsgərov, X.H.Həsənov, N.B.İsmayılov və başqalarının psixiatriyanın inkişafında müstəsna xidmətləri olmuşdur. Bununla belə autizm xəstəliyi, xüsusilə uşaqlarda autizm Azərbaycanda, demək olar ki, öyrənilməmişdir.

Azərbaycanda pedaqoji, psixoloji aspektdə autizmlə bağlı, demək olar ki, heç bir tədqiqat aparılmamışdır. Təbii ki, praktikada da autizmlə bağlı hansısa işlərin görüldüyünü söyləmək çətindir. Çünki ilk növbədə autizmin əlamətləri müxtəlif olduğundan onun diaqnostikası da mürəkkəbdir. Ona görə də bir çox hallarda autizm digər xəstəliklərlə səhv salınır.

Ötən əsrin 80-ci illərinə qədər autizm, demək olar ki, yalnız psixiatrlar tərəfindən öyrənilirdi. Burada isə autizmin başlıca əlamətləri kimi sosial dezadaptasiya və kommunikasiyanın pozulması, aşağı inkişaf səviyyəsi götürülürdü. Əlbəttə, autizmi yalnız klinik göstəricilərə əsasən öyrənmək kifayət etmirdi. 80-ci illərdən başlayaraq autist uşaqların pedaqoji, psixoloji baxımdan öyrənilməsinə başlandı.

Əksər tədqiqatçılar autizmin bir əlamətinin olmasında vahid mövqe bildirirdilər. Bu, autist uşaqların birmənalı şəkildə dalğın olmasıdır. Beləliklə, autizmin klinik təsvirində mütəxəssislərin mövqeyi ziddiyyətlidir. Bu ziddiyyətlərin başlıca səbəbi isə autizmin spesifik xüsusiyyətlərindən irəli gəlir.

Autist uşaqlar hətta ən yaxın adamlarla, valideynlərlə adekvat ünsiyyətdən qaçırlar. Ətrafdakılara qarşı belə biganəlik, laqeydlik “ekstremal tənhalıq” hissi yaradır. Belə uşaqlar emosional əlaqədən çəkinir, başqa adamların hislərini başa düşmürlər. Maraqlı cəhətlərdən biri də ondan ibarətdir ki, autizmin yüngül formasında olan uşaqlar özlərindən böyük və kiçik uşaqlarla ünsiyyətə girə bildikləri halda, yaşıdları ilə ünsiyyətə girə bilmirlər.

Autizm geniş mənada yalnız insanlarla əlaqəyə girməkdən çəkinmək deyil, həm də ümumən reallıqdan ayrı düşməkdir. Autist uşaqların davranışı bir qayda olaraq ziddiyyətlidir. Onlar gah süst olur, ətrafda baş verənlərə maraq göstərmirlər. Bununla belə bəzən çox aktiv, aqressiv olur, istədikləri şeyə yüksək maraq göstərirlər.

Autist uşaqların kliniki təsvirində onlar bir qayda olaraq anomal uşaqlar kimi təqdim olunurlar. Autizmin ilkin, sadə əlamətləri çağalıq dövründən belə özünü göstərir. Lakin ola bilsin ki, ətrafdakılar, hətta valideynlər bu əlamətləri görməsinlər. Autizm özünü 3-5 yaşlardan başlayaraq təzahür etdirir. Sonrakı dövrlərdə sanki autist uşaqlar düzəlir, ”ağıllanırlar”. Tədricən affektiv potologiya azalır, lakin koqnitiv qüsurlar artır.

M.Rutterin tədqiqatları göstərir ki, beş yaşınadək nitqə malik olmayan, intellektual göstəricisi aşağı olan uşaqların sonralar sosial adaptasiyasına ümid çox azdır.

L.Letter apardığı epidemioloji tədqiqatlara əsaslanaraq göstərirdi ki, autist uşaqların İQ göstəriciləri 70 %-dən aşağıdır. L.Binqə görə, əqli geriliyi olan uşaqların 20%-də autizm əlamətləri olmuşdur.

L.Binqə görə, uşaq autizminin klassik əlamətləri ilə yanaşı, "periferik variantı" da vardır. Ehtimal edilir ki, uşaq autizminin kliniki mənzərəsi onun müxtəlif etiologiya bağlı olmasından irəli gəlir.

Uşaq autizminin etioloji əlamətləri ilə bağlı mütəxəssislər arasında fikir ayrılığı mövcuddur. L.Kanner uşaq autizminin yaranması səbəblərini valideynlərlə bağlayır. Göstərir ki, belə uşaqların valideynləri adətən yüksək intellektə və soyuq emosional sferaya malik olurlar. Onun bu yanaşmasını B.Bettelheim, L.Despert, B.Rank və başqaları da qəbul edir və digər amillərin də olduğunu qeyd edirlər. Bildirirlər ki, valideynlər bioloji cəhətdən sağlam olsalar da onların uşaqların tərbiyəsi və qarşılıqlı münasibətlərində problemlər vardır.

B.Bettelheimə görə, uşaq o dərəcədə qorxudulur, ətraf mühitlə əlaqəsi o qədər zəif olur ki, nəticədə özünə qapanır, baş verən dəyişikliklərə qarşı ya laqeyd, yaxud da affektiv münasibət göstərir. Nəticədə, autist uşaq daim qorxu və stress vəziyyətində yaşayır.

Son onilliklərdə aparılan tədqiqatlar sübut edir ki, uşaq autizmi istənilən mühitdə, istənilən ailədə baş verə bilər. Yəni valideynlərin statusu, təhsili, mədəni səviyyəsi, iqtisadi vəziyyəti heç bir əhəmiyyət kəsb etmir.

Uşaq autizminin, xüsusilə şizofreniya əlamətləri olanların daha çox irsi amillərlə bağlılığını əsas götürənlər də vardır.

Psixoloji-pedaqoji tədqiqatlarda autizm daha çox psixi inkişafdaləngimə kimi göstərilir, bu uşaqların təlim-tərbiyəsinə geniş diqqət yetirilir. Bunun üçün ilk növbədə xüsusi məktəblərdə inklüziv təhsilə ayrıca yer verilir. Onlar burada başlıca məsələ kimi kadr hazırlığını önə çəkirlər. Göstərirlər ki, inklüziv təhsillə xüsusi hazırlığı olan müəllimlər məşğul olmalıdılar.

Psixi və fiziki inkişafında problemləri olan uşaqların sağlam uşaqlarla təhsili bir sıra çətinliklər yaradır. "Normal psixi inkişafı olan uşaqlarla işləyən müəllimlər bir tərəfdən defektologiya sahəsində biliyə sahib olmur, korreksiya işlərini apara bilmir. Eləcə də bu və digər cəhətdən belə uşaqlarla işləmək istəmirlər". Bu sözləri ilə L.M.Kobrina hesab edir ki, inklüziv təhsilə ehtiyacı olan uşaqların normal inkişafı olan uşaqlarla birgə oxuması bir sıra problemlər yaradır. Digər uşaqlar onları qəbul etmir, ailədə onlara yüksək diqqət göstərildiyi halda məktəbdə əksinə olur və nəticədə bu uşaqlar məktəb həyatına alışa bilmirlər.

Autist uşaqlar üçün xarakterik olan xüsusiyyətlərdən biri də diqqətsizliklə bağlıdır. Onlar bir qayda olaraq diqqətlərini lazım olan obyektin üzərinə yönəldə bilmirlər və onlarda hiperaktivlik müşahidə olunur. Bu isə özünü uşağın davranışında, təlim fəaliyyətində, qarşılıqlı münasibətlər sistemində əks etdirir. Belə uşaqlarda nitq inkişafı və təlim vərdişləri çətinliklə yaranır. Davranış və psixikada olan bu problem uzun müddət davam etdikdə tədricən deviant davranışa çevrilir. Koqnitiv və davranışda olan pozuntu, demək olar ki, 70 % yeniyetmədə, 50 % yaşlı adamlarda qalır.

Pedaqoji-psixoloji, tibbi tədqiqatlar göstərir ki, böyüməkdə olan nəslin psixi və fiziki sağlamlığı, vəziyyəti ilbəil pisləşir. A.A.Baranov Rusiya Federasiyası üzrə statistik məlumatı şərh edərək vəziyyətin doğrudan da acınacaqlı olduğunu bildirir. O göstərir ki, sağlamlıq imkanları məhdud olan uşaqların sayı durmadan artır.

Azərbaycanda isə bu barədə statistik məlumat yoxdur.

İnkişaf etmiş ölkələrdə, xüsusilə ABŞ-da sağlamlıq imkanları məhdud olan uşaqlarla iş, onların təhsili, cəmiyyət həyatında iştirakının təmin olunması sosial siyasət kimi qəbul edilir.

ABŞ-da fiziki və psixi imkanları məhdud olan uşaqların valideynləri təhsil və so-

sial xidmət sahəsinin sifarişçiləri hüququ qazanmışlar. İlkin kömək yalnız xəstə uşaqlara deyil, onların ailələrinə də olunur. Bütün bunlar isə qəbul olunmuş qanunlarda təsbit olunur.

Qoyulmuş qaydaların pozulması məhkəmələrlə qurtarır. R.İ.Əliyev Çikaqoda baş vermiş bir hadisəni nümunə kimi göstərir: "Valideynlərdən biri məktəbi, o cümlədən məktəb psixoloqunu məhkəməyə verir. Valideynlərin qənaətinə görə onların uşağı məktəbin ümumi həyatından təcrid edilib. Uşaq vaxtının çoxunu xəstə uşaqlar üçün xüsusi sinif otağında keçirib".

Yuxarıda deyilənləri ümumiləşdirərək qeyd etmək istərdik ki, autizm bir xəstəlik kimi qədim bir tarixə malik olsa da, onun ayrıca xəstəlik kimi öyrənilməsinə ötən əsrin 40-cı illərindən başlanılmışdır. İnkişaf etmiş ölkələrdə bu sahədə kifayət qədər tibbi, pedaqoji-psixoloji tədqiqatlar aparılsa da hələlik vahid mövqeyə gəlmək mümkün olmamışdır. Azərbaycanda isə problemə son illərdə diqqət yetirilməyə başlanmışdır. Bununla belə bir neçə ədəbiyyatda autizm termini işlənsə də onunla bağlı tədqiqat aparılmamışdır. Pedaqoji-psixoloji tədqiqatlar isə ümumən yoxdur və belə uşaqların diaqnostikası, korreksiyası, onlarla təlim-tərbiyə işinin təşkili öz həllini gözləyən məsələlərdəndir.

*Rəyçilər: prof. R.Əliyev*
*dos. R.Rəhmanov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Никольская О., Баенская Е., Либлинг М. Аутичный ребенок. Пути помощи. Изд. 4-е. М.: Теревинф, 2007, 288 стр.

2. Франческа А. Введине в психологическую теорию аутизма. М.: Теревинф, 2006, 216 стр.

3. Asperger H. Autistic phychopathy in childhood / in Autism and Asperger syndrome// Ed by U.Frith. -Cambridge: Cambridge University Press.1991, p. 37-93.

4. İsmayılov N. Psixiatriya: Ali məktəblər üçün dərslik. Bakı: Maarif, 1992, 370 s.

5. Коробейников И. Нарушения развития и социальная адаптация. М.: ПЕРСЭ, 2002,191 стр.

6. Кропотов 70. Д. Современная диагностика и коррекция синдрома нарушения внимания. СПб.: Элби, 2005, 148 стр.

7. Внешняя среда и психическое развитие ребенка/ Под ред. Р.В. Тонковой-Ямпольской. М.: Медицина, 1984, 207 стр.

**Т.Вердиева**

**Психологопедагогические теории об аутизме и его анализ**

**Резюме**

В статье отмечены история изучения проблем аутизма, исследования направлений в этой области. В то же время анализируются виды и уровни аутизма. Определяется воздействие аутизма на формирование человека как личности, на социализацию и интеллектуальное развитие. Также нашли отражение педагогически-коррекционные проблемы аутизма, инклюзивного образования и прочие вопросы.

**T.Verdiyeva**

**Psycho-pedagogical approach to autism**

**Summary**

The article is dedicated to the history and researches of autism. The types and rates of autism are analyzed. The impact of autism on the person's socialization and cognitive development is also reflected. It is also spoken about pedagogical-correction problems of autism, inclusive education and other issues.

***Kurikulum***

# ШКОЛЬНЫЙ КУРИКУЛУМ В КОНТЕКСТЕ КУЛЬТУРЫ

**Аида Касумова**
***Научный работник Института проблем образования***

***Açar sözlər:*** *məktəb kurikulumu, təhsil, mahiyyət, əhəmiyyət, mədəniyyət, birincilik, özünüidarə, həyat yaradıcılığı, özünüinkişafetdirmə.*

***Ключевые слова:*** *школьный курикулум, образование, сущность, значение, культура, приоритет, самоуправление, жизнетворчество, саморазвитие.*

***Key words:*** *school curriculum, education, essence, importance, culture, championship, self-government, creative activities, self-development.*

Традиционно под образованием принято понимать процесс и результат овладения человеком определенной системой знаний, умений и навыков, а также способами мышления, необходимыми для его полноценного включения в социальную и культурную жизнь общества и выполнения определенных профессиональных функций. В этом смысле справедливо то утверждение, что образование является такой же жизнеобеспечивающей системой, как и общественное производство.

Однако образование нужно человеку не только в его практической, жизнеобеспечивающей функции. Оно необходимо ему для обретения смыслов, для духовной жизни, для творческой самореализации и самодетерминации в горизонте культуры. Перефразируя Эриха Фромма, можно сказать, что “образование необходимо человеку не для того, чтобы иметь, а для того, чтобы быть, состояться как личность и жить достойно”.

В условиях демократизации общественной жизни возникли предпосылки для восстановления человеческих смыслов и сущностных функций образования. Важнейшая из них - гуманитарная, суть которой состоит в сохранении и восстановлении экологии человека, его телесного и душевного здоровья, смысла жизни, личной свободы, духовности, нравственности. Для этого образование должно заложить в личность механизмы понимания, взаимопонимания, общения, сотрудничества.

Не менее важной является культуросозидательная функция (культурообразующая), обеспечивающая сохранение, передачу, воспроизводство и развитие культуры средствами образования. Осуществление культуросозидательной функции предполагает ориентацию образования на воспитание Человека Культуры, отбор культуросообразного содержания и воссоздание в образовательных структурах культурных образцов и норм, проектирующих зримые элементы культурной среды, культуросообразного устройства общественной жизни людей.

Необходимым условием этого является интеграция образования в культуру и, наоборот, культуры - в образование. Ку-

льтуру нельзя сохранить иначе, как через человека. Для этого образование должно заложить в него механизм культурной идентификации.

В нашем понимании культурная идентификация - это установление подобия между собой и своим народом, переживание чувства принадлежности к национальной культуре, интернационализация (принятие в качестве своих) ее ценностей, проживание собственной жизни в формах культурного бытия народа, в соответствии с такими образцами азербайджанской народной жизни, как, например, соборность, духовность, патриотическое самосознание, бытовая обрядность и др.

Культурная идентификация - необходимое условие и средство решения важнейших проблем духовного развития личности и народа. Среди них - сохранение и возрождение родного языка, взаимопонимание и взаимоуважение личностей и народов, населяющих нашу Родину, культурно-историческое наследование и историческая память, воспитание азербайджанского национального характера и др.

Третьей важнейшей функцией образования является социализация, т.е. обеспечение усвоения и воспроизводства индивидом социального опыта, свидетельствующее о его нормальном, безболезненном вхождении в жизнь общества. Социализация происходит в процессе совместной деятельности и общения в определенной культурной среде. Ее продуктами выступают личностные смыслы, определяющие отношения индивида к миру, социальная позиция, самосознание, ценностно-смысловое ядро мировоззрения и другие компоненты индивидуального сознания, содержание которых указывает на то, что личность берет себе из социального опыта, сколько берет, и как психика ее эти приобретения качественно перерабатывает, какое придает им значение.

Таким образом, осмысление сущностных функций образования с позиции личности позволяет выявить систему его антропоцентрических ценностей, которая и должна быть положена в основу гуманистического личностно-ориентированного образования. Культура предполагает культ человека. Отношение к человеку как субъекту является главным при образования, осуществляемого в контексте культуры.

Гуманный же подход состоит в том, что воспитатель оптимистически мыслит о детях, подходит к ним как к самостоятельным субъектам учения, способным учиться не по принуждению, а добровольно, по собственному желанию и свободному выбору. Иными словами, педагог исходит из того, что у каждого ребенка есть свой личностный смысл, есть личностная значимость учения, на которую и надо опираться в педагогическом процессе.

Отношение к ребенку как субъекту предполагает ценностное отношение к каждой детской личности, уважение ее самобытности, понимание того, что ребенок имеет собственную жизненную историю, собственное Я, свой внутренний мир, что ему свойственны страсти и переживания, что ребенку в любом возрасте свойственны честь и достоинство, что он жаждет справедливости, нуждается в сострадании, общении, диалоге и поддержке, что он способен мыслить и творить, наделен свободой морального выбора, может совершать ошибки, но способен к их осознанию, покаянию и возрождению к лучшему.

Из ценностного отношения к ребен-

ку как человеку, обладающему свойством субъектности, вырастает понимание цели личностно-ориентированного образования - не сформировать и даже не воспитать, а найти, поддержать, развить человека в человеке и заложить в него механизмы самореализации, саморазвития, адаптации, саморегуляции, самозащиты, самовоспитания и другие, необходимые для становления самобытного личностного образа и достойной человеческой жизни, для диалогичного и безопасного взаимодействия с людьми, природой, культурой, цивилизацией.

В становлении субъектности ребенку требуются духовная и нравственная поддержка и помощь. Ее оказывают ему педагоги, родители, другие взрослые, сотрудничающие с детьми в решении проблем их здоровья, образования, досуга и др. Эта помощь имеет гуманитарный характер, т.е. осуществляется добровольно, адресно, с любовью и уважением к детям, по нравственным мотивам заботы о подрастающем человеке, милосердного отношения к нему.

Соответственно и педагогическое управление развитием ребенка в системе культуросообразного воспитания осуществляется в формах педагогической помощи, социально-педагогической защиты, психолого-педагогической коррекции индивидуального развития, стимулирования саморазвития.

Приоритетное значение принципа культуросообразности в современной школе открывает возможности теоретического обоснования и практического воплощения нового типа образования, который мы определяем как культурологическое личностно-ориентированное образование.

Таким образом, можно констатировать, что у гуманистического воспитания и культурологического личностно-ориентированного образования общие цели, общие методологические основания, общие принципы.

Признавая закономерность такого подхода, считаем необходимым указать на возможности обогащения представлений о содержании культурологического образования с учетом потребностей и возможностей не только духовного, но и социального развития ребенка в контексте культуры. С этих позиций гуманистическое воспитание в дошкольном и младшем школьном возрасте - это процесс вскармливания и обеспечения здоровья ребенка, развития его природных способностей: ума, нравственных и эстетических чувств, потребности в деятельности, овладение первоначальным опытом общения с людьми, природой, искусством. Основные педагогические механизмы в этом возрасте включают научение, воздействие словом и примером, общение, чувственное познание жизни и узнавание ценностей культуры, эстетическое и нравственное сопереживание.

В подростковом возрасте - это процесс интенсивного физического и социального созревания личности, создающий предпосылки начала процесса культурной самоидеитификации, вхождения в мир национальной культуры, ее понимания, согласия с культурой, обретение позиции человека культуры. Основные педагогические предпосылки развития в этом возрасте - включение подростка в ситуации выбора ценностей, их осмысление, нравственно-мотивированное отношение, помощь в оценке и самооценке своих действий, поступков, культурное творчество.

Наконец, в старшем школьном возрасте смысловое значение приобретают процессы духовно-нравственной автоно-

мизации личности, физического и нравственного самосовершенствования, социально-психологической адаптации. Механизмы личностного развития существенно меняются: на первый план выступает теоретическая подготовка в сфере гуманитарных наук, диалог с культурой, интеграция знаний в целостную картину мира, культурная рефлексия, саморегуляция, принятие решений в ситуациях выбора, жизнетворчество, саморазвитие.

Понимание механизмов культурного развития личности на каждом возрастном этапе предъявляет требование адекватности не только к содержанию, но и к технологиям образования. Приоритетное значение в системе культурологического личностно-ориентированного образования в младшем школьном возрасте приобретают технологии развивающего обучения, в подростковом возрасте - технологии, имеющие ценностно-ориентированный характер (например, проблемное обучение, стимулирующее способность к выбору и ориентации, другие технологии, развертывающиеся на ситуативной основе); в старшем школьном возрасте - технологии рефлексивно-творческого обучения (например, по терминологии В.Т. Фоменко, построение учебного процесса на диалогической основе, на личностно-смысловой основе и др.). Таким образом, школа должна самоопределиться как в культурологическом содержании, так и в адекватных ему технологиях образования.

*Рецензист: д.п.н. И.Новрузлу*

**Литература**

1. Мамедов Ф. Культурология, Б.: 2006, 45-47 стр.

2. Новиков А. Образование в новой эпохе, М.: Эгвес, 2000, 288 стр.

3. Шукюров А. Культурология, Б.: 2003, 23-28 стр.

4. Материалы для учителей общеобразовательных школ Азербайджанской Республики в области применения предметных курикулумов в 2008/2009-м учебном году. Баку, 2007.

5. Предметные курикулумы для I-IV классов общеобразовательных школ. Баку: Образование, 2008.

**A.Qasımova**

**Məktəb kurikulumu mədəniyyət kontekstində**

**Xülasə**

Məqalədə müasir təhsilin mahiyyət və məzmunu açıqlanmaqla yanaşı, təhsil vasitəsilə sistemli bilik, bacarıq və vərdişlərin nəticələri və prosesləri əldə edilir. Məqalədə daha sonra qeyd olunur ki, təlim prosesi vasitəsilə insanın bütün həyatı boyu əldə etdiyi bilikləri nəsildən nəslə ötürülür. Təhsil insanda həyatda təminedici və təcrübi funksiya daşıyıcısı olmaqla yanaşı mədəniyyət üfüqündə yaradıcı özünüreallaşdırma və özünümüəyyənləşdirmə imkanı yaradır.

**A.Gassimova**

**School curriculum on the context of culture**

**Summary**

In the article it is spoken about the essence and importance of real education. The ways of learning abilities and its result is investigated.

# İNFORMASİYA CƏMİYYƏTİNDƏ ŞAGİRDLƏRDƏ İNFORMASİYA MƏDƏNİYYƏTİNİN FORMALAŞDIRILMASI

**Almaz Həsrət**
***Təhsil Sektorunun İnkişafı üzrə***
***II Layihənin Əlaqələndirmə Qrupunun məsləhətçisi***
***e.poçt: bilgi@almazhasret.com; almazhasret@gmail.com***
***Sayt: www.almazhasret.com***

***Açar sözlər:*** *məktəb, şagird, təhsil, İKT, informasiya cəmiyyəti, elektron resurs, informasiya mədəniyyəti, kompyuter.*

***Ключевые слова:*** *школа, ученик, образование, ИКТ, информационное общество, электронный ресурс, информационная культура, компьютер.*

***Key words:*** *school, student, education, ICT, information society, e-resource, information culture, computer.*

Müasir dövrdə yaşayan, dünyaya yenicə göz açan, məktəbəqədər təhsildən başlayıb, tam orta təhsil və ali təhsilə qədər yol keçən hər bir insan tamamilə yeni bir dövrün sakinidir. Bu gün anadan olan körpə artıq bol informasiya cəmiyyətinə, müxtəlif biliklərlə zəngin olan bir dünyaya göz açmış olur. Müasir insanın gələcəyini bu informasiya bolluğunda tənzimləmək, onların bu informasiya bolluğu şəraitində yerini düzgün müəyyənləşdirmək üçün ölkədə lazımi tədqiqat işləri aparılır. Bunun üçün ilk növbədə gələcək cəmiyyətimizi hazırlayan təhsilverənlərin özlərinin bu informasiya məkanından düzgün və lazımi səviyyədə istifadə qaydalarını, bunun üçün müvafiq üsul və metodlarını arayıb tapmaqlarına fikir verilməlidir. Sonra isə təhsilalanlara ən lazımlı, ən vacib olan, ən mühüm informasiyaları haradan, necə və nə cür almaları barədə məlumatları əldə etmələrinə imkan yaradılmalıdır.

Bir anlıq keçmişə qayıtsaq görərik ki, hələ ilk dövrlərdən qayaüstü rəsmlər, dəri üzərində yazılar, sonradan kağızın istehsalı ilə əlaqədar kağız üzərindəki yazılar, kitablar və s. bizim ilk bilik, informasiya mənbəyimiz olmuşdur. Sonra həyatımıza yavaş-yavaş adi telefonların, mobil əl telefonların, kompyuterlərin daxil olması, peyklərin icadı və çoxlu sayda televiziya kanallarının olması, internetin evlərə, ailələrə daxil olması cəmiyyətdə informasiya bolluğunun həcminin artmasına gətirib çıxartmışdır. Bu artım hələ də davam edir, özü də kosmik sürətlə. Amma bütün bunlardan öncə unudulmamalıdır ki, təbiətin canlı varlığı olan insan ilk informasiyanı, ilk biliyini ana bətnindən (son tibb sahəsində olan məlumatlara əsasən körpələr hələ ana bətnində olarkən ətraf aləmi duyur, məsələn: musiqi səsini, ailədə olan səs tonlarını) və sonra da anadan olarkən ətrafında cərəyan edən hər gördüyündən, eşitdiyindən, oxuduğundan alır. Bu ilk bilik, təbii ki, sosial bilikdir, körpə böyüdükcə ətraf aləmdəki cəmiyyətə inteqrasiya edərək sosial tərbiyə almış olur. Hər zaman dünyaya göz açan körpələr ilkin olaraq bilik və tər-

biyələrini anadan doğulan kimi, ailə və ətraf mühitdən alır. Sonra biliyinin artmasının davamı olaraq məktəbəqədər, məktəb və ali təhsil ocaqlarına üz tutur (burada qazanılan biliyə artıq elmi bilik demək olar). Bütün körpələrin öncə qazandığı bilik və bacarıqlar ailədən və ətraf mühitdən qəbul olunur. Sonra kitab, qəzet və televiziya da insanların həyatına daxil olur. Bu da insanların yeni informasiya qəbul etmə mənbəyinə çevrilir. Beləliklə, ana bətnindən ta yaşa dolduqca insan ətrafdan daim informasiya alır.

Maraqlıdır, görəsən bu informasiyaların hamısı lazımlı, gərəkli informasiyalardırmı? Bu informasiyaları hamı eyni cür qəbul edirmi? Eyni analiz edib, aldığı informasiyaları eyni tərzdə də ötürmək olarmı?

Təbii ki, 20 il bundan öncə kitabxanalardan hərə öz zövqünə, öz düşüncə tərzinə, öz xarakterinə, maraq dairəsinə görə kitab, jurnal və ya qəzet alırdı. Kimi jurnal, qəzet, dərslik alır, kimi bədii kitab və ya fantastik kitab alır. Hamının eyni cinsə, eyni irqə mənsub olmasına baxmayaraq müxtəliflik qalır. Bu müxtəliflik onları bir-birindən xarakterinə, davranışına, düşüncəsinə, vərdişlərinə, zövqlərinə, maraq dairələrinə və s. görə seçir. Məhz bu kriteriyalarla da cəmiyyətimizdə informasiya mədəniyyətinin müxtəlifliyi yaranır... İnsanlar məhz bu ölçüləri ilə fərqlənir. Məhz buna əsaslanaraq, demək olar ki, insanlar müxtəlif olduqlarından son zamanlar daha geniş vüsət almış informasiya bolluğundan da bu qaydada, yəni müxtəlif mənbələrdən qaynaqlanır, özlərinə uyğun, öz maraqlarına və zövqlərinə, xarakterlərinə uyğun məlumatları qəbul edib, analiz edir və sonra digərlərinə bildikləri çərçivəsində ötürürlər. Qısaca demək olar ki, hər bir insan bütövlükdə öz mədəniyyətinə görə seçim edir, öz mədəniyyətinə görə məlumat toplayıb, əldə etdiklərini də öz mədəniyyətləri çərçivəsində digərlərinə ötürürlər.

Müxtəlif elmi və elmi olmayan, lazımi və lazımsız biliklərlə zəngin olan, sərhədi bilinməyən bol informasiya dünyasında yaşayan insanları düzgün yönə istiqamətləndirməkdən ötrü bir neçə yollara ayırmaq olardı:

1. Bir cəmiyyətin əsas qüvvəsi və yeni əsas siması onun paylaşdığı informasiyadır ki, bu informasiyaların da hər an düzgün məlumatlarla zənginləşdirilməsi (bu ola bilər Kütləvi İnformasiya vasitələri, televiziya, internetdə olan materialları, yaxud sosial şəbəkələrdə paylaşımlar və s.).

2. Texnologiyaların yüksək sürətlə inkişafını daim izləməli-mövcud informasiya əsrində mütəmadi olaraq bu barədə məlumatlı olmaları.

3. Təhsilverənlərin baş verən texnoloji inkişafla ayaqlaşması, çox yüksək səviyyədə olmasa da (yaşlı nəsli nəzərə alaraq) orta səviyyədə İKT bacarıqlarına yiyələnmiş olmaları.

4. Yüksək səviyyədə təhsilin keyfiyyətinin təmin olunması üçün lazımi avadanlıqların olması.

Təhsilin keyfiyyətinin yüksək səviyyədə təmin olunması üçün, ilk növbədə məktəbin səriştəli idarəolunması, pedaqoji kollektivin vahid məqsəd ətrafında səfərbər edilməsi, müəllimlərin elmi-nəzəri və peşəkarlıq səviyyəsi, onlar üçün yaradıcı və səmərəli fəaliyyət şəraitinin yaradılması, kollektivdə sağlam psixoloji mühitin və demokratik ab-havanın olması, ailələrlə işgüzar əməkdaşlıq, müəllimlərin fəaliyyətinə və şagirdlərin nailiyyətlərinə pedaqoji nəzarətin təmin edilməsi və s. amillərin olması önəmlidir [1].

Araşdırmalar zamanı aydın olur ki, müasir informasiya və kommunikasiya texnologiyalarının inkişafı informasiya və bilik cəmiyyətində yaşayan məktəblilərin özlərində başqalarının görə bilməyəcəyi şəxsi tərəflərini açmaq qabiliyyətini formalaşdırır. Həmçinin hər təhsil alan şagird bir şəxs kimi

öz potensialını sərbəst reallaşdırır və həyat keyfiyyətinin yaxşılaşdırılması üçün imkanlarını təqdim edə bilir. Ancaq bütün bunlara baxmayaraq, son dövrdəki informasiya dünyasının iti şüalarının evlərə, orta təhsil müəssisələrinə, siniflərə, auditoriyalara doğru xəbərsiz, dəvətsiz gəlişinin müsbət tərəfləri ilə bərabər eyni zamanda, mənfi tərəfləri də vardır. Həmin şüaların evdə olan körpələrə, orta məktəbdə (ali məktəbdə də) təhsil alanlara, sinifdə əyləşən şagirdlərə birbaşa çox riskli və təhlükəli tərəfləri də görünür. Ona görə də təhsilverənlərin üzərinə çox böyük məsuliyyət düşür. Bu risk və təhlükələrin qarşısının alınmasına çox böyük diqqət və zəhmət ayırmalıdırlar. Müəllimlər müxtəlif metod, üsul və vasitələrlə şagirdləri telefonlardan, internetdən, mətbuatdan (KİV) və müxtəlif informasiya mənbələrindən mənfi sonluqla bitə biləcək risk və təhlükələrdən qorumalıdırlar. İnformasiya bolluğunda bəzən elə hallara rast gəlirik ki, şagirdlərə lazım olan məlumatları tapmaq çətin olur. Çünki internet, lüzumsuz məlumatlarla o qədər dolur ki, lazımlı məlumatlar informasiya bolluğunda itib batır. Yenə əvvəlki vaxtlara dönsək, görərik ki, kitabların və video kasetlərin də içində daim lazımsız və gərəksiz məlumatlarla rastlaşmaq olurdu. Amma nədənsə insanlar bu halda lazımi materialı tapmaqda çətinlik çəkmirdilər. Səbəbi də yalnız ondadır ki, informasiya az idi, informasiyalar yalnız qəzet, televiziya və kitabda idi. İndi isə XXI əsrdə yaşayırıq. Dünya sürətlə inkişaf edir. Son dövrlərdə də İKT-nin təhsilə gəlməsi, ailəmizə daxil olması informasiya sayının on və yüz dəfələrlə artmasına gətirib çıxardı. İndi hamı öz evində, işində kompyuter arxasında oturub bildiyi, eşitdiyi, gördüyü, oxuduğu və s. məlumatları internetə yerləşdirir. Bu materiallar isə yoxlanmır, sistemdə açıq qalır. Beləliklə də, internet bol lazımi və lazımsız, düzgün və düzgün olmayan məlumatlarla dolur. Bu da yazı tempinin artmasına köməklik göstərən kompyuterlərin sayəsində informasiya bolluğunu yaradır. Məktəbli bu zaman necə etməlidir ki, qarşısında oturduğu kompyuterdən lazımi məlumatı alsın? Necə etməlidir ki, yazacağı material hamı tərəfindən qəbul olunub, istifadə oluna biləcək bir iş olsun? Şagirdə necə anlatmaq lazımdır ki, düşünsün ki, bu gün onun yazacağı hər hansı bir söz, cümlə, fikir illərlə qalacaq, itməyəcək? Məhz bu zaman məktəbin rolu əvəzsizdir. Məhz bu zaman məktəb bu işdə həm ailəyə, həm şagirdə, həm də cəmiyyətə yardımçı olmalıdır.

Təbii ki, məktəb özünün cəmiyyət qarşısında olan bu məsul və şərəfli vəzifəsini daha ləyaqətlə yerinə yetirmək üçün bütün potensial imkanlardan istifadə etməli, ən başlıcası cəmiyyət qarşısında fəaliyyəti barədə hesabat verməli, qiymətini almalıdır. Bu fəaliyyətin ardıcıl olaraq davam etdirilməsi çox vacibdir. Qlobal dünyanın informasiya bolluğu şəraitində məktəbin, təhsilin vəzifələri dəyişir. Ağılın, intellektin inkişaf etdirilməsi ön plana keçir. Dünyanın təhsil məkanında sadəcə bilik və bacarıqlar deyil, dəyərlər, səriştələr şəxsiyyətin inkişafında mühüm atribut kimi qiymətləndirilir və bugünkü təhsilin keyfiyyət göstəriciləri kimi qəbul edilir [2]. Məktəbdə çalışan müəllimlər bu zaman tədrisində elə bir dönüş yaratmalıdırlar ki, keçdikləri dərs, tədris etdikləri fənn şagirdlər tərəfindən sevilsin, öyrənilsin. Həm də yeni nəsilə böyük kontingenti əhatə edən, sərhədi olmayan informasiya bolluğunda əhəmiyyətli mövzular ötürülsün. Bunu necə etməli? Dünyanı son illər düşündürən problemlərdən biri də məhz budur. Bu kütləvi informasiya axınından məktəb, məktəbdə təhsilalanları necə qorumalı? Bu heç də o demək deyil ki, şagirdləri elə hər zaman müəllim və valideynlər qorumalıdır, elə etmək lazımdır ki, şagirdlər özləri, fərd olaraq şüurlu sürətdə anlasınlar ki, bu təhlükələr-

dən özlərini necə qorumalıdırlar. Qlobal problemlərdən biri olan informasiyanın dayanmadan artması və bu zaman peşəkarcasına həmin məlumatların daha zəngin və sanballı materiallarla zənginləşdirilməsi işində nəinki valideyn, müəllim və şagirdlər, həm də cəmiyyətin bütün üzvləri yaxından iştirak etməlidirlər.

Belə bir məsələ ortaya çıxır, necə etmək olar ki, şəhər və kənd məktəblərində təhsil alan şagirdlər heç bir problemlərlə rastlaşmasınlar və özləri sərbəst olaraq mədəni formada lazımi məlumatları müstəqil əldə etsinlər. Bunun üçün, təbii ki, ilk öncə müəllimlərlə yanaşı, valideynlər də maarifləndirilməlidirlər. Bununla da şagirdlərdə İKT-dən istifadə etməklə informasiya mədəniyyətinin formalaşdırılması üçün yolların araşdırılması zərurəti yaranır.

Məlumdur ki, tədris prosesinin mərkəzi zəncirinin həlqəsini müəllim-şagird qarşılıqlı münasibətlərinin düzgün qurulması təşkil edir. Müəllim-məzmunun daşıyıcısı, təlim-tərbiyə prosesinin təşkilatçısı, “cəmiyyətin” təmsilçisi olub tədris prosesinin keyfiyyətli qurulmasına birbaşa cavabdehlik daşıyan şəxsdir. Müasir dövrdə müəllim öyrənənlərlə öz təcrübəsini deyil, tarixilik baxımından mədəni inkişafda toplanmış məlumatları çatdırmalı, öyrənənlərin hərtərəfli inkişafını təmin etməlidir. Məzmunun başqa daşıyıcılarına nisbətən müəllim, uşaqların fərdi xüsusiyyətlərini, inkişaf səviyyəsini nəzərə alaraq tədris materialının öyrədilmə formalarını dəyişməklə yeni biliklərin qazanılması üçün böyük imkanlara malikdir. O, tədris prosesində istənilən mürəkkəb tədris materialını yeni yanaşmalardan, interaktiv metodlardan, pedaqoji və təlim texnologiyalarından istifadə edərək fərdiləşdirə bilər. Müəllimin bu fəaliyyəti dəyişən, çoxlu parametrlərdən asılı olan onun peşəkarlıq səviyyəsi ilə müəyyən edilir. Tədris prosesində müəllimin sərbəst, heç nədən asılı olmayaraq əvvəlcədən planlaşdırılmış məqsədlərə çatmaq üçün apardığı unikal işlər, onun təbii bacarıqları və özünəməxsus başqa imkanları ilə həyata keçirilə bilər. Məlumdur ki, informasiya o vaxt tədris materialına çevrilir ki, o, şəxsiyyətin daxili sistem xarakteristikasının inkişafına təsir edə bilsin. Şagirdlərin inkişafı prosesində müəllimin texnoloji rolu tədris materialı əsasında şagirdlərin şüurunda, düşüncələrində, idrakında yeni törəmə zonaların formalaşmasına, yeni anlayışların, ümumiləşmələrin əsasının qoyulmasına xidmət etməlidir [3].

Araşdırmalardan məlum olur ki, ümumiyyətlə son dövrdə təhsilalanların informasiya-kommunikasiya texnologiyalarından istifadə edərək şagirdlərdə informasiya mədəniyyətinin formalaşdırılması üçün ilk öncə məktəblərdə informasiya mədəniyyəti barəsində tədqiqata geniş yer verilməsinə xüsusi diqqət yetirilməlidir. Bu zaman müəllimlər öncə özləri bu ifadənin tam məğzini anlamalıdırlar. Məktəb və məktəbdə çalışan bütün heyət yeni təlim proqramlarının həyata keçirilməsi üçün lazımi uyğun metod və üsullarını, yeni terminlərin mənasını bilməlidirlər. Son illər təhsil prosesində tez-tez eşitdiyimiz “informasiya mədəniyyəti”nin mənasını valideynlərə də açıqlamaqla İKT-dən istifadənin yaxşı tərəflərini də göstərmiş olarlar. Məlumdur ki, “informasiya mədəniyyəti” iki sözün birləşməsindən əmələ gəlib. Buna görə də bu söz birləşməsinin əsasən iki tərəfdən izahı verilir: “informasiya”-“Kulturoloji yanaşma” çərçivəsində informasiya mədəniyyəti informasiya cəmiyyətində insanın həyat fəaliyyəti tərzi kimi, insanın ümumi mədəniyyətinin formalaşması prosesinin bir tərkib hissəsi kimi nəzərdən keçirilir. “İnformasiya yanaşması” çərçivəsində informasiya mədəniyyəti kimi informasiyanın axtarılması, seçilməsi, saxlanması, ötürülməsi və təhlilinə, professional fəaliyyət sahələrinə dair informasiya

tələbatlarının ödənilməsinə yönəlmiş bilik, bacarıq və vərdişlərin məcmusu nəzərdə tutulur. Bəzi tədqiqatlarda informasiya sistemlərilə bağlı metodlar öyrənilibdir. Burada "informasiya" birbaşa tədris-təlim prosesinə aid edilmir, təlimin informasiya vasitələrinə, yəni kompyuterlərə, telekommunikasiya şəbəkələrinə, İKT-yə aid edilir. İnformasiya ilə bağlı metodiki sistemlər aşağıdakı geniş metodlar qrupunu əhatə edir:

- Multimediaya əsaslanan və mətnlərin, qrafiklərin, video və səs, musiqidə istifadə olunan interaktiv öyrətmə sistemləri;
- Mətnlərin spesifikliyini nəzərə alaraq müəyyən şəklə salınmasını, qrafikin təsvir edilməsini təmin edən hipermətn xarakterli sistemləri;
- İnformasiya telekommunikasiya şəbəkələrinin öyrədilməsi məqsədilə istifadə olunan sistemləri (internetdən istifadə). Məlumdur ki, internet informasiya mənbələrinin seçilməsində; server şəbəkəsində baza və operativ informasiyaların ötürülməsində, müxtəlif baza məlumatlarının kitabxanalara, muzeylərə, elm və tədris mərkəzlərinə ötürülməsində əvəzolunmaz rol oynayır.

Müasir yaşam tərzimizə İKT-nin sürətlə həyatımıza daxil olması cəmiyyətimizdə müxtəlif məzmunlu informasiyanın həcminin artmasına səbəb olmuşdur. Məhz bu axını nəzərə alaraq tədqiqatçılar informasiya mədəniyyətinə dair apardıqları tədqiqat işlərində araşdırmalarını daha çox informasiya yanaşmalarına görə aparırlar. Bildiyimiz kimi, son tədqiqat işlərində mədəniyyətin bir çox forması ayırd edilmişdir. Onu bir sıra tərkib hissələrinə ayırırlar. Hər fənnin özünəməxsus informasiya mədəniyyəti var. Məsələn, dil-ədəbiyyat dərslərində ən önəmli olanı nitq mədəniyyətidir. Həmçinin ekoloji mədəniyyət, davranış mədəniyyəti, geyim mədəniyyəti, hərəkət mədəniyyəti, incəsənət sahəsində olan mədəniyyət və s. də vardır. Sadalanan mədəniyyət formalarından biri də məktəbdə təhsil alan şagirdlərin mədəniyyətidir. Şagird mədəniyyəti təhsil alan şəxsin informasiya dünyagörüşününün səviyyəsi ilə ölçülə bilən bir mədəniyyət formasıdır. Şagirdlərin informasiya dünyagörüşünü iki yerə ayırmaq olar: birincisi, ənənəvi təhsildən son iyirmi ilə qədər olan dövrdə məktəbdə daha çox yalnız dərsliklərdən, jurnallardan, televiziya və qəzetlərdən əldə etdikləri informasiya ilə ölçülən mədəniyyətdir. İkincisi isə müasir dövrümüzə gələn telefon və kompyuterin sayəsində, internet məkanına daxil olmaqla oradan əldə olunan biliklərin məcmusu ilə ölçülən mədəniyyətdir. Yəni ənənəvi təhsil, kitab mədəniyyəti və yeni təhsil kompyuter mədəniyyətini birlikdə şagirdlərin informasiya dünyagörüşü adlandırmaq olardı. Hamısı birlikdə isə şagirdlərin informasiya mədəniyyəti deməkdir. İnformasiya mədəniyyətində məlum olduğu kimi, ən çox informasiya gələn yer olan kompyuter, internet məkan olduğundan oradan da məhz şagirdlərin təhlükəsizliyinin qorunmasında diqqətli olmaq lazım gəlir.

Müəllimlər bu zaman nəyi bilməlidir:

1. İnformasiya-kommunikasiya vasitələrindən effektli istifadə etməyi;
2. Müxtəlif informasiya resurslarından bacarıqla istifadə etməyi;
3. İnformasiya texnologiyaları vasitələrinin və əhəmiyyətli informasiyalarla internet məkanını zənginləşdirməyi;
4. İnformasiya məkanında lazımi informasiyaların əldə olunması və onun şagirdlərinə düzgün ötürülməsini;
5. Əldə etdiyi informasiyaların daha əhəmiyyətlilərini saxlamaqdan ötrü bloq və ya saytların yaradılmasını;
6. Elektron resursların sayının artırılmasını və s...

Bütün bu bilik və bacarıqlara malik olan müəllim heyəti təhsil sistemində gələcəyə hazırladıqları şagirdlərində bir çox müsbət xüsusiyyətlərin inkişafına təkan ola

bilərlər. Bu zaman şagirdlər də müəllimləri ilə birgə informasiya-kommunikasiya vasitələrindən istifadə etməklə (onsuz da müasir məktəblilər İKT-dən çox gözəl istifadə edə bilirlər) internet resurslarını yaradan üzvlərə çevrilirlər. Müşahidə və faktlar göstərir ki, müasir dövrün şagirdləri həyati hadisələrə obyektiv münasibət göstərmək, məlumatlılıq, faktiki vəziyyətə çevik uyğunlaşmaq, müstəqilliyə meyil etmək baxımından əvvəlki vaxtların uşaqlarından müsbət mənada xeyli fərqlənirlər. Onların əksəriyyəti İKT vasitələrindən bacarıqla istifadə edirlər ki, bu faktı təfəkkürün normal inkişafının göstəricisi kimi qəbul etmək olar.

Müasir şagirdlər sinif bloqu və ya saytı yaratmaqla dərslərin daha da maraqla keçirilməsinə müəllimləri ilə birlikdə əməkdaşlıq edirlər. Bir şəxsiyyət kimi özlərində liderlik, inamlı olmaq keyfiyyətini formalaşdırırlar. Bu tələblər həyata keçirilərsə hər məktəbin özünün və nəhayət, onları birləşdirərək rayon və ya şəhər üzrə vahid elektron resurs fondunun yaradılmasını əldə etmiş olarıq. Təlim prosesində bu işləri şagirdlər İKT-dən istifadə etməklə yaradırlar. Nəticədə şagirdlərdə müsbətyönümlü yüksək informasiya mədəniyyətinin formalaşdırılması meyili də güclənir və bu sahədə əsas məqsəd öz həllinə yol açır.

*Rəyçi: dos. Ə.Abbasov*

### İstifadə edilmiş ədəbiyyat


1. Əliquliyev R., Mahmudova R. Şəxsiyyətin informasiya mədəniyyətinin formalaşdırılmasında təhsil sisteminin vəzifələri. Azərbaycan məktəbi, 2012, № 4, səh.32.
2. Mehrabov A. Müasir təhsilin metodoloji problemləri. Bakı: Mütərcim, 2012, səh.60.
3. Ümumi təhsil sistemində əsas hədəflər və vəzifələr. Azərbaycan məktəbi, 2012, № 4.


**А.Хасрет**

### Формирование информационной культуры учеников в информационном обществе

### Резюме

В статье рассказывается о формировании информационной культуры учеников в информационном обществе. И еще отмечается роль учителей и родителей для приобретения правильной информации школьниками. Показываются теоретические навыки при освоении информационной культуры в первую очередь семьей, потом учителями и наконец учениками для повышения качества образования.

**A.Hasrat**

### Formulation of students’ information culture

### Summary

In this article it is spoken about formulation of students’ information culture in the information society. It is noted that teachers and parents play great role in students ‘getting relevant information. The author is sure that developing information culture serves to enhance the quality of education.

# MÜƏLLİMİN HAZIRLIĞI ÖNƏMLİ MƏSƏLƏLƏRDƏNDİR

**İlqar Abdullayev**
***Binəqədi rayonu 301 nömrəli tam orta məktəbin müəllimi, "İlin ən yaxşı müəllimi" müsabiqəsinin qalibi***

***Açar sözlər:*** *elm, bilik, savad, müəllim hazırlığı.*
***Ключевые слова:*** *наука, знание, грамота, учительская подготовка.*
***Key words:*** *science, knowledge, literacy, teacher preparation.*

Azərbaycan mütəfəkkiri N.Gəncəvinin yazdığı kimi elm həmişə güc, qüvvət mənbəyi hesab edilmişdir. "Təhsil" əsri adlandırılan XXI əsrin əvvəlində isə elmin rolu özünü xüsusilə qabarıq şəkildə göstərir. Bu baxımdan müəllim hazırlığı çox mühüm əhəmiyyət kəsb edir. Çünki elmin, biliyin şagirdlərə məktəb, müəllim vasitəsilə ötürülməsi heç kəsə sirr deyil. Müdriklərdən birinin də dediyi kimi, məktəb bir cisimdirsə, müəllim onun ruhudur. Bu deyilənlər müəllimin elmin, təhsilin inkişafında, biliklərin şagirdlərə çatdırılmasında necə önəmli rol oynadığını bir daha göstərir.

Məktəbdə çalışan müəllim özü müntəzəm olaraq ixtisasının və peşəkarlıq səviyyəsinin artırılmasına səy etməklə, yeni pedaqoji təfəkkürün formalaşdırılması, qabaqcıl təcrübənin öyrənilməsi istiqamətində görülən işlərdən xəbərdar olmalıdır.

Bütün dünyada müəllim hazırlığının xüsusilə önəmli rol oynadığı heç kəsə sirr deyil. Belə ki, hazırda tam cəsarətlə demək olar ki, kompyuter, eləcə də müxtəlif intellektual biliklər tələb edən ayrı-ayrı cihazlar daha geniş miqyasda evlərimizə, məişətimizə daxil olmaqdadır. Təbiidir ki, onlardan istifadə etmək bizlərdən geniş və hərtərəfli bilik tələb edir. Bəli, artıq dünyada biliyə əsaslanan yeni tip cəmiyyət formalaşır, bu cəmiyyətdə informasiya, bilik, bacarıq, səriştəlilik daha çox qiymətləndirilir [1]. Belə biliklərin öyrədilməsi isə yenə də müəllimin üzərinə düşər. Prezident İlham Əliyev aprelin 8-də Bakıda "Cənubi Qafqazın və Mərkəzi Asiyanın gələcəyi ilə bağlı strateji dialoq" mövzusunda keçirilən Dünya İqtisadi Forumunun "Davos Forumu"nun açılışındakı nitqində demişdir: "Hazırda biz neft gəlirini insan kapitalına çeviririk və əsas gələcək məqsədlərimizdən biri təhsildir. Təhsil istənilən ölkənin hər hansı uğurlu inkişafının ən vacib amilidir.

İndi informasiya-kommunikasiya texnologiyaları sahəsi Azərbaycanda prioritetlərdən birinə çevrilməkdədir. Azərbaycan artıq kosmos sənayesinə malik olan məhdud sayda ölkələr klubunun üzvünə çevrilmişdir. Bu ilin fevralında  ilk peykimiz – "Azərspace - 1" uğurla buraxıldı və bu kosmik sənayenin inkişafının yalnız başlanğıcıdır". Əlbəttə, həm belə biliklər, həm də məktəblərdə öyrədilən elmlərin əsasının şagirdlərə çatdırılması çox önəmli rol oynayır. Belə ki, şagirdlər yalnız ayrı-ayrı elmlərin əsasına kifayət qədər dərindən bələd olduqdan sonra kompyuter, noutbuk və netbuk kimi mürəkkəb cihazlardan istifadə edə bilərlər. Burda bir məqam da nəzərdən qaçırılmamalıdır ki, bu günün oğlan şagirdi sabahın əsgəridir. Orduda isə silahların getdikcə daha da müasirləşməsi və mürəkkəbləşməsi, bu zaman müxtəlif EHM-lər və kompyuterlərdən istifadə edilməsi vacibdir. Belə cihaz-

lardan, xüsusilə kompyuterlərdən orduda da məqsədəuyğun şəkildə istifadə edilməsi üçün şagirdlərin müxtəlif elmlərin dərinliklərinə bələd olması vacibdir. Bu baxımdan həmin şagirdlərə dərs deyən müəllimlərin özlərinin xüsusilə savadlı olmaları, öz ixtisaslarının dərinliklərinə kifayət qədər dərindən bələd olmaları ən mühüm şərtlərdəndir. Şagirdlər tədris prosesində hansı müəllimin daha bilikli olmasını çox tez hiss edir, bir qayda olaraq, belə müəllimlərə hörmətlə yanaşır, onun dərsini həvəslə öyrənirlər. Əlbəttə, burada müəllimlərin tədris prosesində müxtəlif pedaqoji və psixoloji üsullardan nə dərəcədə uğurla istifadə etmələri də heç də az rol oynamır.

Ümumtəhsil məktəblərində ibtidai sinif müəllimlərinin üzərinə xüsusilə böyük məsuliyyət düşür. Belə ki, hər hansı bir şəxsiyyətin yetişməsi və formalaşması prosesində müəllimlərin, xüsusilə ilk müəllimin təbiəti, düşüncə tərzi, dünyagörüşü, hadisələrə baxış prinsipi bu və ya digər dərəcədə iz qoyur. Odur ki, cəmiyyətin gələcəyini müəyyən edəcək bugünkü şagirdlərə dərs deyən müəllim yüksək savada, intellektə, mənəvi-əxlaqi keyfiyyətlərə malik olmalıdır.

*Rəyçi: TPİ-nin bölmə müdiri R.Hüseynov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Əhmədov İ. İnnovasiya təhsil siyasəti. Azərbaycan məktəbi, 2009, № 5.
2. Abbasov O. Müəllim hazırlığında milli dəyərlərdən istifadə imkanları. Azərbaycan məktəbi, 2009, № 5.
3. Nuriyeva M. Sosial şərait və şəxsiyyətin sosiallaşması. Azərbaycan məktəbi, 2011, № 6.
4. Джерелевская М. Установка коммуникативного поведения. М., Смысл, 2000, 191 стр.
5. Məmmədov T. İnformasiya cəmiyyəti və təhsil. Azərbaycan məktəbi, 2012, № 2.


**И.Абдуллаев**

**Подготовка учителей - один из важных задач**

**Резюме**

В этой статье говорится о роли учителей и о его социальных – экономических и политических изменениях в образовательной системе. Особенно выделяется роль учителей, осуществляющих эти задачи.

**I.Abdullayev**

**Teacher preparation is one of the main issues**

**Summary**

This summary deals with the role of teachers in the world which is globalising and changing socially, economically and politically. In this article we especially point the role of teachers in education system.

# DƏRSLİK MÜƏLLİMİ YARADICI İŞƏ SÖVQ EDİR

**Elnur Əliyev**
***Salyan rayonu, Yenikənd kənd tam orta məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimi***

Məlumdur ki, müasir ədəbiyyat dərsliyi söz sənətinin kamil nümunələri vasitəsilə gənc nəslə yüksək mənəvi dəyərlər, həyati bacarıqlar, estetik zövq, mütaliə mədəniyyəti aşılamalı, şagirdlərin tədqiqatçılıq fəaliyyəti, yaradıcı işi üçün zəmin yaratmalıdır. Kurikulumun qarşıya qoyduğu məqsəd və vəzifələrə uyğun olaraq dərslikdə şəxsiyyətyönümlülük, tələbyönümlülük, nəticəyönümlülük, tərbiyəvilik kimi didaktik tələblər əsas götürülməlidir.

Artıq ikinci tədris ilidir ki, respublikamızın ümumtəhsil məktəblərinin 5-ci siniflərində kurikulum üzrə yeni “Ədəbiyyat” dərsliyindən və  “Müəllim üçün metodik vəsait”dən (Müəlliflər Soltan Hüseynoğlu, Bilal Həsənli, Əsgər Quliyev, Əminə Səfərova. Bakınəşr, 2012) istifadə olunur. Dərslik üzrə iş təcrübəmdən çıxış edərək öz təəssüratlarımı bölüşmək istərdim.

Müəlliflər müəllim üçün vəsaitdə qeyd edirlər ki, dərslik hazırlanarkən respublikamızın qabaqcıl müəllimlərinin, o cümlədən son bir neçə ildə “İlin müəllimi” müsabiqəsinin iştirakçıları və qaliblərinin iş təcrübəsi diqqətlə öyrənilmiş, bir sıra məktəblərdə sınaq dərsləri keçirilmişdir. Eyni zamanda ibtidai təhsil pilləsində (I-IV siniflər) Azərbaycan dili fənni üzrə kurikulumun tətbiqi təcrübəsi də öyrənilmiş, nəticələr çıxarılmışdır. “Ədəbiyyat” dərsliyi düzgünlük, əyanilik, müasirlik, yaş səviyyəsinə uyğunluq, oxunaqlılıq, inklüzivlik kimi pedaqoji prinsiplər əsasında tərtib edilmişdir.

Fikrimcə, məsələyə belə yanaşma kurikulumun tələblərininin, məzmun standartlarının reallaşdırılması  üçün geniş imkanlar açan dərsliyin ərsəyə gəlməsinə səbəb olmuşdur. Belə ki, dərsliyə yüksək ideya-bədii dəyərə malik əsərlər-klassik və müasir Azərbaycan ədəbiyyatı nümunələri, eləcə də xarici ölkələr ədəbiyyatından seçmələr daxil edilmişdir. Müasir dövr üçün aktual ideya-mənəvi dəyərləri əks etdirən, şagirdlərin yaş və qavrama səviyyəsinə, maraq və tələbatlarına uyğun olan bədii mətnlərin seçimində problem-mövzu prinsipi əsas götürülmüşdür. Dərslikdə vətənpərvərliyi, yurd sevgisini, qəhrəmanlığı, ana fədakarlığını, humanizmi, mərdliyi, sadəliyi, təvazökarlığı, insan hüquq və azadlıqlarını, əməksevərliyi, təbiətə qayğıkeş münasibəti, xalqımıza xas olan digər əxlaqi sifətləri əks etdirən bədii nümunələr müvafiq bölmələr üzrə qruplaşdırılmışdır.

5-ci sinif üçün ədəbiyyat fənn kurikulumunda şagirdlərə ədəbi şəxsiyyətlər barədə məlumat verilməsi nəzərdə tutulmamışdır. Bunu nəzərə alaraq, müəlliflər orijinal yol seçmiş, həmkarlarının görkəmli sənətkarları yaradıcı şəxsiyyət kimi təqdim edən yığcam, yaddaqalan fikirlərindən istifadə etmişlər.

Müəlliflər fənn kurikulumun tələblərini nəzərə alaraq, məzmun standartlarında nəzərdə tutulmuş ədəbi-nəzəri biliklərin-nağıl, təmsil, hekayə, epitet, bənzətmə və s. öyrədilməsini diqqət mərkəzində saxlamışlar. Təcrübə göstərir ki, V sinifdə yığcam ədəbi-nəzəri məlumatların hazır hökmlər şəklində deyil, müasir metodik tələblərə uyğun olaraq, düşündürücü, məktəbliləri müs-

təqil fəaliyyətə sövq edən sual və tapşırıqlar vasitəsilə təqdim edilməsi “öyrənməyi öyrətmək” baxımından faydalıdır.

Təcrübə göstərir, dərslikdə bədii əsərlərin məzmununun mənimsənilməsi və təhlili üzrə sual və tapşırıqlar sistemi fəal/interaktiv dərslərin təşkilinə geniş imkanlar açır. Bu zaman belə bir cəhət əsas götürülmüşdür ki, inteqrasiya konkret bir mövzu, problem, anlayış haqqında şagirdlərdə daha geniş təsəvvürlər yaradılmasına, onların mahiyyətinin dərindən dərk edilməsinə və möhkəmləndirilməsinə, bilik və bacarıqların sistemli mənimsədilməsinə hərtərəfli imkanlar açır, şagirdlərdə müqayisələr aparmaqla ümumiləşdirmə bacarıqlarının formalaşmasına, tədqiqatçılıq meyillərinin güclənməsinə müsbət təsir göstərir.

Dərslikdəki müəllim-şagird, şagird-şagird əməkdaşlığına, öyrənmə prosesində şagirdin fəallıq və müstəqilliyinə yol açan sual və tapşırıqlar sistemi məktəblilərdə idraki fəallığın yaradılması və dərs ərzində sabit saxlanılmasına imkan verir. Hər bölmə, bədii mətn üzrə suallar və tapşırıqlar milli və ümumbəşəri mənəvi dəyərlərin müstəqil şəkildə qavranılmasına, şifahi və yazılı nitqin inkişaf etdirilməsinə, həyati bacarıqların aşılanmasına zəmin yaradır. Bütün mövzular üzrə sual və tapşırıqlar sistemi kurikulumdakı hər üç məzmun xətti – “Ədəbiyyat və həyat həqiqətləri”, “Şifahi nitq”, “Yazılı nitq” üzrə standartların reallaşdırılmasına istiqamətlənmişdir. Dərs dediyim siniflərdə şagirdlər həmin sual və tapşırıqlar üzərində həvəslə işləyir, kiçik və summativ qiymətləndirmə zamanı uğurlu nəticələr əldə edirlər.

Dərsliyin məzmunu, strukturu, metodik sistemi bilavasitə şagirdləri əldə etdiyi bilikləri tətbiq etməyə, yaradıcı fəaliyyətə sövq edən fəal/interaktiv təlimin təşkilinə istiqamətlənmişdir. Məlumdur ki, fəal/interaktiv təlimə məxsus metodların seçilməsi fənnin mahiyyətinin, özünəməxsusluğunun nəzərə alınması zəminində reallaşdırılır. Metodların tətbiqi o vaxt uğurlu olur ki, təlim materialının xüsusiyyətləri (həcmi, mürəkkəbliyi, çətinlik səviyyəsi), şagirdlərin onlarla tanışlığı və s. nəzərə alınmış olsun. Məhz bu cəhətlər, eləcə də ədəbiyyat kurikulumun tətbiqində V sinfin ilk mərhələ olduğu əsas götürülərək, bədii əsərlərin məzmununun mənimsənilməsi, təhlili, inşa və esse yazılar, ifadəli oxu dərsləri üzrə sual və tapşırıqlar sistemi fəal/interaktiv təlimin təşkili mexanizmləri nəzərə alınmaqla tərtib olunmuşdur.

Dərslik kurikulumun tələblərinə uyğun olaraq, təlim prosesində fəndaxili və fənlərarası inteqrasiyanın reallaşdırılması baxımından geniş imkanlar yaradır. Dərslikdəki təlim materiallarının problem-mövzu prinsipi ilə seçilməsi fəndaxili əlaqələrin həyata keçirilməsi üçün əlverişli zəmin yaradır. Fəndaxili inteqrasiya özünü bir neçə istiqamətdə büruzə verir: mövzular, problemlər, janrlararası əlaqə, məzmun standartlararası əlaqə. Nəticədə şagirdlər bu və ya digər bədii əsər üzrə bilik və bacarıqları digər əsərlərin tədrisi zamanı inkişaf etdirir, dərinləşdirir, eyni mövzuda bədii əsərləri inteqrativ öyrənirlər.

Fənlərarası inteqrasiya bədii mətnlərin, ədəbiyyatın, incəsənətin digər növləri (bədii oxu sənəti, musiqi, teatr, heykəltəraşlıq, rəssamlıq), eləcə də musiqi, rəssamlıq, tarix, coğrafiya, həyat bilgisi, xarici dil və s. ilə üzvi əlaqədə öyrənilməsini nəzərdə tutur. Fəndaxili və fənlərarası inteqrasiyanın yaradılması tələbi dərslikdə fəal təlimin fərdi, cütlük şəklində, kiçik və böyük qruplarda işi nəzərdə tutan sual və tapşırıqlar sistemi vasitəsilə reallaşdırılmışdır.

Dərslikdə şagirdlərin ifadəli oxu bacarıqlarına yiyələnməsi ön plana çəkilmişdir. Kurikulumun şagirdlərə bədii əsəri ideya-məzmununa uyğun ifadəli oxumaq tələbi nə-

zərə alınaraq dərslikdə müvafiq sual və tapşırıqlar sistemi işlənilmişdir. Təcrübə göstərir ki, dərsliklərimiz üçün yeni olan bu təşəbbüs müəllimlərimizin bu sahədə fəaliyyətini metodik baxımdan istiqamətləndirir.

Dərslikdə elektron resurslardan kompyuter texnologiyasından, internetdən istifadə imkanları da nəzərdən qaçırılmamışdır. Bütün mövzularla bağlı "Kitabxanadan və internetdən bəhrələnin" başlığı altında elektron resurslardan, əyani vasitələrdən (şəkillər, illüstrasiyalar və s.) istifadəni nəzərdə tutan sual və tapşırıqlar işlənilmiş, müəllimlərə metodik tövsiyələr verilmişdir.

Təcrübəm əsasında belə qənaətə gəlmişəm ki, şagirdlərin "İnternetdən bəhrələnin" başlıqlı tapşırıqlara hazırladıqları cavabların səviyyəsinin müstəqil araşdırma və mütaliə üzrə təqdimatların müzakirəsi dərslərində müəyyənləşdirilməsi daha məqsədəuyğundur. Müəlliflərin tövsiyə etdiyi kimi, dərslikdə şagirdlərin yaradıcı, müstəqil tədqiqatçılq fəaliyyəti üçün nəzərdə tutulmuş layihələrin müzakirəsinin də həmin dərslərdə reallaşdırılması faydalıdır.

Dərslikdə E.Hüseynbəylinin "Firuzə qaşlı xəncər" hekayəsinin tədrisi şagirdlərdə Xocalı soyqırımı haqqında aydın təsəvvür yaradır. Hekayəni çox maraqla oxuyan uşaqlar mənfur düşmənin əsl simasını yaxşı başa düşürlər, "yazıq ermənilərin" kim olduğunu bir daha dərk edirlər. Hekayənin sonundakı dialoq yadda qalır:

"-Ata, bilirsən ermənilər orada neylədilər?

- Bilirəm, qızım, bilirəm, Allah bəlalarını versin! Qisas qiyamətə qalmaz!."

Dərslikdə diqqəti cəlb edən mühüm məsələlərdən biri də ev tapşırıqlarına münasibətdir. Müəlliflərin mövqeyi belədir ki, fəal/interaktiv dərsdə də ev tapşırıqlarının verilməsinə ehtiyac vardır. Lakin müəllim ənənəvi dərslərdən fərqli olaraq fəal/interaktiv dərsdə ev tapşırıqlarının yoxlanılmasını məqsədə çevirməməli, tapşırıqların yerinə yetirilmə səviyyəsini seçmə yolla, qısa vaxt ərzində müsahibə, təqdimat, müzakirə və s. istifadə etməklə aşkara çıxarmalıdır. Ev tapşırığının hansı məzmunda və formada verilməsini təlim məqsədlərindən çıxış edən müəllim müəyyənləşdirir.

Müsbət haldır ki, dərslikdə inklüzivlik, diferensial təlim (təlim nəticələri zəif olan, yüksək, məhdud olanlar) imkanları gözlənilmişdir. Bu, ilk növbədə müxtəlif tipli sual və tapşırıqların – bərpaedici və yaradıcı, qapalı, açıq, yarımaçıq tapşırıqların seçimində məktəblilərə müstəqillik verilməsində, eləcə də qiymətləndirmə materiallarında öz əksini tapmışdır.

Ədəbiyyat müəllimlərinin kiçik summativ qiymətləndirmənin aparılması üzrə iş təcrübəsinin olmaması nəzərə alınaraq dərsliyə bütün bölmələr üzrə il ərzində aparılacaq kiçik summativ qiymətləndirmə materiallarının daxil edilməsi təqdirəlayiqdir. Kiçik summativ qiymətləndirmə üçün bir dərs saatında öyrənilməsi və qiymətləndirilməsi mümkün olan bədii nümunələr seçilmiş, məzmun standartlarının reallaşdırılması səviyyəsini üzə çıxarmağa imkan verən sual, tapşırıq, test nümunələri işlənilmişdir.

Dərsliyin sonunda bədii nümunələrdə şagirdlərə tanış olmayan sözlərin və ədəbiyyatşünaslıq terminlərinin lüğəti verilməsi də də təqdirəlayiqdir.

Dərslik bədii tərtibat baxımından da diqqəti cəlb edir. Dərsliyə ayrı-ayrı sənətkarların portreti, işarələr sistemi, bölmələr üzrə orijinal rəsm işlərindən ibarət illüstrasiyalar daxil edilmişdir. Rəsm və illüstrasiyaların ayrı-ayrı bölmələr üzrə mətnlərin səmərəli qavranılmasına imkan yaratması, şagirdlər üçün cəlbedici, maraqlı olmasına diqqət yetirilib. Rəsm və illüstrasiyalar bədii mətnlərə uyğunluğu, ifadəliliyi ilə diqqəti cəlb edir.

*Rəyçi: dos. Ə.Abbasov*

***Səhiyyə maarifi***

# BAŞ AĞRISININ FƏSADLARINDAN QORUNMALI

**Hidayət İsayev**
***tibb elmləri doktoru, professor***

**Aybəniz Cəfərova**
***həkim-pediatr***

Müəllimlik dünyanın ən şərəfli və ən çətin peşələri sırasına daxildir. Şagirdlərin və tələbələrin qarşısına çıxan müəllim həm fiziki cəhətdən sağlam, həm də xoş əhvali-ruhiyyədə olmalıdır. Belə olmasa, o öz məqsədinə nail ola bilməz. Müəllimin daxili aləmindəki nasazlıq dərs dediyi uşaqlara, müdavimlərə ötürülməməlidir. Müəllimin dərs prosesində ağrı hiss etməsi, onun bu vəziyyəti sinifdə, auditoriyada hiss etdirməsi dərsin effektini azaldır. Bu mənada müəllimlərin sağlamlığını qorumaq məqsədilə onların arasında tibbi biliklərin yayılmasına, maarifləndirmə işlərinə müasir təhsil sisteminin aktual problemlərindən biri kimi baxılmalıdır.

Sağlam nəslin formalaşdırılması ümumbəşəri vəzifədir. Dünyanın ən mötəbər beynəlxalq təşkilatlarında dünya əhalisinin sağlamlığı da birinci dərəcəli problemlər sırasında gündəmə gətirilir. Onun həlli üçün dövlətlər xeyli miqdarda vəsait xərcləyir. Aydındır ki, dövlətin həll etmək istəyinə problemə müvafiq təşkilatlar da, o cümlədən məktəblər də qoşulmalıdır. İlk növbədə böyüməkdə olan nəsil arasında sağlam həyat tərzinə dair təbliği işlər görülməlidir. Təkcə onu demək kifayətdir ki, dünyanın bir sıra ölkələrində gənclərin üçdən biri sağlamlığı ilə bağlı orduda qulluq edə bilmirlər. Valideynlərin sağlamlığı da bu qəbildəndir. Ona görə də, televiziya və radio verilişlərində, pedaqoji mətbuat səhifələrində bu məsələlər öz geniş əksini tapmalıdır.

Yaxşı haldır ki, indi ümumtəhsil məktəblərində bir sıra tibbi məlumatların verilməsi ilə yanaşı ali məktəblərdə də "Tibbi biliklərin əsasları" fənni tədris olunur və bu yolla tələbələri kifayət qədər məlumatlandırmaq mümkün olur. Ona görə də bu mövzuda pedaqoji mətbuatda məqalələrin getməsi çox faydalıdır. Bugünkü məqaləmizdə əsasən bir simptom haqqında, yəni müəllimləri də az narahat etməyən baş ağrısından bəhs ediləcəkdir.

Elə bir insan tapmaq olmaz ki, ömründə bir dəfə də olsa başının ağrımasından şikayət etməsin. İnsan yaranandan baş ağrısı da ona "yoldaş" olmuşdur. Buna hələ lap qədimdən çarə axtarıb tapmaq istənilsə də, əldə edilən nailiyyətlər o qədər tutarlı olmamışdır.

İnsan həyatını ağrısız təsəvvür etmək mümkün deyil. Belə ağrılar bu və ya digər şəkildə, həyatımızın ən "uyğun olmayan" dövründə də bizi müşayiət edə bilir. Həkimlər baş, diş ağrıları, beldə, əzələlərdə ağrı, eləcə də onun müxtəlif növlərindən əziyyət çəkən adamlarla tez-tez rastlaşırlar. Lakin bu ağrılara hərə bir cür reaksiya verir. Bəziləri onun ilk əlamətində "süstləşir", digərləri isə heyrətamiz dözümlülük və səbir nümayiş

etdirir, yəni ağrı hədləri ilə fərqli davranırlar.

Mövzunu şərh etmək üçün meydana belə bir sual çıxır: Ağrı nədir? Tibb aləminə məlumdur ki, bizim orqanizmimizdə nosiseptorlar – ağrı reseptorları (onların sayı, təxminən 2 mln-dur) buraxan xüsusi ağrı sistemi mövcuddur. Bütün orqan və toxumalar nosiseptorlarla təşkil olunubdur. Ağrının başlanması ərəfəsində qıcıqlanmaya reaksiya verərək, onlar onurğa və baş beyinin ağrı mərkəzlərinə həyəcan siqnalı ötürürlər. Daha sonra, əksinə, həmin sinir yolları ilə qıcıqlandırıcının aradan qaldırılması üçün mühafizə reaksiyası haqda əmr gəlir. Bu anda da insan ağrı hiss edir.

Baş ağrıları bəşəriyyətə çoxdan məlumdur. Baş ağrısının təsbitinə bizdən 2500 il əvvəl yaşamış dahi filosof və mütəfəkkir Hipokratın əsərlərində rast gəlinir. Sonralar yaşayıb-yaratmış yunan alimi Sokrat, onun tələbəsi Platon baş ağrısının səbəblərini izah etməyə çalışmış, bunun gərginlik və həyəcanlıqla əlaqədar olduğunu qeyd etmişlər. Qədim Roma şəhərində həkimliklə məşğul olan yunanıstanlı Soran Efesli xroniki baş ağrıları və miqren barəsində hətta indiki vaxtda təəccüb doğuracaq dərəcədə düzgün məlumatlar vermişdir. Onunla təxminən eyni vaxtda yaşamış romalı Qalen baş ağrılarının müalicəsində pəhrizdən, gimnastika, vannalar, qan alma və ovxalamadan istifadə etməyi məsləhət görmüşdür. Sonralar baş ağrılarının mənşəyini aydınlaşdırmaqda və müalicəsinin aparılmasında dahi türk alimləri Əbu Əli Hüseyn ibn Sina (980 – 1037) və Əbu Reyhan Biruni (973 – 1048) böyük əmək sərf etmiş və əldə etdikləri nəticələri öz monoqrafiyalarında əbədiləşdirmişlər. İbn Miranın "Qanun" monoqrafiyalarında baş ağrıları və miqrenə görə təklif etdiyi müalicə metodları bu gün də öz əhəmiyyətini itirməmişdir.

Baş ağrıları istər xəstə, istərsə də tamamilə sağlam adamlarda baş verə bilir. Tarixi mənbələrdən məlum olur ki, Qay Yüli Sezar, Makedoniyalı İskəndər, Teymurləng, Napoleon, Səlahəddin, Sultanhəmid, I Pyotr və başqaları kimi məşhur simalar baş ağrılarından əziyyət çəkmişlər.

Məşhur alman bəstəkarı Lüdviq Van Bethoven, öz elmi əsərləri ilə təbiət və dünyəvi elmlərdə çaxnaşmaya səbəb olan ingilis Çarlz Darvin, alman şairi Henrix Heyne, ingilis yazıçısı Cozef Ktplinq, fransız Gi de Mopassan, rus bəstəkarı Pyotr İliç Çaykovski və digərləri vaxtaşırı güclü baş ağrılarından əziyyət çəkərlərmiş. Bəzən belə hal da olur ki, bu vaxta qədər heç bir şikayəti olmayan şəxsdə birdən-birə baş ağrıları əmələ gəlir və onun ağlına belə gəlmir ki, bunun üçün həkimə müraciət etsin; çünki, adətən, belə ağrılar tezliklə keçir və insan heç nə olmamış kimi yenə əvvəlki həyat fəaliyyətini davam etdirir. Bəs göstərilən gündəlik həqiqət təbabətin prinsipləri ilə uyğunsuzluq təşkil etmirmi? Çünki klassik tibbi təfəkkür belə hesab edir ki, səbəbsiz ağrı ola bilməz. Yəni insanın başında patoloji dəyişikliklər olmasa, baş ağrısı da ola bilməz. Həm də ağrı özlüyündə bədənin müdafiəsini təşkil etməkdə əsas rol oynayan siqnaldan başqa bir şey deyildir. Bəs bu gün başı ağrıyıb sabah özünü tamamilə sağlam hiss edən adam barəsində nə demək olar? Həmin adam xəstədirsə, bu necə xəstəlikdir ki, 2-3 saat və ya 12-24 saat ərzində tamamilə sağalır! Yox, bu xəstəlik deyilsə, nə üçün ağrı siqnalları əmələ gəlir və insana "gen dünyanı dar edir?" Bütün bu suallara cavab vermək ümumilikdə mümkün olsa da, çox vaxt hər adam üçün ayrılıqda fikir yürütmək həmişə imkan daxilində olmur. Əlbəttə, kiçik bir məqalədə oxucuya baş ağrısı problemini tam izah edə bilməyəcəyimizi əsas tutaraq, ilk əvvəl ağrının başda əmələ gəlməsinin səbəbini populyar təbabət səviyyəsində izah etmək istərdik: bütün hallarda baş ağrısının ortaya çıxan mexanizmi beyin və başın

divarlarında yerləşən ağrı reseptorlarının qeyri-normal qıcıqlanmasıdır. Belə qıcıqlanma o zaman baş verir ki, damarların tonusu dəyişməyə məcbur olsun: damarlar ürək vurğusu ilə əvvəlkindən daha çox genəlir və sonra daralır ki, belə rezonans ağrı reseptorlarının kəskin qıcıqlanmasına gətirib çıxarır. Həmin reseptorlardan gedən impulslar beyin qabığına nəql edilərək, başın ağrımasına səbəb olur. Ortaya çıxmış baş ağrısı insanı elə hərəkət etməyə vadar edir ki, qan-damar sistemi öz əvvəlki vəziyyətinə qayıtsın. Bu zaman reseptorların qıcıqlanması azalaraq, yox olur və ağrılar kəsir.

Məlum olduğu kimi, ağrı orqanizmdə qüsurların olmasından xəbər verən siqnaldır. Xəstəliklər zamanı ağrıkəsicilərin qəbulu həkimə getməyi və ya ağrıya səbəb olan problemin diaqnostikasını ləngidir. Yüksək ağrı həddi ona gətirə bilər ki, yüngül kefsizliklə həkimə gedən pasiyent, sadəcə olaraq, əməliyyat masasında ola bilər! Ona görə də insanın ağrıya qarşı nə dərəcədə həssas olmasına baxmayaraq, o həddindən artıq ağrıya tab gətirə bilməz.

Qan-damar sisteminin beyin və baş nahiyəsində fəaliyyətinin pozulması səbəbləri yüzlərcədir desək yanılmarıq. Bu səbəblər qan-damar fəaliyyətini pozaraq, yenidən başağrısı törədirsə, digər adam üçün həmin dərəcədəki qıcıqlar çox zəif olduğundan, heç bir ağrıya səbəb olmur. Deməli, qıcıq əmələ gətirən səbəb ayrı-ayrı insanlarda müxtəlif gücə malikdir ki, o da hər kəsin qan-damar fəaliyyətini poza bilir. Yəni qan-damar sistemi “möhkəm” olan şəxslərdə baş ağrısı o qədər də asanlıqla əmələ gəlmir. Əksinə, nəsillikcə qan-damar sistemi zəif olan, müxtəlif səbəblərdən (əzab-əziyyət, ruhi və psixi travma keçirmiş, aclıq, yorğunluq halında olan, pis yaşayış tərzi və iş şəraiti olanlar) həmin sistemin zəifləməsinə tutulan insanlarda kiçik bir qıcıq baş ağrısının əmələ gəlməsinə səbəb olan qan-damar sisteminin pozulmasına gətirib çıxarır. Buraya atmosfer təzyiqinin dəyişməsi, ayın fazaları, oksigeni az olan yerdə, papiros çəkilmiş otaqda qalmaq, psixi travmalara uğramaq, gün altında, küləkli havada, səs-küylü yerdə çox olmaq, iş rejiminin və istirahətin pozulması, uzun müddət televizora baxmaq, qida rejiminə riayət etməmək, yuxusuzluq, çox yatmaq və s. daxildir.

Ağrının həddi haqda informasiya təkcə insanın özü üçün deyil, həkim üçün də əhəmiyyətlidir. Çoxları ağrı ilə bağlı olan bütün həyati peripetsiyalara asanlıqla tab gətirmək üçün yüksək ağrı həddinə sahib olmağı arzu edirlər. Lakin bu xoş xüsusiyyətin də əks tərəfi var. Məhz, ancaq həkim bunların qarşısını almağa qadirdir.

Qeyd etmək lazımdır ki, başağrısı terapevt və nevropatoloqların gündəlik praktikasında rast gəlinən ən çox yayılmış şikayətlərdən biridir. Lakin başağrısı həmişə nevrologiya xəstəlikləri ilə bağlı olmur. Düzgün toplanmış anamnez başağrısının əmələ gəlməsinin səbəbini ayırd etməkdə həlledici rol oynayır: başağrısının vaxtı və müddəti, xarakteri, kəskinliyi, lokalizasiyası, müşayiət edən simptomlar, irsilik, eyni zamanda onu təhrik edən amillər həkimin gözündən yayınmamalıdır. Göz xəstəliklərində isə başağrısı adətən göz yuvasında, alın və gicgah nayihəsində yerləşir və monoton səciyyə daşıyır. Günün sonunda meydana çıxan, bir neçə saat istirahət və yuxudan sonra keçib gedən, davamlı və gündəlik intensivlik baş ağrısı onun göz xəstəliklərinə bağlı olmasını da təxmin etməyə əsas verir.

Yaxın məsafədə iş zamanı televizora və ya kompyuterə baxdıqda da gicgah və ənsə nahiyəsində baş ağrısı yarana bilər. Göstərilən mənfi amillərin təsirinin qarşısının alınması bir çox hallarda bizim özümüzdən asılı olduğundan, onları aradan qaldırmaq asandır. Lakin çox zaman insanın özündən az asılı olan, bütün zərərli səbəblərdən

ən çox ziyanlısı və orqanizm üçün hərtərəfli təhlükə törədəni siqaret tüstüsüdür. Siqaret tüstüsü çəkən adama nə qədər pis təsir edirsə, onu çəkməyənə 100 dəfə artıq təsir göstərir, xüsusən də südəmər və körpə uşaqlara! Həmin tüstünün tərkibində nikotindən başqa quru tütünün yanmasından baş verən zəhərli maddələr və karbon oksidi də vardır. Qanın hemoqlobini ilə birləşərək, karbon oksidi oksigenin toxumalara çatdırılmasına mane olur və beləliklə, qanın tərkib hissələri öz fəaliyyətini tam yerinə yetirə bilmir. Qana sorulmuş zərərli maddələr həm də bədən hüceyrələrinin zədələnməsinə səbəb olur. Papiros tüstüsünün zəhərlənməsi ürəkbulanmada, baş ağrısında və ürəkkeçmələrdə özünü büruzə verə bilər. Təcrübələr göstərir ki, ata evində papiros tüstüsünə məruz qalmayan qız, papiros çəkənə ərə getdikdən sonra qısa bir müddətdə xəstələnir və həmin xəstəliyin diaqnozunu qoymaqda həkimlər aciz qalır və belə xəstələri aylarla, heç bir xeyri olmadan, müxtəlif "xəstəliklərə" görə "müalicə" edirlər. Belə qadına xəstəliyin səbəbinin siqaret tüstüsündə olduğunu başa saldıqdan sonra onlar özlərinin düşdüyü bu "bəlanın" mahiyyətini anlayırlar.

Siqaret çəkən şəxslər çalışmalıdırlar ki, kənardakıları zəhərləməsinlər. Siqaret çəkməyənin bədənində siqaretin tərkibindəki zəhərlərə qarşı müqavimət olmaması üzündən (siqaret çəkənin bədəni belə zəhərlərə tədricən öyrəşir) onlar tez zəhərlənirlər. Siqaret tüstüsünün təxminən 50 faizi çəkənin ciyərlərinə yox, ətrafa yayılır. Bundan əlavə, közərən siqaretdən havaya yayılan tüstünün tərkibində papiros çəkənin ciyərlərinə daxil olan tüstüdən fərqli olaraq karbon oksidi 3 dəfə, kadmium 2 dəfə, ammiak 50 dəfə, benzilliridin isə 3 dəfə çoxdur. İndi siqaret çəkməyərək həmin tüstünü udmağa məcbur olan adamın halını özünüz təsəvvür edin. Siqaret çəkən öz "narkotikindən" ləzzət alsın, sən yazıq isə heç bir günahın olmaya-olmaya ondan 50 dəfə çox zəhərli qaz ud!

Ümumiyyətlə, sağlam insanlarda ortaya çıxan baş ağrıları ilə müxtəlif xəstəliklər nəticəsində törəyən baş ağrılarını fərqləndirmək çox mühüm əhəmiyyət kəsb edir. Burada qısaca da olsa, baş ağrısı ilə bağlı miqren haqqında da məlumat verməyi lazım bilirik. Hər şeydən əvvəl "adi" başağrısı miqrendən fərqlənir, "miqren" diaqnozu isə o halda qoyulur ki, diaqnostikadan sonra baş zədəsi, beyin şişi, arterial təzyiqin dəyişməsi kimi simptomu başağrısı olan bütün başqa xəstəlikləri istisna edir. Miqrenin simptomları da yetərincə tanınandır - bu, kəskin artan başağrısıdır, çox vaxt başın yalnız bir tərəfində, hərdən bir nöqtədə - gicgah, göz, qulaq tərəfdə baş verir. Bəzən miqrendən əvvəl aura adlandırılan "xəbərdarlıq" siqnalları: görmə, duyğu, eşitmə, nitq, hərəkət koordinasiyası pozuntuları gəlir. Daha dəqiqi, miqrenin əsas səbəbi baş beynin damarlarının dəyişməsidir. Qan damarlarının divarları genişlənir və ətrafdakı sinir hüceyrələrinə təzyiq göstərir, bu da güclü ağrıya səbəb olur. Amma pozuntuya çox sayda digər amillər də səbəb ola bilər. İrsilik daha çox önəm daşıyır.

O da maraqlıdır ki, zərif cinsin nümayəndələri miqrenə kişilərə baxanda daha çox tutulurlar. Hormonal sistemin mərhələli işi buna səbəb olur və onun pozuntuları miqrenə gətirib çıxarır.

Miqreni tamamilə sağaltmaq mümkün deyil. Amma profilaktika aparmaq olar, bu, sağlam həyat tərzi, balanslı yükləmələr və qida ilə, alkoqolun və siqaretin istisnası ilə bağlıdır. Unutmaq olmaz ki, istənilən müalicə mütləq həkim nəzarəti altında olmalıdır, çünki bir pasientə yardım edən preparatlar, başqaları üçün faydasız ola bilər. Bir çox xəstəliklərdən baş ağrısı həmin dərdin əlamətlərindən biri kimi qiymətləndirilir və onun sayəsində həkimdə həmin xəstəliyin mövcudluğuna şübhə oyadaraq, bu istiqamətdə geniş müayinələr aparmağa vadar edir. Belə xəstəliklər olduqca çoxdur və

bədənin başdan çox-çox uzaq yerlərində yerləşə bilər. Bunlardan beyin şişlərini, beyin qan dövranın pozulmasını, qan təzyiqinin artması və azalması ilə bağlı xəstəliklər, daxili orqanların xəstəlikləri, infeksion və nevroloji xəstəliklər, boğaz-burun-qulaq xəstəlikləri, hormonal vəzilərin pozuntuları və sairəni göstərmək olar. Bu qısa məlumatda biz ilk növbədə praktiki sağlam olan insanlardakı ortaya çıxan baş ağrılarından və ondan azad olmaq yollarından bəhs etmək istəyirik.

Başı ağrıyan insan çalışıb özü üçün aydınlaşdırmalıdır ki, birdən-birə onun başı nə üçün ağrıdı? Əksər hallarda indiyə qədər sağlam olmuş şəxs baş ağrısının səbəbini tapa bilir: ən yaxşı halda bundan sonra həmin səbəbin ziyan törətmiş təsirini aradan qaldırmağa çalışır, səs-küydən uzaqlaşmaq, təmiz havaya çıxmaq, rahatlıq əldə etmək və b. çarələr axtarır. Əgər başağrısı çox şiddətlidirsə və bütün tədbirlərə baxmayaraq, azalmağa meyilli deyilsə, onda ağrıkəsicilərdən istifadə etmək məsləhətdir. Bu gün təbabət yüzlərlə ağrıkəsici preparat təklif edir. Onların bəziləri müxtəlif şəxslərə eyni təsir göstərmir; bu səbəbdən hamı üçün eyni dərmandan istifadə edilməsi məsləhət görülmür. Ona görə indi geniş tətbiq edilən ağrıkəsicilərdən (baralqin, parasitamol, panadol, tramal, spazmalqon və s. ) yarım həb qəbul etmək kifayət edir. Bundan sonra 10-15 dəqiqə ərzində başağrıları azalırsa və digər mənfi təsir (baş gicəllənmə, ürək bulanma, nəbzin tezləşməsi, dərinin qızarması, səpməsi və b.) baş vermirsə, yenə yarım həb qəbul etmək olar.

Söz yox ki, tez-tez təmiz havada gəzməyin, aktiv həyat tərzi sürməyin də xeyiri əvəzsizdir. Deməli, müayinələrin daha effektli olması üçün müalicəni aparan həkimin tövsiyələrinə diqqətlə qulaq asmaq lazımdır.

Ölkəmizdə səhiyyəmiz sürətlə inkişaf edir, tibb ocaqlarımız ən müasir tibbi cihazlar və avadanlıqlarla təchiz olunur. Ən yaxşı dərman preparatlarına malik apteklərimiz vardır, bir sözlə, hər cür şərait və imkanımız var ki, profilaktik işlərimiz gücləndirilsin. İnsanlar daha gümrah olsun, sağlam nəsil yetişdirilsin və hər cür çətinliyə qalib gəlməyi bacaran vətəndaşların sayı günügündən çoxalsın. Səhiyyənin və təhsilin bir arzusu var ki, insanlar sağlam böyüsün!

Yuxarıdakıları da nəzərə alaraq demək lazımdır ki, insanın sağlamlığı bütün dövrlərdə vacib dəyər olub, onun fiziki və ruhi rahatlığının, enerjisinin paylamaq bacarığını və müxtəlif həyat fəaliyyəti arasında diqqət, nəslin axtarılması və nəsillərin rahatlığının əsası olmuşdur. Ümumdünya səhiyyə təşkilatı sağlamlığı təkcə təkliyin olmaması kimi deyil, şəxsiyyətin tam maddi, mənəvi sosial uğuru kimi qiymətləndirir. Bir qədər də dəqiqləşdirsək, əslində sağlamlıq insanın bioloji, fizioloji və psixi-fiziki şuasının optimal əmək fəaliyyətinin və sosial fəallığının qısa yaşama şüurunda saxlanması və inkişaf etdirilməsi kimi təqdim edilir. Bütün ağrıların, o cümlədən baş ağrısının qarşısının alınması üçün insan sağlam həyat tərzi keçirməlidir. Yadda saxlamaq lazımdır ki, sağlam həyat tərzindən kənara çıxmaq sağlamlıq üçün çox təhlükəlidir. İnsan sağlam və xoşbəxt olmağı öyrənməlidir. İnsanların sağlamlığı həyatın məqsədinə çevrilməlidir. Təsadüfi deyildir ki, insanın sağlamlığı ilə məşğul olan xüsusi elm sahəsi də yaranmaqdadır. M.Qorki yazırdı: "Siz insanın elə arzularını yerinə yetirməyə kömək edin ki, bunlar onun sağlam və güclü olması üçün zəruridir". Çünki təbiətin ən mükəmməl, ən kamil, ən qiymətli əsəri sağlam adamdır.

İ.P.Pavlov isə daha irəli gedərək yazırdı: "İnsan təbiətin ən gözəl möcüzəsidir. Lakin təbiətin xəzinəsindən nəşələnmək və həzz almaq üçün insan sağlam, qüvvətli və ağıllı olmalıdır".

***Bizim iş yoldaşlarımız***

# SƏNƏT FƏDAİSİ

**Nazim Kazımov**
***Milli Konservatoriya nəzdində Musiqi Kollecinin direktoru, Əməkdar incəsənət xadimi, professor***

Azərbaycanın mədəniyyət tarixi həmişə zəngin olmuş, ümumbəşəri dəyərləri təbliğ etdiyi üçün tarixin, demək olar ki, bütün dövrlərində dünya səviyyəsində mövqe tutmuşdur. Azərbaycan xalqı bəşər mədəniyyəti xəzinəsinə görkəmli şəxsiyyətlər bəxş etmişdir. Bu insanlar Azərbaycan mədəniyyətini daha da zənginləşdirmiş, irəliyə aparmış, təmsil etdikləri millətin dünyagörüşünü, musiqi mədəniyyətini yeni zirvələrə qaldırmışdır. Elə şəxslər var ki, onlar özləri üçün doğulmurlar, xalqına, onun tərəqqisinə xidmət etmək üçün dünyaya gəlirlər. Mübaliğəsiz, demək olar ki, belə şəxslərdən biri də Azərbaycanın qarmon ifaçılığı sənətində özünəməxsus, təkrarolunmaz yeri olan, Respublikanın Əməkdar artisti, dosent, sənətşünaslıq üzrə fəlsəfə doktoru, görkəmli pedaqoq Mirzəyev Zakir Qulam oğludur.

Bu günlərdə tanınmış sənətçimizin 70 illik yubileyini təntənəli surətdə qeyd etdik. Zakir Mirzəyev haqqında rəsmi cümlələrlə, şablon ifadələrlə danışılası insan deyil. Çünki onun ömrü inqilabçı ruhlu, yaradıcı bir insanın, sümüyünün iliyinədək incəsənət adamının, bütün bacarıq və qabiliyyətlərini milli musiqimizin, ifaçılıq sənətimizin inkişafına, sənətdə hər cür bayağılığa və qeyri-peşəkarlığa qarşı mübarizəyə həsr etmiş bir sənətçinin ömrüdür. Bu gün Zakir bəy ömrünün qızıl payızını yaşayır. Qızılı payız həmişə öz barıyla, bəhrəsiylə başqa fəsillərdən fərqlənir. İnsan ömrü də belədir. Dünyaya göz açan hər bir insan ilahi tərəfindən ona bəxş edilmiş ömür yollarında irəliləyərək arxada qoyduğu uşaqlığı, gəncliyi, ahıllığı zamanı əməlləri və işiylə "əkib becərdiyinin məhsulunu" ömrünün qızılı payızında, yaşının müdriklik çağında görür və ondan bəhrələnir. Məhsuldarlığı yaxşı olubsa, əməyinin hədər getmədiyindən, ömründən keçən illəri mənalı yaşadığından qürur hissi keçirir, daxili bir rahatlıq tapır. Zakir Mirzəyev də ömrünün qızıl payızını yaşayan, illərlə çəkdiyi zəhmətin bəhrəsini görən, qalan ömrünü də milli musiqimizə, gənc ifaçılarımızın yetişdirilməsinə sərf edən bir şəxsiyyətdir.

Mirzəyev Zakir Qulam oğlu 1943-cü il sentyabrın 16-da Bakı şəhərində anadan olmuşdur. Qeyri-adi musiqi duyumu və istedadı özünü artıq uşaq yaşlarından büruzə verməyə başlamışdır. Hələ 8 yaşında olarkən atasının ona hədiyyə etdiyi qarmonda "Heyvagülü" xalq rəqs havasını məharətlə ifa edən Zakiri sənətin enişli-yoxuşlu yolları ilə uzun, keşməkeşli, bəzən büdrəmələrdən də xali olmayan bir həyat gözləyirdi.

1964-cü ildə Teleradionun nəzdində peşəkar musiqiçilərin və müğənnilərin ifalarının radio üçün yazılıb fonda qəbul olunmasına nəzarət edən mötəbər bir komissiya yaradılmışdı. Komissiya üzvləri arasında Əhməd Bakıxanov, Cahangir Cahangirov, Səid Rüstəmov, Adil Gəray, Şövkət Ələkbərova kimi görkəmli şəxsiyyətlər, sənət korifeyləri var idi. O vaxtlar bir ifaçının il ərzində yalnız 4-5 ifası fonda yazıla bilərdi. Lakin Zakir Mirzəyevin qeyri-adi ifası münsiflər heyəti üzvlərini elə məftun etmişdi ki, onun ifasında bir dəfəyə 5 melodiya radio fonduna qəbul olunmuşdur. Xüsusi qeyd etmək istərdim ki, bu rəqs melodiyaları Zakir Mirzəyevin öz bəstələri idi.

Zakir Mirzəyevin yaradıcı həyatının

avtobioqrafik detallarından nə qədər qaçmaq istəsəm də, maraqlı məqamlarla zəngin haşiyələr, xatirələr insanı öz girdabına alır. Yuxarıdakı bir qədər sentimental haşiyələrə birini də əlavə etmək istərdim ki, mənim fikrimcə, bu hadisə onun həyatına və yaradıcılığına, ifaçılığının unikallığına öz damğasını vurmuşdur. Dünya şöhrətli musiqi xadimi, bəstəkar və dirijor, maestro Niyazi Zakirin ifasından vəcdə gələrək ona "Qarmonun Paqaninisi" adını vermişdir. O, konsert zamanı Zakirin qəflətən qarmonu tərsinə çevirib çalmasına heyrətini gizlədə bilməmiş və bunu qeyri-adi bir bacarıq, yüksək istedad saymışdır. Məhz bu hadisədən sonra məşhur maestro öz diqqətini və himayəsini Zakirin üzərindən əskik etməmişdir. Adətən təriflərə qarşı qısqanc, təbiətən çox sərt olan, Niyazi kimi dahi şəxsiyyətdən belə bir qiymət almaq hər adama qismət olmurdu və özlüyündə artıq böyük uğur idi. Zakir müəllim də 70 illik həyatı və təqribən 55 illik yaradıcılıq fəaliyyəti dövründə bu adı yetərincə doğrultmuş, mahir ifası ilə minlərlə insanın ürəyinə, hiss və duyğularına hakim kəsilmişdir.

Zakir Mirzəyevin 1960-cı ildən etibarən Azərbaycan Dövlət Radiosu və Televiziyasında ifa etdiyi musiqi əsərləri qızıl fondda saxlanılır. Müəllifinə böyük şöhrət gətirmiş "Muğam və rəqs" Zakirin şah əsəri sayıla bilər. Bu, tam bitkin, səviyyəli, insanın hiss və duyğularına təsir göstərən, özündə incə duyğular və sirli bir dünyanı ehtiva edən bir əsərdir. Əsərdə improvizasiya yolu ilə muğam və rəqs melodiyası böyük məharət və ustalıqla sintez edilmişdir. Sənətkarın "Muğam və rəqs" əsəri əsl sənət incisi kimi milli musiqi xəzinəmizə əbədi daxil olmuşdur.

Zakir Mirzəyev 1999-cu ildən etibarən Azərbaycan Milli Konservatoriyası tərkibində Musiqi Kollecində, 2006-cı ildən isə Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetində pedaqoji fəaliyyətlə məşğuldur, öz zəngin təcrübəsinin gənc qarmon ifaçılarımıza çatdırılması istiqamətində əzmlə çalışır. Onun onlarla uğurlu yetirməsi Respublikamızın müxtəlif musiqi kollektivlərində və tədris müəssisələrində fəaliyyət göstərir, ifaçılıq sənətində çalışırlar.

İfaçılıq və pedaqoji fəaliyyətlə yanaşı, Zakir Mirzəyev elmi-metodiki fəaliyyətini də uğurla davam etdirir. O, "Azərbaycan qarmonu" adlı monoqrafiyanın, qarmon aləti üzrə iki dərsliyin, "Rast" muğamı haqqında metodik dərs vəsaitinin, bir çox elmi məqalələrin və tezislərin müəllifidir. Onun "Qarmon məktəbi" dərs vəsaitindən istər musiqi məktəblərində, istərsə də kolleclərdə geniş istifadə olunur. Zakir Mirzəyev sol əllə ifa olunan Azərbaycan qarmonun ixtira etməklə bir yeniliyə imza atmışdır. Görkəmli sənətçimiz sənətşünaslıq üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almışdır və öz elmi tədqiqatlarını bu gün də uğurla davam etdirir.

Möhtərəm Prezidentimiz İlham Əliyev cənabları Zakir Mirzəyevin xalq qarşısında xidmətlərini yüksək qiymətləndirmiş, ona Respublikanın Əməkdar artisti fəxri adını vermişdir.

Zakir Mirzəyev Azərbaycanın qarmon məktəbinin bənzərsiz ifaçılarından olmaqla yanaşı, özü də öyrənilməli və tədqiq edilməli olan bir məktəbdir, özünəməxsus ifaçılıq üslubu yaratmış, ifaçılığa intellekt gətirmiş bir sənətkardır.

Zakir Mirzəyev hər şeydən əvvəl gözəl insandır, etibarlı dostdur. Yüksək intellekt, zəka, fitri istedad, səmimiyyət bu insanda prinsipiallıq, mərdlik və etibarlılıqla, zahiri yumşaqlıq, sadəlik və müstəsna nəzakətlə harmonik surətdə qovuşur, nəticədə sadə, təvazökar bir insan və istedadlı bir ifaçı simbiozu yaranır. Coşqun və tükənməz enerjiyə malik olan, böyük yaradıcılıq arzuları ilə yaşayır.

Biz görkəmli sənətçimizə can sağlığı, yeni yaradacılıq uğurları arzulayırıq.

Təbrik edirik: Azərbaycan Respublikası təhsil nazirinin 22 noyabr 2013-cü il tarixli əmri ilə Zakir Mirzəyev "Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi" döş nişanı ilə təltif edilmişdir.




**Əjdər Ağayev, Qolamhüseyn Ədaləti. Məhəmmədhüseyn Şəhriyar: pedaqoji görüşləri**. – Bakı: Mütərcim, 2013. – səh. 164

*Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun Elmi Şurasının qərarı ilə çapa məsləhət bilinmişdir.*

Redaktor: Əsəd Rza Yəqubi, professor. Rəyçilər: Kərim Məmmədov, pedaqogika üzrə elmlər doktoru, İbrahim Kurt, pedaqogika üzrə fəlsəfə doktoru

Bu kitabda Məhəmmədhüseyn Şəhriyarın pedaqoji görüşləri araşdırılır. Ustad sənətkarın Azərbaycan və fars dillərində yazdığı əsərlər təhlil olunur, onun təhsil, təlim, tərbiyə, müəllim, məktəb  haqqında fikirləri sistemləşdirilir, milli vətənpərvərlik, yurdsevərlik ideyaları təbliğ olunur, Azərbaycançılıq məfkurəsi aşkarlanır.

Kitabda M.Şəhriyarın ana dilində yazdığı, fars dilində qələmə aldığı poetik nümunələrindən orijinala uyğun olaraq istifadə olunmuşdur. Sətri tərcümələr müəlliflər tərəfindən edilmişdir.

Kitab magistrlər, doktorantlar, tədqiqatçılar, eləcə də, geniş oxucu dairəsi üçün nəzərdə tutulmuşdur.




**Гафар Гусейнов**. **По стопам Сухомлинского.** Санкт-Петербург, издательство “Златоуст”, 2013. 172 стр. Редактор: Б.Моносов

Filologiya elmləri doktoru, BML-nin direktoru Qafar Hüseynov ümumtəhsil məktəbləri üçün “Русский язык” dərsliklərinin həmmüəlliflərindəndir. Onun rəhbərlik etdiyi məktəb-lisey şəhərimizdə yaxşı tanınır. Təcrübəli məktəb rəhbəri Qafar Hüseynovun bu kitabı görkəmli pedaqoq Suxomlinskinin “Ürəyimi uşaqlara verirəm” kitabının təsiri ilə yazılmışdır. Müəllif burada özünün müəllimlik təcrübəsindən söhbət açır, xatırlatmalar verir, müəllim-şagird münasibətlərinin incə məqamlarına toxunur. O, sanki keçmiş dostlarını “Siz haradasınız”, - deyə haraylayır. Kitab mütəxəssis pedaqoqlar kimi, valideynlər, geniş oxucu kütləsi üçün də maraqlı ola bilər. Müəllif kitabın əvvəlində yazmışdır: “Коллегам-учителям посвящается”.